**BƏXTİYAR VAHABZADƏ**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**İKİ CİLDDƏ**

**II CİLD**

"ÖNDƏR NƏŞRİYYAT"
BAKI – 2004

*Bu kitab “**Bəxtiyar Vahabzadə.** Əsərləri”* (*I, III cildlər, Bakı, “Azərbaycan”, 2001–2002; IV–VI cildlər, Bakı, “Çaşıoğlu”, 2002–2003*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni və redaktoru: **Azər Bağırov**

**894.361’1 - dc 21**
**AZE**
**Vahabzadə Bəxtiyar. Seçilmiş əsərləri**. İki cilddə. II cild (Poemalar). Bakı, “Öndər nəşriyyat” 2004, 320 səh.

Çağdaş Azərbaycan poeziyasının qüdrətli nümayəndəsi, əsrin Şərq və dünya şeri prosesi məcrasında milli poeziyamızı ləyaqətlə təmsil edən xalq şairi Bəxtiyar Vahabzadənin bu kitabında müəllifin müxtəlif illərdə qələmə aldığı poemalar toplanmışdır.

**ISBN 9952-416-11-2**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# Şəbi-hicran



*“Füzuli... aləmi-insaniyyətdə tamam qəmzədələrin və möhnətkeşlərin yüklərini götürmək və məzlumların halına yanmaq üçün xəlq olunubdur”.*

***F.Köçərli***

## PROLOQ

Sən mənim ən böyük ustadım oldun,
Ey ana yurdumun böyük şairi.
Vətən göylərində güntək doğuldun,
İşığın bürüdü qərinələri.
Lalələr açıldı sinəndə qəmdən,
Əməllər, arzular şairisən sən!

Nə var belə, nə deyirsən,
Niyə belə titrəyirsən, ey qələm?
Mən elə bir kainata bu gün uçmaq istərəm
Ki, onun hər səyyarəsi böyük bir kainatdır.
Ey ilhamım, o əlçatmaz zirvəyə məni çatdır!
Ey qələmim, Günəş kimi alışaydın, yanaydın.
Sən ağacdan, kömürdən yox, poladdan
yaranaydın.
Sürətini ildırımdan alaydın deyirəm ki,
Elə mühit dəryasına cummaq istəyirəm ki,
O dəryanın hər qətrəsi bir sənət incisidir.
Hər damlası atəş olub ürəkləri isidir.
Ey qələmim, Günəş kimi alışmasan, yanmasan,
Ey ilhamım, dərya kimi coşub dalğalanmasan,
O dəryanın sirlərini görə bilərsənmi sən?!

Dərya yarat o dəryanın kiçik qətrələrindən.
Onun hər bir təlatümü mənə tanışdır – dedim,
Qəvvas olub o dəryada mən çox üzmək istədim.
Batdım bircə damlasında, damlası da dərindir,
Burda fərman qəzəb dolu coşqun ləpələrindir.
Ləpələrin qucağında dolaşdım axşam-səhər,
Gözlərimi qamaşdırdı dibindəki incilər.
Dərk etmədim hikmətini, can heyrətdən uçundu,
Heyrətimin şaxtasında idrak dondu, nə dondu!

## İKİ MÜƏLLİM

*Heyrət, ey büt, surətin gördükdə lal eylər məni,*
*Surəti-halım görən, surət xəyal eylər məni.1*

Bir əlində kitabça, bir əlində yasəmən,
Məhəmməd asta-asta qayıdır mədrəsədən.
Bir qayğı gizlənibdir düyünlənmiş qaşında,
Bir dünyanın sirri var o dalğın baxışında.
Neçin görən o belə qəmlidir, pəjmürdədir,
Nə düşünür, nə anır, üzündəki qəm nədir?
Bəlkə cavan şairin bir qəza var başında?
Qəlbinə qarmı yağıb ömrün bahar yaşında?
O, niyə dalğın gedir, niyə pərişan gedir?
Canından can ayrılır, ürəyindən qan gedir?
Çatır döngə başına, fikir qəlbində çin-çin,
Şam kimi sakit durur, alışır için-için.
Baxışları sancılır balaca bir eyvana,
Arzusu gülə dönüb o eyvandan boylana...
Qiyamətmi qopar, ah!.. Bunlar əbəsdir, əbəs!
Arzu dan ulduzudur, o, hər saat görünməz.
İztirablar, əzablar açarıdır arzunun,
Çox-çox daşlı, kəsəkli yolları varmış onun.
Gəlir dalğın Məhəmməd – ürəyində neçə dərd,
Necə daşqın, necə lal,
necə yumşaq,
necə sərt.

Binanın qənşərində gəzinir yana-yana,
Düşünür: “Bir quş olub qonaydım o eyvana,
Ah... ya da bu istidə əlçim bulud olaydım,
O eyvanın üstünə gəlib kölgə salaydım.
Axı bunlar nədir ki, əlində kor fələyin?
Kaş çiçəyi olaydım eyvandakı dibçəyin.
Baxaydım, hey baxaydım mən ordan öz Leylama,
Eşqimi söyləyəydim gecə-gündüz Leylama.
O, mənə su verəndə toxunaydım əlinə,
Ya elə damcılanıb mən qonaydım əlinə”...
O düşünür...
Saatlar gəlib keçir an kimi;
Yer Günəşin başına dönüb dolanan kimi,
Dolanır, hey dolanır o, binanın başına;
Ovsunlanıb... çətin ki, inadından daşına.
Sevən o ürək üçün
Bu binadan doğurdu gecə qəmər, səhər gün.
O ürək üçün yəqin
Bu binanın üstündən keçir yolu Kəbənin.
Asılır nəzərləri
Sırğa kimi bu zaman
Dibçəkdəki çiçəyin
Körpə budaqlarından.
Qorxa-qorxa yoxlayır
O, solunu-sağını,
Atır həmin eyvana
Yasəmən budağını...
Ata çıxır eyvana,
Nəzər salır dörd yana.
Kimsə dəymir gözünə,
Deyinir öz-özünə.
O, köksünü ötürür,
Yasəməni götürür.
“Lənət şeytana” – deyə
Əzib atır küçəyə.
Əzilən yasəmənə baxa-baxa Məhəmməd,
Düşünür öz eşqini qəlbi yuxa Məhəmməd.

## MƏHƏMMƏD

– Ey müəllim, sən mənə neçə il dərs demisən,
İndi belə görünür, hər şeyi tərs demisən.
Sənin ciyərparanı mən sevirəm, nə olar,
Göz gördü, könül sevdi, mənim nə günahım var?
Bir-bir öyrətdin mənə otuz iki hərfi sən.
Otuz iki!.. Bu qədər hərflərin içindən
Üçünü sənin qızın – Leyla öyrətdi mənə.
Heyranam bu üç hərfin hökmünə, qüdrətinə.
Odur mənim sinəmdə atəş olub hey yanan,
Ayn, şin və bir də qaf!.. Bu üç hərfdən yaranan
Eşq sözü sözlərin sultanıdır, tacıdır,
Eşq – həyat ağacıdır!
Sən də, mən də, Leyla da bu ağacın barıyıq,
Eşqin övladlarıyıq.
Qara torpaq olsa da əvvəl-axır yerimiz,
Eşqdir tinətimiz, eşqdir cövhərimiz.
Sən öyrətdin, sən mənə şəklini bu hərflərin,
Qızınsa üç hərf ilə dünyanın, göyün, yerin,
İnsan duyğularının sirrini açdı mənə.
Eşqimlə vaqif oldum bu dünyanın sirrinə.
Zəhmətini danmıram, çox borcluyam sənə mən;
Sən həyat kəlməsini yazmağı öyrətmisən,
Həyatın sirrinisə qızın öyrədib mənə,
Mən borcluyam Leylanın o sehrkar hüsnünə.
Dilini öyrətmisən
Kitabların mənə sən.
Osa mənə öyrədib təbiətin dilini,
Onun sirli dilini, onun çətin dilini.
İndi mən anlayıram eşqimiş hər nə varsa,
Bəli, kimin qəlbini eşq atəşi yaxarsa,
Dünyanı dərk eyləyər, eşq bir amal imiş
Sənin təlim etdiyin "elm qelü-qal" imiş.
Ey müəllim, neynirəm cansız kitabları mən
Ən böyük kitab onun hüsnüdür, şöləsindən
İşıqlanır mənimçün gizli sirri cahanın...

Eşq bir məhvəridir bizim qoca dünyanın...
Ey müəllim, olanı söylədim sənə yalnız,
Özün söylə, hansınız qüdrətli ustadsınız?
Kəndli qızıdır anam, bir peşəkardır babam,
Özüm də, ey müəllim yazılmamış kitabam.
Sənin əlin böyüklər, şahlar ətəyindədir,
Üzü dönük dünyanın hökmü, gücü səndədir,
Sən şahların bağından çox meyvələr dərmisən,
Sən öz ciyərparanı heç mənə verərmisən? –
Deyə o köks ötürür, dərdi hopur dərinə,
Çevrilib yavaş-yavaş, üz qoyur evlərinə

## CAN YANĞISI

*Eşqdir ol nəşeyi kamil kim, ondandır müdam*
*Meydə təşviri hərarət, neydə təsiri-səda.*

Mədrəsə hücrəsinə yığılıbdır cavanlar,
Sənətə, şeirə dair fikir yürüdür onlar.
Biri deyir: həyatın hüsnü, süsüdür sənət.
Biri deyir: ürəyin döyüntüsüdür sənət.
Biri deyir ki, sənət təbiətin səsidir.
Biri deyir ki, sənət eşqin təranəsidir.
Biri deyir ki, sənət hər bir şeydən öncədir.
Biri deyir ki, sənət adicə əyləncədir.
Biri deyir ki, sənət cəlb edə bilmir məni.
Biri deyir ki, sənət insan düşüncəsini,
Fikrini, xəyalını uçurur qanadında...
Tələbələr içində Əbdül Kərim adında
Bir sivaslı gənc vardı,
Tay-tuşları hamısı ona hörmət qoyardı.
O keçibdir həyatın şaxtasından, qarından;
Ağlıyla, duyğusuyla seçilir dostlarından.
Həm də gözəl ney çalır, o çalır yana-yana,
Eşidən heyran qalır onun mahnılarına.
Tələbə dostlarından o, yaşlıdır bir qədər,

Həmişə olduğu tək yenə bütün nəzərlər
Yalnız ona dikilir,
Dillənib, asta-asta
Danışır Əbdül Kərim:
– Ey mənim əzizlərim,
Sənət dəryaya bənzər, onun min bir halı var,
Onun sirlərlə dolu öz cah-cəlalı var.
Kiminin bu dəryada gördüyü çör-çöp olur,
Kimi də dibindəki incilərə vurulur.
Məncə, can yanğısıdır şeir, sənət, əzəldən,
Belə anlayıram mən
Qəlbində eşq olanlar dərk eyliyər sənəti,
İnsan məhəbbətidir yaradan hər sənəti...
(Məhəmmədə baxırdı o, bunları deyərkən)
Soruşun, ney çalmağı necə öyrənmişəm mən?
Bunun öz tarixi var.
Yenə ona dikildi sual dolu baxışlar.
O başını yellədib bir ah çəkdi dərindən,
“Ah” alova çevrilib saçıldı gözlərindən. –
– Hər günün öz hökmü var.
O Çaldıran savaşı[1] başlananda, a dostlar,
Dəliqanlı cavandım;
Sultanın fərmanını Vətən çağrışı sandım.
Xalqım çağırır deyə
Mən yollandım cəbhəyə.
Qan yox idi gözümdə,
Min aslanın gücünü hiss edirdim özümdə.
Neçə qovğaya düşdüm.
Gecə-gündüz döyüşdüm.
Yorulmadım bir an da,
Hər dəfə qılıncımı sağa-sola çalanda.
Neçə şah əsgərini mən torpağa sərirdim,
Qəhrəman olduğumu hamıya göstərirdim.
Ancaq bir gün... ah... o gün...
Ən dəhşətli günüdür mənim cavan ömrümün.
O gün mənim indi də yadıma düşən zaman
Tüstü qalxır başımdan;

Qılıncımı sıyırıb at belində süzürdüm,
Bu vaxt birdən önümdə bir şah əsgəri gördüm.
Dönüb qaçmaq istədi görən kimi o məni,
Mənsə macal verməyib, tez haqladım düşməni.
O dönüb mənə baxdı, aman, o necə baxdı!
Elə bil ki, hər gözü qan dolu bir çanaqdı.
O baxışlar bu zaman
Rəhmsiz bir ovçudan
Rəhm, aman diləyən ahutək yalvarırdı.
Gözüm qızmışdı mənim,
                    məndə insafmı vardı?
Endirdim qılıncımı kürəyinə arxadan.
O yıxıldı. Bu zaman
Bir ney düşdü, qarğı ney onun qoltuq cibindən.
Diyirləndi kənara...
                    Dönüb neyə baxdı, mən,
Heyrətlə baxdım ona.
Baxdım yanaqlarından süzülən göz yaşına,
Lənət şeytana dedim...
Bu dəhşətli səhnədən uzaqlaşmaq istədim.
O zarıya-zarıya mənə "yaxın gəl" – dedi
                    "get, o neyi al" – dedi.
                    Aman Allah, buna bax,
Onun ürəyinə bax, onun duyğusuna bax!
Mən tez endim atımdan, əyildim ona sarı,
Sinəmə dağ çəkirdi asta pıçıltıları.
O danışdı. Susdu göy, susdu yer, susdu hər yan
Təzəcə evləndiyi, gözləri yolda qalan
Arvadını andı o, körpəsini andı o.
Ah çəkib dayandı o.
Başını qucaqladım,
Hönkür-hönkür ağladım.
Həyatımda ilk dəfə nifrət etdim özümə.
O, sönən gözləriylə baxıb mənim üzümə:
– Qardaş, olan olubdur, sən yaxamı aç – dedi.
Aman Allah, ay Allah, o mənə "qardaş" dedi!
Yaxasını tez açdım,

Dedi: – Neyi ver bəri.
Verdim. Aldı, əsirdi yarpaq kimi əlləri,
Dodağına apardı, səslər titrədi... çaldı.
Buludlar topalandı, Günəş söndü, qaraldı.
O, neyimi çalırdı, neymi çalırdı onu?
Ürəyinin qəmini, eşqini, arzusunu
Qatdı yetim segahda o, neyin fəryadına,
Elə bil çağırırdı kimiysə imdadına...
Od çıxırdı elə bil o yanıqlı nəfəsdən
Qana dönmüş ürəyim parçalandı bu səsdən.
Bu səsdən çıraq kimi gah yanır, gah sönürdüm.
Dalıb neyin səsinə düşünür, düşünürdüm:
"Neyçin düşmən edirlər insanı insanlara,
Səbəb nədir görəsən bu günahsız qanlara?
Nədən ötrü mən onu bu günə saldım görən?
Töküb onun qanını nə qazandım axı mən?
Onun nəğməsindəki yanıqlı xallara bax,
Şirin arzulara bax, incə xəyallara bax.
Tək onunku deyildi bu xallar, zəngulələr,
Mənə də çox doğmadır bu guşələr, nalələr.
Dünya əsirgəməyib əzabından onu da.
Mən onun nəğməsini, eşqini, ruhunu da
Anlayıram, düşmənim
Ola bilməz o mənim!
Eləysə, ah, eləysə bəs bu kəsə-kəs neçin?
Qılınc verib əlinə şahla sultan bəs neçin?
Bir doğma qardaşları qırdırır qardaşlara?
Mənim yaram deyilmi
                    Bu yazığın köksünə
                    İndi vurduğum yara?
Yaralı da bu zaman
                    Yəqin mənə bunları
                    Söyləmək istəyirdi.
Sözlə demədi, ancaq sözü segaha verdi...
Odunu, yanğısını ney də ürəkdən aldı.
Ney ürəkdən-ürəyə bir incə körpü saldı.
Birdən nəğmə kəsildi...

Gördüm artıq keçinmiş!
Ağlaya-ağlaya mən,
Onu dəfn etdim həmən.
Yuxudaydım elə bil, mən ayıldım yuxudan,
Gözümə başqa donda görünürdü bu cahan.
Qılıncımı tullayıb o andaca yerə mən,
O mərhumun neyini taxdım onun yerindən.
Öyrənməyə başladım o gündən ney çalmağı,
Öyrədənim kim oldu? Can yanğısı, gözdağı.
Sənət can yanğısıdır mənim üçün, a dostlar,
Bu dünyanın oduna gərək yana sənətkar.
O bunları deyərkən Məhəmmədə baxırdı,
Məhəmmədin gözündən sel kimi yaş axırdı...
Bu yaş "insan insanın qardaşıdır" – deyirdi,
"Sənət can yanğısıdır, göz yaşıdır" – deyirdi.

## İKİ HƏDİYYƏ

*Füzuli, dəhrdən kam almaq olmaz olmadan giryan*
*Sədəf su almayınca əbri nisandan göhər verməz.*

Əyləşib Məhəmməd otağında tək
Oynaşır üzündə qəm buludları.
Bayırda cücərib min gül, min çiçək,
Əriyir qəlbində dağların qarı.

Üzündən, gözündən tökülür kədər,
Qəmlər dövlətidir, dərdlər varıdır.
Ağaran dan yeri, qızaran göylər,
Onunçün Leylanın yanaqlarıdır.

Boğur öz dərdini o, yana-yana,
Axıtmaq istəmir göz yaşlarını.
Qaralan üfüqlər andırır ona
Leylanın kədərli baxışlarını.
Məhəbbət dünyanı anlatmış ona,

Leyla Məhəmmədçin eşqin adıdır;
Qıvrımsaç, ucaboy, qaragöz Leyla
Onun dünyasıdır, kainatıdır.
Bahar öz gülləri, çiçəklərilə
Leylanın adını yazmış düzlərə,
Çöldə pıçıldaşan yarpaqlar belə
"Leyla! Leyla!" – deyir gündə min kərə.
Yazmaq!
Nədən yazmaq?
Ozanlar kimi
Nəğməyə çevirim məhəbbətimi?
Tökümmü qəlbimin bütün varını?
Hicran gecəsinin əzablarını
Yazım hansı sözün qüdrətilə mən?
Ah... Necə söyləmək?
Hardan başlamaq?
Nə qədər çalışır, gözü önündən
Leylanın xəyalı çəkilmir ancaq...
Leyla şeir kimi, nəğmələr kimi
Səslənir şairin qulaqlarında.
Leyla qızıl donlu bir səhər kimi
Süzülüb qapıdan girir bu anda.

*Məhəmməd* – Aman, bu xəyalmı, röyamı? Əsla!
Yox, bu xəyal deyil, özüdür...
– Leyla!

*Leyla* – Məhəmməd!

*Məhəmməd* – Ah, Leyla de, bu sənmisən?
Ey Günəş, sən göydən yerə enmisən?

*Leyla* – Eşqdən qüdrətli dünyada nə var,
Məhəbbət yeri də göyə qaldırar?!

*Məhəmməd* – Sən odmu, atəşmi, ya məşəlmisən,
Leyla, söylə, bura necə gəlmisən?!

*Leyla* – Dedim ki, məhəbbət gətirər... atam
Mənim hər işimə göz qoyur müdam:
Məni məktəbə də buraxmır artıq.

*Məhəmməd* – Eşqin göylərinə çökdü qaranlıq,
İndi biz neyləyək?

*Leyla* – Sən yaz, sən yarat,
Sevmək bir həyatdır, yazmaq bir həyat.

*Məhəmməd* – Son çarəm budursa, qoy dərdi-sərim,
Mənim fikirlərim, düşüncələrim,
Eşqim kağızlara süzülsün dən-dən –
Qara saçlarının rayihəsindən.
Sənsiz qəhr edərdi bu cahan məni,
Sənsən bu cahana bağlayan məni!
O gün ki, qəlbimi mən sənə verdim,
Hər şey gözlərimə göründü aydın.
Varlığı heçliyə mən dəyişərdim,
Əgər bu dünyada sən olmasaydın.
Doğrandım, kəsildim mən dilim-dilim,
Dünya əzab evi, ömür vəfasız.
Gördüyüm hər şeyə inan, sevgilim,
Sənin gözlərinlə baxıram yalnız.
Hara baxıramsa görürəm səni,
Quş səsi, çay səsi sənin səsindir.
Çəkəndə köksümə gülün ətrini,
Sanıram bu sənin öz nəfəsindir.
Qara gözlərində batıram sənin
Bu gözlər dəryadan, göydən dərindir.
Buluda deyirəm saçındır yəqin,
Güllər mənə baxan nəzərlərindir.
Yarpaqlar – əllərin, çeşmələr – gözün,
Yağış damcıları – göz yaşlarındır.
Dünya yaranmısan mənimçün özün,
Baxışım da sənin baxışlarındır.
Kitabam, gəl məni aç varaq-varaq,
Gör nələr çəkmişəm bu zəmanədən.
Vəfasız bildiyim dünyaya ancaq
Sənin saçlarınla bağlanmışam mən.
Dərk edə bilməzdim dəhri, varlığı;
Heyran olmasaydım gözəlliyinə.
Hüsnünün əsrarı, füsunkarlığı
Ana təbiəti andırır mənə.

*Leyla* – Mən ki inanıram sənin eşqinə.

*Məhəmməd* – Demişəm, sevgilim, deyirəm yenə:
Sənin ürəyindir mənim məskənim,
Məhəbbət əqidəm, dinimdir mənim.
Sevirəm!
Sevənə nə qanun, nə din?
Nəsibi zillətdır sevilənlərin
Birdən başqa dini qəbul eyləyən
Bir qərib yolçuya bənzəyirəm mən.
Gəlin qınamayın əsla siz onu
– Bu dinin hansı bir din olduğunu;
Bilmədən, bilmədən ehkamlarını,
Tanımadan onun imamlarını,
Ona kor-koranə mən inanmışam,
Bu dini ən böyük bir din sanmışam.
Bu dini yaratdı öz məhəbbətim,
Bir dərdi eylədi yüz məhəbbətim.

*Leyla* – Sənin bu füsunkar məhəbbətindən
İncilər yaransın!..
İstərəm ki, mən
Eşqinə dəm tutub göylər mələşsin,
Eşqin tarix olub əbədiləşsin.
Ancaq bir şərt ilə;
Unutma bir an,
Sən Türk diyarının öz övladısan!
Doğrudur, sən indi qürbət eldəsən,
Ancaq ürəyində yaşasın Vətən.
Vətənin öz dili, öz tarixi var,
Ölsün Vətənini tanımayanlar!
Qoy sənin şeirində dil açsın Vətən!
Onun küləkləri, onun çayları,
Biz ayrı düşsək də, öz elimizdən,
Qürbətdə ölməsin dilimiz barı.
Sənin bu ilahi ilk məhəbbətin
Xalqının dilində yazılsın gərək.
Sənin ki əlində deyildir çətin
Döndərib: “düşvarı asan eyləmək”.
Axı ərəb, əcəm dillərində sən

Yazmısan xeyli.
Şirin sözlərini başa düşməyən
Öz elin olmazmı səndən gileyli?

Sən ərəb, sən əcəm oğlu deyilsən,
Sənin öz dilin var, öz Vətənin var.
Özgə yelkənində seyrə çıxma sən,
Sənin öz dənizin, öz yelkənin var.

Ah!.. Vətən gözəli, ah Vətən qızı,
Sənə halal olsun ananın südü.
Sənin sözlərinlə mənim gözümdə
Vətən bir pillə də qalxdı, böyüdü.

Belə övladları olan ölkənin
Əsməz qara yellər başından bir an.
Ey Vətən gözəli, gəl, öpüm sənin
"Vətən dili" deyən dodaqlarından.

Haqq sözün qəlbimi titrətdi mənim,
Bu Vətən torpağı qoy olsun qənim;
Vətəndə yaşayıb, onun dilinə,
Ruhuna, zövqünə, doğma elinə
Xor baxan şərəfsiz vətənsizlərə!
Ən böyük düşməndir onlar bizlərə.
Külfət namusunu çəkərmi görən
Vətən namusuyla yaşamayanlar?
Heyhat!.. Hələ çoxdur evini Vətən,
Qohum-qardaşını millət sayanlar...

*Məhəmməd* – Doğrudur, sevgilim, doğrudur bunlar,
Mən Vətən eşqilə ötən bir quşam.
Mən sözdən elə bir süfrə açmışam,
Ərəb də, əcəm də ordan pay umar.
Ancaq o süfrədə ağız ləzzətim
Mənim öz dilimdir, öz lisanımdır.
O dilə bağlıdır arzum, niyyətim,

O, mənim eşqimdir, həyəcanımdır.
Bəli, türk oğluyam... neyləyim, ancaq
Hər şeyi atadan öyrənir uşaq.
Təzə cığır açmaq çətindir, çətin,
Əbül-Ülaların, Nizamilərin
Ən kiçik, ən aciz şagirdiyəm mən;
Ayrıla bilməyib ənənəmizdən,
Biganə olmuşam ana dilimə,
Gərək mən qayıdam öz sahilimə...

*Leyla* – Bunu gözləyirəm, mən səndən bunu,
O sonsuz eşqini, böyük arzunu
Öz ana dilində əbədiləşdir
Şeirini xaqanla, şahla güləşdir.
Söhbət davam edir bir xeyli... Leyla,
"Daha yetər", – deyə qalxır yerindən.

*Məhəmməd* – Bir az əyləşsənə.

*Leyla* – Yox, bəsdir daha...
(Məhəmməd ah çəkir yenə dərindən)
-Nə belə ah çəkdin, ahın dağlara!

*Məhəmməd* – Həsrətin köksümə vurdu min yara,
Eşit, nələr deyir bu döyüntülər.
Bəs bizim eşqimiz nə vaxta qədər
Sinəmiz altında dustaq qalacaq?
Bəs nə vaxt göylərə qanad çalacaq?

*Leyla* – Səbr eylə!

*Məhəmməd* – Ey mənim gülüm, gülşənim
Könül dözmür hicran gecələrinə.
Ulduzlar gözlərim olaydı mənim,
Hər biriylə min il baxaydım sənə.

*Leyla* – Yanırsan, əzizim, alış, yan yenə,
Sənətkar dediyin yanar çıraqdır.
Elin kədərinə, elin qəminə
Şair də yanmayıb, kim yanacaqdır?

*Məhəmməd* – Yanıram, desəm də, deməsəm də mən,
Mən ki, alışmışam nur olmaq üçün.
Keçərəm həyatın dəbdəbəsindən
Sinəmə çəkilən bircə dağ üçün.

Dözüm yolçusuyam...
Dərdin əlindən
Bülbül deyiləm ki, nalə çəkim mən,
İnsanam, ahım da vüsal üçündür.
Səndən ayrıldığım gör neçə gündür,
Gözlərim önündə yaradıram mən
Sənin surətini düşüncələrdən.
Gedirsən, yaxşı yol, "ey afəti can!"
Onsuz da sən mənim öz bağrımdasan!
Ancaq sevgilimə bir bəxşişim var,
Bu, mənim anamdan qalıb yadigar.
Qızıl medalyondur dediyim barat,
Sən onu sevginlə daha da parlat!
Bax, bu medalyonda yanan o işıq
Şairin eşqidir, götür eşqini.
Nəyinə gərəkdir bu yar-yaraşıq,
Onsuz da zinətlər bəzəmir səni
Bizim eşqimizdən bir xatirətək
Bu kiçik töhfəni alasan gərək.
Leyla medalyonu salır boynuna,
Doğrusu, bəzək də yaraşır ona...
Çıxır asta-asta qapıdan onlar.

*Leyla* – Məhəmməd, mənim də bir bəxşişim var,
Hələ hazır deyil...

*Məhəmməd* – O nədir görən?
– Rəsmini çəkirəm axı sənin mən.
Gözümün önünə gətirib səni,
Çəkmək istəyirəm...
Titrəyir qələm;
Neçə cür çəkmişəm sənin şəklini,
Ancaq heç birini bəyənməmişəm.
Gözlərin elə bil yol çəkir sənin,
Nəyisə, kimisə gözləyir müdam.
O sonsuz həsrəti nəqş eyləməkçin
Kölgə tapammıram, rəng tapammıram.
Onlar asta-asta keçir çəməndən
Məhəmməd qımışır:

– Bir bura bax sən,
Bir bax cəlalına çölün, çəmənin,
Bahar da hüsnünə heyrandır sənin.
Bahar naxışını səndən götürmüş,
O, sənə hər şeyi qurban demişdir.
Sənin gözlərini yuxulu görmüş,
Otlardan çöllərə fərş döşəmişdir.

## ƏMİ QATİLİ

*Ey Füzuli, qalmışam heyrətdə bilməm neyləyim,*
*Dövr zalim, bəxt nafərcam, tələb çox, ömr az.*

Gecələr yaman olur,
Gecələrin qoynunda
    Sirlər pünhan olur,
Gecələrin zülməti
    Udur hər cinayəti.
Zülmətin qucağından
    Çıxıb doğulan səhər,
Təzə anadan olmuş
    Adsız körpəyə bənzər.
Hələ günahı yoxdur,
    Təmizdir göy də, yer də,
Hələ pakdır, təmizdir
    Körpə kimi səhər də.
Hələ kir götürməmiş
    Onun təmiz ürəyi,
Körpənin nəfəsidir
    Səhərin saf küləyi.
Elə ki, gündüz olur,
    Yaxşı-yaman durulur,
Əməllərə, işlərə
    Şahid kimi baxır gün.
Bütün cinayətlərin
    üstünü örtmək üçün

Göylər öz çarqatını
Sərir yerə gecələr,
Arxa durur elə bil
Canilərə gecələr.
Gecələr yaman olur,
Gecələrin qoynunda
Sirlər pünhan olur.
Gecələrin zülməti
Udur hər cinayəti.

Bax, belə bir gecədə, gecənin zülmətində
Qından çıxdı bir qılınc xanın imarətində.
Bu qılınc düz köksünə endi İbrahim xanın.
Duyan bir can daş oldu, gücünə bax zamanın.
Günəş öz tellərini yayan kimi düzlərə,
Gecə öz sirlərini danışdı gündüzlərə,
Bağdad bu bəd xəbərdən çalxalandı bir anda,
İnsan nələr törədir bu vəfasız cahanda.
İnsan! Sənin kamalın göylərdən də dərindir,
Dünyadakı gözəllik sənin əməllərindir.
Sən qadirsən hər şeyə! Bu qüdrət ki, səndə var,
Bəd əməldən nə çıxar?
Kim öldürdü xanı, kim?
Kim tökdü bu qanı, kim?
Kimdir xanın qatili?
Bilən bildi, dinmədi,
“Mənə nə düşüb?” – dedi.
Xanın qardaşı oğlu o gün keçdi xanlığa,
Əl atdı yamanlığa.
Talan etdi sarayın dövlətini, varını,
Zülfüqar, əmisinin yaxın adamlarını
Məhv etdirdi, taladı bütün obanı, eli.
Bağdada hakim oldu o gün əmi qatili:
Niyə etdi bunları?
O, niyə məhv eylədi günahsız insanları?
Bəli, rəyasət eşqi yaman olur, çox yaman!
Onun əlindən aman, onun felindən aman!

Bu dərdə tutulanlar insanlığa yad olur.
Adı insan olsa da, insana cəllad olur!
Şərqin dərdi böyükdür qədim tarixi qədər,
Didir biri-birini təriqətlər, nəsillər.
Qardaş qardaşa düşmən, oğul ataya düşmən,
Didir biri-birini xaqanlar hikkəsindən.
Füzuli ömrü boyu
Neçə-neçə qanların,
Odların, üsyanların
Burda şahidi oldu.
Yurda dəyən zərbələr
Məhəmməd Füzulinin
Sinəsinə vuruldu.
O hələ uşaq ikən
Torpağın yarasını,
Öz elinin, yurdunun
Matəmini, yasını
Duymuş öz ürəyində,
Doğmuş bu yaralardan
Minbir söz ürəyində.
O, hələ uşaq ikən
Düşünmüş için-için:
"Bu yollar, təfriqətlər,
Təriqətlər nə üçün?"
O, bir şeir də yazdı Zülfüqarın adına,
Şeir düşdü dillərə, tez yayıldı hər yana.
Rəyasət davasını şeirlə qamçıladı,
Sözlərdən könüllərə sanki nur damcıladı:
...Rəyasət! Hökmün çatır bu dünyada hər yerə.
Sən "şərəf" gətirirsən bəzən şərəfsizlərə.
Sən alçaq bir vücudu qiymətə mindirirsən,
Sən adi bir insana "dahilik" də verirsən!
Nələr çəkir adamlar sənin fərmanlarından!
Bəzən sənin gücünlə, qüdrətinlə bir insan
Bir top kimi oynadır əlində bu cahanı,
Mininə ölüm yazır bir quduzun fərmanı.
Rəyasətlər, rütbələr cinayətlə doludur,

Bəşər başda oturan quldurların quludur.
Şeir gəzdi dilləri, gəlib çatdı saraya,
Aldı alinəsəblər Zülfüqarı araya.
– Xan sağ olsun, Füzuli artıq həddini aşdı,
Biz heç, budur indi də gəlib sizə sataşdı.
Dirək oldu göylərə Zülfüqarın nərəsi,
Güclü bir fərman oldu bir alçağın cır səsi:
– Azdır ona ölüm də, gərək ona dağ vuram,
Şeir deyən dilinə od basam, qadağ vuram!
Tez bir cəza düşünün, ağır cəza!
Əyanlar
Hərəsi bir söz deyir.
Bəyənməyir Zülfüqar.
Vəzir qalxır ayağa:
– Xan sağ olsun, bu şair
Müəlliminin qızı Leylanın aşiqidir.
Siz bu qızı alsanız onun əlindən əgər,
Füzulinin qəlbinə məhşər dağı çəkilər.
– Bax bu yaxşı xəbərdir, bu tədbirə mən varam,
İstədiyim qisası indi ondan alaram.
Gedin, qızı gətirin, qəmlərim unudulsun,
Şairin sevgilisi xanın kənizi olsun!

## İKİ HÖKMDAR

*Vadiyi-vəhdət dəqiqətdə məqami-eşqdir,*
*Kim, müşəxxəs olmaz ol vadidə sultandan gəda.*

Xanın elçiləri minbir vəd ilə
Qoca müəllimi tutdular dilə
Qızı gətirdilər saraya zorla,
Hər şeyi sarayda anladı Leyla.
Yetirdi özünü xacə o saat,
Baxdı təzə ovun üzünə mat-mat:
– Allah, bu hurimi, mələkmi – deyə,
Xacə heyran qaldı bu gözəlliyə.
Hərəmlər dəydilər biri-birinə,

Baxdılar həsədlə rəqiblərinə.
Gəldi məşşatələr, bir anda gəldi,
Gəlin otağında meydan düzəldi.
Onu salamlayıb, xoş dindirdilər,
Saray ədasıyla geyindirdilər...
Üzüldü hər yerdən Leylanın əli,
Eldən ayrı düşdü ellər gözəli.
Ancaq şirin sözlər, şirin vədələr,
Təhqirlər, təhdidlər, min cür hədələr
Onun inadını qıra bilmədi.
"Mən öz mənliyimi satmaram!" – dedi.
Xəbər çatdı xana, qəzəbləndi xan,
Qulaqlar tutuldu bağırtısından:
– Necə? Yola gəlmir?
Çəngiyə bir bax!
Mənim iradəmə təslim olmamaq?!
Yaxşı! Bu axşam
Mən özüm onunla hesablaşaram!..
Gör nələr yaradır hökmü dövranın:
Leyla hüzurunda dayanmış xanın.
Xan, qızı görüncə birtəhər oldu,
Çatıldı heyrətdən onun qaşları;
Gözü dumanlandı, nitqi tutuldu,
Görüncə süzülən lal baxışları.
Yandı ürəyində ehtiras odu,
Qəzəbi soyudu, hirsi soyudu.
Gözəllik! Kim sənə "mən koram" – dedi.
De, sənin önündə kim baş əymədi?
Ürəklər başında var yerin sənin
Qılıncdan itidir kəsərin sənin!
De, sənin gücündən böyük güc hanı?
Alan sən olursan ixtiyarını
İnsanın əlindən bir an içində.
Bəzən əqidə də, məslək də, din də,
Sənin atəşinə yanıb kül olur,
Əməllər, arzular göyə sovrulur.
Dinindən əl çəkib o Şeyx Sənan
Boynuna bir anda xaç salmadımı?

Qayəsi yolunda ucalan insan
Gözəllik önündə alçalmadımı?
Gözəllik daşı da gətirər dilə,
Hökmünə ram olar vəhşilər belə.
Xan, qızı görüncə birtəhər oldu.
Çatıldı heyrətdən onun qaşları;
Gözü dumanlandı, nitqi tutuldu,
Görüncə süzülən lal baxışları.
Baxışlar.
Nə qədər dərindir hələ,
Batar o gözlərdə qəvvaslar belə.
O ilahi gözlər, o ulu gözlər.
O nərgiz baxışlar, yuxulu gözlər
Yatan duyğuları yuxudan eylər,
Bir yol süzüləndə min bir qan eylər.
Həyat eşqi ilə o dolu gözlər,
O xumar baxışlar, yuxulu gözlər –
Böyük bir şairin ilham çırağı
Alçaq bir qatilin önündə yanır.
Şairin qəlbinə çəkilən dağı
Xan öz aləmində intiqam sanır.
Xeyr!
Qisasında yanılmısan sən!
Bu qisas deyildir əgər düşünsən.
Lənət oxuyacaq nəsillər sənə,
Qoy qanad verməsin bu illər sənə.
Güvənmə taxtına, şərəfsiz insan,
Sən aylar, sən illər hökmdarısan,
O sa əsrlərə hökm edəcəkdir,
Zülm yaşasa da, ömrü gödəkdir.
Xan, qızı görüncə birtəhər oldu,
Çatıldı heyrətdən onun qaşları;
Bədəni uçundu, nitqi tutuldu,
Görüncə süzülən o baxışları.
Sarsıtdı sehriylə gözəllik onu,
Gözəllik önündə əfsunlandı xan.
İlk dəfə unudub xan olduğunu,
Özünü bir adi insan sandı xan.

Gözündə kiçilir, alçalır onun
Taxtı, rəyasəti, hökmü, fərmanı.
İlanı yuvadan çıxaran əfsun,
Quzuya döndərir zülmkar xanı.
Xacəni səsləyib:
– Aparın! – dedi.
Qızı apardılar hərəmxanəyə,
O gündən göz yumdu xan da hər şeyə.
Keçdi bir neçə gün, xanın gözləri
Röyalar içində dumanlanırdı.
Xan o gündən bəri, o gündən bəri
Hər nə görürdüsə yuxu sanırdı.
Düşünür: görəsən o gözəl sənəm
Hüsnünün sehrini hardan götürmüş?
Xan başa düşmürdü nəydi o aləm,
Nağılmı eşitmiş, yuxumu görmüş?
Xacəni çağırıb yanına bir gün,
Xan öz ürəyini danışdı bütün.
Söylədi Leylaya vurulduğunu:
– Baş hərəm qoyuram – dedi – mən onu...
Xacə xan əmrini çatdırdı qıza,
Qız susdu, qəlbindən qan sıza-sıza.
*Leyla* – Bu sözlər xahişmi, yoxsa əmrmi?
*Xacə* – Xahiş!
*Leyla* – Hərəmxanə bəs eyləmirmi?
*Xacə* – Yox! Sən ulduzların ən parlağısan,
Sənin camalına heyran olub xan.
O, sevir səni.
*Leyla* – Mən isə sevirəm bir özgəsini.
*Xacə* – Qızım, təpik atma, gəl, öz baxtına.
*Leyla* – Mənim öz bəxtim var.
*Xacə* – Nə deyim xana?
*Leyla* – De ki, üz döndərib məhəbbətimdən,
Ucuz şöhrətlərə əyilmərəm mən!
*Xacə* – Qızım, inad olma, inadı sındır,
Anla ki, xan sənin hökmdarındır!
*Leyla* – Xacə, dediyini yaxşı düşün bir,
Qəlbin hökmdarı məhəbbətidir.

Zindana saldılar Leylanı o gün,
Dünya zindan oldu Məhəmməd üçün.
Leyla razı idi öz əməlindən,
O, zəhər içmişdi eşqin əlindən.
Məhəbbət yolunda çəkdiyi əzab
Ona kədər deyil, vüqar gətirdi,
O, öz həyatını, cavan ömrünü
Uğursuz taleyin hökmünə verdi.
O dedi: – Zülmünlə, ey çərxi-dövran,
Ciyərim qan oldu, yaralanmışam.
Ancaq deməərəm ki, sən bivəfasan,
Verdiyin cəfanı vəfa sanmışam.
Onun əzabını çəkdi Məhəmməd,
Sifariş göndərdi dalbadal xana.
Ürəyində ağrı, gözündə həsrət,
O, lənət yağdırdı çərxi-dövrana.
Yazdı: "Tanımıram nə xan, nə qanun".
Yazdı: "Düşmən qəvi, taleyim zəbun".
Yazdı: "Qıyarlarmı, gülə? Qaydadır
Bülbülü salarlar qəfəsə, ey xan.
Hökmün ki, ölkədə hər yerə çatır,
Çəkinmə bülbülün ahü-fəğanından.
Güvənmə hökmünə, təxti-tacına,
Zamanın yolları düyün-düyündür.
Zülmün qılıncını götür, sal qına,
Gülə əl qaldırmaq gücsüzlüyündür.
Qorxmuram zülmündən, siyasətindən,
Şairəm, qaraya ağ deməərəm mən!
Səndə zərrə qədər insaf var isə,
Gülü yox, bülbülü sal o məhbəsə!..
Məktublar dalbadal axdı saraya,
Əyanlar aldılar xanı araya.
Hərə bir söz dedi,
Çox düşündü xan,
Yenə də dönmədi öz inadından.
Dedi: – Tez saraya çağırın onu,
Anladaq şairə qudurduğunu!..

Sağında, solunda yaltaq kübarlar,
Bir yanda Füzuli, bir yanda Leyla;
Xanın gözlərində od var, alov var,
Gah sağa boylanır, gah baxır sola.

*Xan* – Deyirlər, Leylanın Məcnunusan sən,
Nə deyə bilərsən məhəbbətindən?

*Füzuli* – Əsil aşiq mənəm düzü, hökmdar,
Məcnunun dünyada ancaq adı var.
Mənəm bu əsrdə eşqin Allahı,
Məni bənzətməyin Məcnuna zinhar,
Ahımca olsaydı Məcnunun ahı,
Yuva tikərdimi başında quşlar?

*Xan* – Leylanın şəninə onda gərək sən,
Burda bədahətən şeir deyəsən...
Füzuli danışmır...
– Hə, bəs nə oldu?
Həcv deyən dilin niyə tutuldu?
Füzuli danışmır...
– Əmr edirəm mən:
Gərək hüzurumda şeir deyəsən!

*Füzuli* – Bir xan olsanız da bunu bilin siz,
Mənim hökmdarım siz deyilsiniz.

*Xan* – Sənin hökmdarın bəs kimdir görən?
Özgə xanlığınmı təbəsisən sən?

*Füzuli* – Leyla namusumdur, Leyla arımdır,
O mənim yeganə hökmdarımdır.
Ömür dastanımdır o gözəl pəri,
Hökm onun hökmüdür, əmr onun əmri.
Gülür gözlərində Leylanın cahan,
Deyir: – Belə olar sevənlər, ey xan.
Onun hər kəlməsi eşqin səsidir,
Aşiqin sultanı məşuqəsidir.
Hökmdar bu sirri yaxşıca bil sən,
Sevgi dünyasında hələ tifilsən.

*Xan* – Sus!

*Füzuli* – Susa bilərmi dolu ürəklər?
Zəncir götürməyir azad diləklər!

Deyə cavan şair qalxır üsyana.
Bütün qəzəbini yağdırır xana:
– Eşit sözlərimi, ey xan, indi sən,
Mən də sənin kimi bir hökmdaram.
Sən öz hökmün ilə gəldi-gedərsən,
Mən ulu sevgimlə həmişə varam.
Sən də şah, mən də şah...
Sən ölkələri,
Mənsə könülləri fəth edirəm, xan!
Qılıncdır, nizədir silahın sənin,
Mənim silahımsa sözdür hər zaman.
Qılınc bu gün varsa, sabah pas tutar,
Sözünsə qılıncı həmişə parlar.
Qılıncla, mizraqla sən danışırsan,
Mən nəşə doğuran sözlərlə, ey xan.
İndi ki belədir, gəl, məndən əl çək,
Axı, çəkişənlər tay olsun gərək!
Gəl mənim Leylamı alma əlimdən,
Onsuz nəfəsi yox, quru canam mən.
*Xan* – Mənə də, ey şair bax bu gərəkdir.
Səni ömrün boyu inlədəcəkdir
Bu gün hüzurumda dediyin sözlər,
Gərək həsrət qala sənə o gözlər.
Ölüm belə azdır sizə, dayanın,
İkiniz bir oda yandıqca yanın!

## AH, O ZALIM OVÇULAR!..

*Oxun gəldikcə sinəmdən sədalardır çıxan bilməm,*
*Dil eylər nalə, ya peykan dəyər sinəmdə peykanə.*

Bu əhvalatdan sonra hələ bir neçə ay da
Saxladılar Leylanı məhbus kimi sarayda.
Leyla soldu, saraldı, xəzan vuran bağ kimi,
Sızladı gecə-gündüz yağsız bir çıraq kimi.
Ürəyinin dərdini dedi o bəxti qara;

Gündüzlər buludlara, gecələr ulduzlara.
Yuxusu da gecələr uçub ərşə çəkildi,
Sübhə qədər gözləri şam çırağa dikildi.
Dedi: – Sən də yanırsan, mən də... bir fərqimiz var.
Yanğı elə yanğıdır, bu fərq bizi ayırar:
Sən gecələr yanırsan, mənsə, mənsə, ey çıraq,
Həm gecələr yanıram, həm gündüzlər, dərdə bax!
Zülmlər, işgəncələr sarsıtmır ancaq onu,
Füzulinin verdiyi o qızıl medalyonu
Sinəsinə basaraq hıçqırır sübhə qədər;
Füzulinin yazdığı könül yaxan qəzəllər
Saray divarlarını dəlib keçir bir anda,
Bu qəzəllər gül açır qızın dodaqlarında:
"Aşiyani-mürği dil zülfi-pərişanındadır,
Qanda olsan, ey pəri, könlüm sənin yanındadır.
Eşq dərdilə xoşam, əl çək əlacımdan, təbib,
Qılma dərman, kim həlakim zəhri-dərmanındadır.
Bəs ki, hicranındadır, xasiyyəti, qəti həyat,
Ol həyat əhlinə heyranam ki, hicranındadır".
Muğam üstə oxuyur Leyla bu sətirləri,
Heyran qoyur səsinə o, göyləri, yerləri,
Bu səs əridir qışın şaxtasını, qarını.
Bu səs dilə gətirir saray divarlarını.
(Dərdi ağır deyildir dərdini bilməyənin,
Dərdi yaman ağırdır sevib-sevilməyənin...
Dərdinə dərd çatarmı
        həm sevib, həm sevilib
        Eşqi yetim qalanın?
Həm özü, həm aşiqi
        Bir alçağın əlində
        Qul olub alçalanın!)
Xan gözlədi,
Gözlədi,
Çatmadı arzusuna;
Qızın inadkarlığı çox ağır gəldi ona.
Çox düşündü, nəhayət, hiylələrə əl atdı,
Bir gecə qol gücünə məqsədinə o, çatdı.

Saray əhli car çəkib xəbər yaydı hər yerə:
Leyla sürgün edilmiş Bağdaddan yad ellərə.
O gündən də Füzuli dərə aşdı, dağ aşdı,
Obaları, elləri oymaq-oymaq dolaşdı.
Şeir dedi, inlədi, o, "Leyla!", "Leyla!" – deyə,
Yaralı ahu kimi baş vurdu hər şenliyə.
Keçdiyi hər obadan Leylanı xəbər aldı,
O, öz məhəbbətiylə ucaldı, hey ucaldı.
O gördü qasırğa da, gördü şaxta da, qar da.
Gördüm deyən olmadı Leylanı bir diyarda.
Günəş saraldı getdi,
Göylərə daldı getdi.
Ayı Leylası bildi,
O da yan aldı getdi.
Ürək vurur, yorulmur,
Könül yanır, qor olmur.
Sənə baxan gözlərim
Niyə sənsiz kor olmur?
Füzuli obaları gəzməkdən yorulmadı,
Ancaq onun səsinə bir səs verən olmadı.
Məhəbbəti ürəkdə, qəzəlləri sinədə
Kor-peşiman qayıtdı o, Bağdada yenə də.
Ürəyində boğuldu Füzulinin haqq səsi,
Bülbüllərin naləsi, küləklərin nəğməsi,
Ahəng tutdu aşiqin "naleyi-dilsuzinə".
Daldı düşüncələrə, xəyallara o, yenə.
Onun sonsuz dərdləri yetişmədi dəvaya,
O qayıdıb evinə çəkildi inzivaya.
Gecə-gündüz düşünmək ona bir adət oldu,
Təsəllisi bir xəyal, bir də ibadət oldu.
O, çox mənalar verib dünya qeylü-qalına,
Göylərdən cavab umdu yerlərin sualına.
Fələklər göydə çin-çin yandı onun ahından,
Arzusunun çırağı alışmadı bircə an.
Ürəyinin naləsi,
Aman səsi, ah səsi
Yatanları oyatdı, bəxtini oyatmadı.

Ahı göylərə çatdı, zalım xana çatmadı.
Alnında izlər açdı əzabları xış kimi,
İnlədi çöldə bitən yaralı qamış kimi.
Şair açıb qəlbini dedi: – Yanan mənəm, mən,
Günəşə, ulduzlara, aylara düşmənəm mən.
Onlar öz tellərini elə ki, yerə sərir,
Mənə min cür fəlakət, faciələr göstərir,
Siz məndən soruşmayın, mən nələri sevirəm,
Buludları sevirəm, gecələri sevirəm.
Ensin yerə buludlar, ensin yerə qaranlıq.
Ələmləri, dərdləri mən görməyim bir anlıq.
Ah, o zalım ovçular!.. Ah, o zalım ovçular!..
Onlarda insafmı var?
Yuvasını dağıtdı mənim bülbüllərimin,
Yuxusunu qaçırtdı yuxulu çöllərimin.
Bu dünyaya gələli üzüm gülmədi bir gün,
Dünyadan zövq istəyən, dünyadan əl götürsün?!
Mən bir zövq görəmmədim nə qədər dünyadayam,
Qəm dənizi içində yalqız qalan adayam.
Nə qəlbimin ahları, nə gözümün qan-yaşı,
Söndürə bilmir mənim sinəmdəki atəşi.
Əridirəm oduma ürəyi də, canı da,
Qorxuram ki, yandıram oduma dünyanı da,
Dəli küləkləriylə, dilə gəlib ney kimi,
İstərəm ki, təbiət çalsın mənim qəmimi,
Yerdə odlar qalansın,
Dəryalar dalğalansın,
Hayqırsın üsyanımı.
Görüb eşitdikcə mən, oda yaxdım canımı!
Necə dözüm bu dərdə, məgər daşam, dəmirəm?
Mən görmək istəmirəm, eşitmək istəmirəm.
Görüb eşitdikcə mən artır sinə dağlarım,
Ətdən gözüm olaydı, daşdan da qulaqlarım.
Hər şey yalandır, yalan! Ömür qəm karvanıdır,
Talelər ömürlərin əbədi sarvanıdır.
Böhtanlar vadisində ömür atımı sürdüm.
Kefdən dəm vuranları, mən ki, yalançı gördüm.

Vəfa umduqlarımdan cəfa gördüm hər zaman,
Güzgüdən sidq istədim, əyri gördüm özümü.
Suya dedim dərdimi, axıb keçdi yanımdan,
O da ağzımda qoydu iki kəlmə sözümü.
Ey dəhşətli fikirlər, məndən uzaqlaşmayın,
Siz mənim ürəyimdən kənarda ağlaşmayın.
Şairəm, qəm içində keçir gecəm, gündüzüm.
Sevdalı xəyalların övladıyam mən özüm!
Yalnız yalan gerçəkdir. Mən bu haqqı danmıram,
Mən öz varlığıma da şəkk edir, inanmıram,
İnanmıram göyə də, inanmıram yerə də,
Min əfsanə uyduran böyük nəbilərə də.
Varsa bir inandığım: yalnız eşqdir o da,
Min dünya kəşf etmişəm, eşqimlə bir dünyada.
Özüm də heç bilmirəm bu dünyaya nə deyim?
Nə gecəm bir gecədir, nə gündüzüm bir gündüz.
Ey mənim məhəbbətim, eşqim, hissim, diləyim,
Siz həm mənim həyatım, həm də ölümümsünüz!
Ölüm, sağ görüb məni, atma mənə pəncəni,
Mən ki çoxdan ölmüşəm, naləm aldatmış səni!
Aylar keçdi, il oldu, əvəz etdi gün-günü,
Zaman verdi hökmünü,
Yaman verdi hökmünü:
Şah Təhmasib bir gecə hücum çəkdi Bağdada,
Düşdü yenə qan-qada.
Zülfüqarın taxtını
Çevirdilər başına,
Gecənin zülmətində o, yaşına-yaşına
Qaçırdı təkbaşına.
        Elə bu vaxt, bu zaman
Qayıdırdı Füzuli evə yaxın obadan.
Onlar qarşılaşdılar.
        Görən kimi tanıdı şair onu:
        – Zülfüqar!
Hara belə qaçırsan, dayan, sənə sözüm var.
– Aman, şair qoy gedim.
– Dayan, hələ dayan, xan,

Elə ki, ayrı düşdün öz taxtından, tacından,
Adi bir adam oldun, getdi şanın, şöhrətin,
Təxti-tacında imiş bütün gücün-qüdrətin.
Get, zülmündən qurtarıb, məmləkət azad oldu,
“Zülm ilə abad olan ədl ilə bərbad oldu”.
“ – Padişahi – mülk, dinarü dirhəm rüşvət verib,
Fəthi-kişvər qılmağa eylər mühəyya ləşkəri.
... Göstərən səatda dövrani-fələk bir inqilab,
Həm özü fani olur, həm ləşkəri, həm kişvəri.
Gör nə sultanəm məni-dərviş kim, feyzi-süxən,
Eyləmiş iqbalimi asari-nüsrət məzhəri.
... Qanda kim, əzm etsə, mərsumu məvacib istəməz.
Qansı mülkü tutsa dəgməz kimsəyə şurü şəri...”
– Söylə, Leyla hardadır?
– Sarayda.
– Yalan demə.
– Mən düzünü deyirəm, saraydadır.
– Qəlbimə
Sənin fitnələrindən çəkildi məhşər dağı,
Heyf! Dünya saxlayır qoynunda hər alçağı.
Deyə ordan birbaşa saraya gəldi şair,
Axtardı hücrələri, otaqları birbəbir.
Girdi hərəmxanəyə,
Tapılmadı Leylası, “o, hara getmiş?” – deyə
Düşündü için-için,
Yenə köhnə yarası təzələndi şairin.
O gecə Zülfüqar xan
Qaçan kimi saraydan,
Qapıları açdılar.
Qızlar hərəmxanadan çıxıb dağılışdılar.
Hərə getdi bir yerə, Leyla da azad oldu,
Sanmayın ki, o, bundan, fərəhləndi, şad oldu.
Gecənin zülmətində öz-özünə deyirdi:
“Hara gedim mən indi?
Evəmi? Bəs atamın necə çıxım üzünə?
Heç özü də bilməyir, fikri nədir, qəsdi nə?
Hələ bu heç... Məhəmməd! O, nə deyər bəs mənə?

İtirdim ismətimi... Gülməzmi hər kəs mənə?
Yox, yox, mən bu halımla göydən yerə enmişəm,
Bir alçağın əlində mən ki ləkələnmişəm.
Mən bədbəxti taleyim yaman saldı çətinə,
Şairin o müqəddəs, böyük məhəbbətinə
Layiq ola bilərmi mənim ləkəli adım?
Heyhat! Gözümdə qaldı bütün arzum, muradım,
Yox! Bu daha ağırdır bütün işgəncələrdən!
Məhəmmədin gözünə görünə bilmərəm mən".
Deyə doğma şəhəri gecə tərk etdi Leyla,
Kərbəlalı bir qıza qoşulub getdi Leyla.
Getdi, çıxdı şəhərdən.
Bir xeyli getdi... Birdən:
– Yox, mən onu görməmiş hara gedirəm – deyə
Leyla döndü geriyə:
– Aman, bacım, izn ver, gedim, görüm mən onu –
Könlümün ilk dostunu.
Bəlkə bu lilli sular axdı, heç durulmadı,
Onu görmək bir daha mənə qismət olmadı.
Qulağımda bir daha səslənmədi səsi də.
– Gedək! – deyə qoşulur ona rəfiqəsi də!
O, keçdikcə şəhərin tanış küçələrindən,
Təəssüflə ah çəkir, köks ötürür dərindən.
Düşünür asta-asta: "Küçələr, ay küçələr,
Mən sizin sinənizi tapdamışam nə qədər.
Bu yollarla nə qədər mədrəsəyə getmişəm,
Qayğısız illərimi mən burda əritmişəm.
Bu yollarda itibdir ömrün şirin dəmi də.
Bu yollarda tapmışam mən öz sevgilimi də.
Ah... bu yollar, bu yollar!
        Neçə il bundan qabaq
Kim deyə bilərdi ki, belə bir gün olacaq?
Kim deyə bilərdi ki, könlüm düşəcək dara?
Göz yaşlarım axacaq gül səpdiyim yollara?
Gülə-gülə keçdiyim bu yollardan bir zaman
Mən ağlaya-ağlaya keçəcəyəm... ay aman!
Bir düşdüyüm günə bax!

Taleyin hökmünə bax!”
Leyla bayaqdan bəri
Gəzir bütün şəhəri.
Ancaq rəfiqəsi də
Gözdən buraxmır onu
İzləyir öz dostunu
Belə ağır günündə.
Mədrəsənin önündə
Gəlib Leyla dayanır,
Ötən günləri anır.
Səslənir qulağında bir inilti, bir ənin,
O öpür kandarını ona tanış hücrənin.
Nəzərləri içəri sancılıb durur nədən?
Məhəmmədi soruşur elə bil o, hücrədən.
Evlərinin yanından ötərkən yana-yana,
Ötəri nəzər salır o, balaca eyvana.
Gəlib çıxır nəhayət
Balaca bağçasına sevimli Məhəmmədin,
Məhəbbəti inləyir qəlbində həzin-həzin.
Pəncərənin önündə o, dayanır lal kimi,
Gördükləri görünür gözünə xəyal kimi.
Odur, şair oturmuş balaca miz dalında,
Quş ləleyi əlində, bir dünya xəyalında.
Yazır, pozur... əriyir önündəki şam kimi.
“Ah... o yazır, o yazır yəqin mənim eşqimi” –
Deyə Leyla düşünür:
– Xeyli keçmiş gecədən,
Yatmayıbsan hələ sən.
Mənim böyük şairim, ah yazır, aman yazır.
O, “Şəbi-hicran” deyir, o, “Şəbi-hicran” yazır.
Zilləyib gözlərimi pəncərənə baxıram,
Gülüm, sənə baxıram.
Məhəbbət sapımıza vuruldu bir kor düyün,
Bax, bu saat eşqini kağızlara tökdüyün
Sevgilin durub sənin,
Önündə pəncərənin.
Səninsə xəbərin yox!

Mənimlə bircə anlıq
Görüşünə sən yəqin
Həyatını verərdin!
Başa düşmək olmayır gərdişi, ey sevgilim,
Tərsinədir dünyanın hər işi, ey sevgilim,
Səni çox sevdiyimdən,
Burdan getməliyəm mən.
Ləkəli bir ad sənə istəmirəm yük olsun!
Qoy sənin böyük adın həmişə böyük olsun!
Deyə doğma şəhəri gecə tərk etdi Leyla,
Kərbəlalı dostuna qoşulub getdi Leyla!

## **“LEYLİ VƏ MƏCNUN”**

*Ey Füzuli, qılmazam tərki-təriqi eşq kim,*
*Bu fəzilət daxili-əhli-kamal eylər məni.*

“Hasilim yox səri-kuyində bəladan qeyri,
Qərəzim yox rəhi-eşqində fənadan qeyri.
... Yetdi bikəsliyim ol qayətə kim, çevrəmdə
Kimsə yox cizginə, girdabi-bəladan qeyri.
Nə yanar kimsə mənə atəşi-dildən özgə,
Nə açar kimsə qapım badi-səbadan qeyri...”
O saxlayıb qələmi bir ah çəkdi bu zaman,
Səhər küləkləriylə Kərim girdi qapıdan –
Sevincindən yaşardı gözləri bu dəm onun,
Qalxıb atdı özünü qucağına dostunun.
Bir xeyli baxdı onlar üzünə bir-birinin,
Sözünü gözlər dedi dolu ürəklərinin.
Dostlar xeyli susdular,
Axdı ürəklərindən qanlı sular, lal sular.
Bu hal bir xeyli keçdi...
Nəhayət əyləşdilər,
Gözdən sözə keçdilər.
Füzuli qəzasını bir-bir ona danışdı,
Yana-yana danışdı.

O, axırda oxuyub dostuna son şeirini,
Yerə dikdi yaş dolu o yorğun gözlərini,
– Dostum, bu şeir deyil, şeir dinləmədim mən,
İldırımmı çaxırdı sənin sətirlərindən?
Yoxsa yanaqlarıma dəydi sübhün nəsimi?
Bu, göyün hıçqırığı, bu, yerin naləsimi?
Bu, baharın çiçəyi, zimistanın qarıdır.
Bu, öz oduna yanan qəlbin alovlarıdır.
Dostundan gizlətmə, gəl, sən gözünün yaşını,
Çevir şeir incisinə qəlbinin atəşini.
"Xəmsə"ni gətirmişəm, budur, sənə hədiyyə,
Götür, oxu bir daha
Füzuli: "Sağ ol" – deyə,
Öpür, öpür "Xəmsə"ni, dərya kimi çağlıyır,
Sonra o, aram-aram kitabı varaqlıyır.
"Leyli-Məcnun!"... dayanır, o, burada.
– Bunu mən,
Dostum, oxumalıyam bu halımda yenidən.
*Kərim* – Daha yaxşı duyarsan, sən indi bu dastanı.
*Füzuli* – Məni sənintək duyan bir dost, havadar hanı?
Minnətdaram sənə mən,
Sən Məcnunun Zeydisən!..

Havayı keçirmədi bir saatı, bir anı.
Nizami Gəncəvinin "Leyli-Məcnun" dastanı
Onu vəcdə gətirdi... Təkrar-təkrar oxudu.
Gah oxudu, gah da ki, əlinə aldı udu.
Çaldı,
Çaldı,
Çox gizli nöqtələr tapdı onda,
Tapdı axtardığını muğamın xallarında.
Açıb ona sirrini çox gizli pərdələrin,
Düşündürdü şairi Nizami dərin-dərin.
– Hər sətri bir xəzinə, hər sözü bir pəhləvan.
Heyf!.. Ana dilində yazılmamış bu dastan,
Bax, burada gör necə xal vurubdur Nizami,
Öz böyük arzusunu dondurubdur Nizami.

Daşüzlü qanunların şaxtasında, qarında.
“Ey qulluq halqaları!” – siz o sənətkarın da
Qulağını sıxdınız, unutdu öz dilini.
Danışa da bilmədi, yandırdı söz dilini.
Yaşasam da həmişə mən ərəb ölkəsində,
Yaşatmışam xalqımı öz şeirimin səsində.
Azərbaycan oğluyam... Bilsin bunu, qoy, aləm!
Mürəkkəbə döndərib kağıza tökməliyəm
“Vətən”, “Vətən” – söyləyən ürəyimin qanını.
Bu köhnə əfsanəni – Leylinin dastanını.
Leylamın öz dilində yazam gərək, yazam mən!
Yeni dastan bağlayım nakam məhəbbətimdən!..

Füzuli muğam üstdə yazdı “Leyli-Məcnunu”,
Gah neyi ağlatdı o, gah ney ağlatdı onu.
Muğamın sinəsindən doğdu Füzuli şeiri,
Elin hicran səsindən doğdu Füzuli şeiri.
Muğam bir xəzinədir, açarıdır duyğular,
Muğamda sevinc də var, muğamda kədər də var.
Muğam mənim xalqımın misilsiz kamalıdır.
Tarixidir, eşqidir, arzusu, amalıdır.
Tar səsinə qulaq as...
Bu səs elin nəfəsi,
Bu səs gözlərdən axan yaşların damcı səsi.
Bu səs sükuta dalmış göyü də dilləndirər,
Ulduzlar da bu səsin önündə baş endirər.
Dinlərkən onu... yerdən ayağımız üzülür,
Səslərin laylasında gözlərimiz süzülür.
Gah göylərə ucalır, gah yerə alçalırıq,
Xəyalın qanadında özümüzə dalırıq,
Gözümüzün önündə açılır nələr-nələr,
Əlvan-əlvan lövhələr.
Muğam, sənsiz keçməsin ömrümün bircə günü,
Muğam, sənin önündə ən incə söz gücünü,
Ən zərif güllər belə itirər öz rəngini.
Azərbaycan şeirinin yaratdın ahəngini!
Torpağa can verirsən,

Dilsiz daşları belə sən dilə gətirirsən!
Mən səni dinləyəndə, ah, bu nədəndir müdam,
Dərdim də yada düşür, sevincim də, ay muğam,
Ötən xatirələrim cana gəlir, bu dəm mən
Yaşadığım günləri yaşayıram yenidən.
Gücün kimi güc hanı?
Sənin gücün, qüdrətin,
Ölümə də səsləyir, həyata da insanı!
Axtardığı Leylanı o, tapmadı həyatda,
Həyata güldüyündən,
    Ağlatdı zülüm-zülüm
    Füzulini həyat da...
O, qələmə əl atdı,
Leylanın xəyalını kağız üstdə yaratdı:
"Xəyal ilə təsəllidir, könül meyli – vüsal etməz.
Könüldən dişrə bir yer olduğun aşiq xəyal etməz".
Füzuli əyləşib otağında tək,
Oynaşır üzündə qəm buludları.
Bayırda cücərib min gül, min çiçək,
Əriyir qəlbində dağların qarı.
Qəlbinin gözüylə dünyaya baxıb,
Dedi: arzulara dar gəlir cahan.
Leylini, Məcnunu yandırıb-yaxıb,
Keçirdi zamanın fırtınasından.
Yandı dünya odu onun üzündə,
Ahını Məcnunun ahına qatdı.
Zamanı ağlatdı Leyli gözündə,
Məcnunu zamana üsyan yaratdı.
İnlədi, batmadı ancaq o, yasa,
Düşündü, aləmi düşündürdü o
Nofəlin parlayan qılıncındasa,
Bir gün parlayacaq haqqı gördü o.
Tökdü kağızlara könül varını,
İlhamı kükrədi, tüğyana gəldi.
Bir daha oxuyub yazdıqlarını –
Sənətin gücünə heyran kəsildi.
Dedi: – Sənətimlə illərdən bəri,

Daşa, torpağa da can verirəm mən.
Bəngü-badələri, cansız şeyləri,
Danışan insana çevirirəm mən.
Mən gah ney oluram, gah dəf, gahsa tar,
Gah kanon oluram, gah ud, gah setar.
Ney olsam, ney kimi inlərəm həmən,
Tar olsam, sim kimi gərilərəm mən.
Bir anın içində həm qara, həm ağ,
Həm yaxın oluram, mən həm də uzaq,
Həm gecə oluram, həm gündüz, Allah!
Həm "əyri" oluram, həm də "düz", Allah!
Gah Qeysin atası olub ürəkdən,
Leylini "oğluma istəmirəmmi?"
Leylinin atası olub gah da mən,
Onun xahişinə "Yox" demirəmmi?
Məni – Füzulini yaratdı Tanrı,
Alacaq qoynuna məni də torpaq.
Məhv olur Allahın yaratdıqları,
Mənim yaratdığım ölməzdir ancaq.
Füzulinin şöhrəti yayıldı ölkələrə
Onun söz inciləri bir gündə neçə kərə,
Neçə-neçə dodaqda inildədi ney kimi...
Hər kəs dedi: Füzuli yazıb mənim dərdimi,
Yandırdı ürəkləri bir qəlbin odu, közü.
Milyon qəlbin dərdini daşıyan qəlbin sözü,
Dindirdi mizrab olub milyon qəlbin telini.
Füzuli bayraq etdi doğma ana dilini,
O, bu dildə ilk dəfə "Leyli-Məcnun" yaratdı.
Leylaya çatmasa da,
        Böyük məhəbbətiylə
        Sonsuz şöhrətə çatdı.
Füzuli məhəbbəti,
Onun böyük sənəti
Məşəl kimi alışdı.
O, bizə dərdimizi,
        qəmimizi danışdı.

Burda böyük dərdimiz yadıma düşdü mənim:
Hələ birlik görməmiş mənim böyük Vətənim,
Qəsbkarlar əlində didildi, parçalandı.
Ancaq sərvəti deyil, ürəyi də talandı.
Sərvət getsə qəm deyil, sərvət gələr yenə də,
Bu qəmdir ki, bu elin qəlbinə, eşqinə də,
Dilinə, ruhuna da qəsd edələr, ay aman!
Ələmlərin, dərdlərin hamısından bu, yaman!
Bax, belə bir zamanda,
        Günəş kimi parlayıb,
        Qalxdı göyə Füzuli,
Saldı şəfəqlərini hər ölkəyə Füzuli.
Yada düşdü ürəkdə qövr eləyən acılar;
Hərəsi bir diyara düşən qardaş, bacılar,
Füzuli şeiriylə də tanıdı bir-birini.
O, çatdırdı qardaşa qardaşın əllərini,
Könüllərə bir ümid, nəşə verdi Füzuli;
Parçalanmış bir eli –
        Böyük Azərbaycanı
        Birləşdirdi Füzuli!
İllər ötdü, ölkəyə yenə düşdü qan-qada,
Fateh Sultan Süleyman hücum çəkdi Bağdada.
Şadlıq səltənətindən şah Təhmasib qovuldu
Səlim oğlu Süleyman Bağdada hakim oldu.
Gah onun, gah da bunun üzünə güldü iqbal,
Şahlar əvəz eylədi bir-birini dalbadal.
Füzuliysə əyləşib söz mülkünün başında,
Gəldi-gedər şahlara güldü qoca yaşında.
Neçə-neçə sultanı, xanı yola saldı o,
Söz mülkünün başında əbədilik qaldı o.
Onu yıxa bilmədi zamanın küləkləri.
Bir əvəzsiz şah olub qəsb etdi ürəkləri.
Sultanları məhv edib zaman aldı kamını,
Füzuliysə zamandan aldı intiqamını.
Ulduzlar baxışları, buludlarsa ahıdır,
Əbədidir şahlığı, o, könüllər şahıdır!

## “ŞİKAYƏTNAMƏ”

*Könlüm odu çıxdı yanə-yanə*
*Ahəngi-şəfəqtək asimanə.*

Qoyub qabağına “Leyli-Məcnunu”
Kərim min həvəslə oxuyur onu.
Məcnun! Füzulinin başqa adıdır,
O, böyük şairin öz fəryadıdır.
Hər beytin üstündə Kərim dayanır,
Yanan sətirlərdən od alıb yanır.
Düşünür, düşünür, o, dərin-dərin –
Bu böyük kitabla yanan şairin
Közərib qəlbindən söz, zahir olmuş,
Qanından rəng alıb cəvahir olmuş.
Ağladır göyləri, ağladır yeri
Böyük bir şairin şikayətləri:
“Bir dövrdəyəm ki, nəzm olub xar,
Əşar bulub kasadi-əsar...”
“Mənim bu dərdimi axı kim anlar,
Ah! Qədim əyyamlar, köhnə zamanlar,
Hanı qiymət qoyan şeirə, sənətə?
Zaman dara düşüb, insan möhnətə.
Bir qarın çörəyə qul olan insan,
Keçir öz eşqindən, arzularından.
Tökürəm kağıza ələmlərimi,
Büzülür yer-yerdən yüz dodaq mənə.
Gündüz şölə çəkən bir çıraq kimi
Qalır öz içimdən alışmaq mənə.
Açılmış cığırla mən yol getmədim,
Özgə qismətinə göz də dikmədim,
Ürək sındırmadım, qəlb incitmədim,
Paxıllar yüz yerdən çəkdi dağ mənə”.

* * *

Oyatdı yerindən Kərimi sözlər,
O qalxdı, gəzindi evdə bir qədər.
Düşündü halını şair dostunun,

Bəli, güzəranı pis keçir onun.
Neçin belə sakit oturmuşam mən?
Bəs bir şey gəlməzmi mənim əlimdən?
Kərim çox düşündü, qəmlər içində,
Parladı üzündə ümid şöləsi.
– Zamanın dolaşıq kəşməkeşində
Gərək boğulmasın şairin səsi! –
Deyə burmaladı şeşə bığını,
Geyərək əyninə arxalığını,
Fikirlər içində yola düzəldi,
Alçala-alçala saraya gəldi.
– Qoy mən əyilsəm də, o, əyilməsin,
Şairin üstünə saray gülməsin.
Gözünün altına aldı hər şeyi –
Sultanın önündə baş endirməyi,
Qulların önündə bir qul olmağı,
Alçaqlar önündə alçaldılmağı,
“Onun güzəranı pis keçir” – deyə,
O gəldi sultandan vəqf istəməyə.
Füzulinin bir səhər
Qapısını döydülər.
O özü çıxdı çölə,
Qayıtdı gülə-gülə.
Əlindəki kağıza zilləyərək gözünü,
Həyatında bəlkə də o, ilk dəfə özünü
Xoşbəxt sanırdı bu gün –
Kəsmət kəsmişdi sultan doqquz axca onunçün.
O, baxmaqdan doymayır əlindəki barata,
O, inana bilməyir, bu “böyük” mükafata.
Bu kağızla bərabər
O, zənn etdi bu səhər,
Od gəldi ocağına.
Su gəldi bulağına
Taqət gəldi qoluna,
İşıq düşdü yoluna.
Düşündü: “Sultanın mən
Yadına hardan görən

Düşmüşəm birdən-birə?
Bunu yazan əllərə
Afərin! Bir xəttə bax,
Hər nöqtəsi bir ulduz
Hər sətri bir çilçıraq".
Əfsus, bu fərəh də uzun sürmədi,
Şair bu kəsmətdən bəhər görmədi.
Neçə ay süründü idarələrdə,
Dinləyən olmadı onu heç yerdə.
Hey gedib-gəlməkdən o, yorulmadı.
Salamını belə alan olmadı.
Şair inadından dönmədi yenə,
Hökm etdi, güldülər onun hökmünə.
Dedi: – Gəlin, məni incitməyin siz.
Dedilər: – Gücsüzdür bu vəsiqəniz.
Dedi: – Sultan özü veribdir bunu.
Dedilər: – Bilirik nə olduğunu.
Dedi: – Axı vəqfi yemək vəbalıdır.
Dedilər: – Bilirik, bizə halaldır.
Dedi: – Neylərsiniz hesab çəksələr?
Dedilər: – Bir dodaq, bir də diş bilər.
Hesab çəkənləri razı salmışıq.
Şairin bir sözü qalmadı artıq,
Döndü birdəfəlik öz inadından,
Qayıtdı evinə o, kor-peşiman.
Yaman ağır gəldi bu, Füzuliyə,
"Sultan neçin məni aldatsın" – deyə.
Mən ki, ondan heç nə istəməmişdim,
"Az aşım, ağrımaz başım" – demişdim.
Bəs neçin o, məni oynatdı belə?
İsticə aşıma su qatdı belə?
Məni aldatmaqla o, nə qazandı,
Məni dilənçimi, ya qulmu sandı?
Çeynədi haqqımı o, hansı haqla,
Mənim mənliyimi o, tapdamaqla
Nə demək istəyir görəsən, Allah?
Şahid ol, şahid ol buna sən, Allah!

Şahların hörməti mənə bu oldu,
Mənliyim, vüqarım lağa qoyuldu.
Güldü şöhrətimə, güldü adıma.
Bu barat, şeirimə, istedadıma
Sultanın tənəsi, istehzasıdır,
Deyirlər: göylərə şeirim asidir.
Ah, asi olmuyum bəs neyləyim mən?
Bezməyib dünyanın işgəncəsinə,
Hər cövrə, cəfaya mən dayanmışam,
Şeirimdə özümü sultan sanmışam.
Mən "gör nə sultanəm..." dedim hər zaman,
Yəqin qəzəblənib şeirimə sultan,
Yerimi göstərmək istəmiş mənə.
Xeyr, mən şeirimlə sultanam yenə!..
Sözlərlə qızınır şair, sözləri
Könül atəşində döndərib oda,
Evi qızdırmağa payızdan bəri,
Onun ocağında odun yoxsa da.
Gəlmədi dilinə yalan, şairin –
Aldı el dərdindən odunu sözlər.
Atəşi qəlbindən alan şairin
Odu ürək oldu, odunu sözlər...
Əlində qələmi, ev boş, ev soyuq.
Bircə şam almağa tavanası yox.
O yazır şeirini Ay işığında,
Qızınır otaq da, qızınır can da.
O böyük sənətkar bilmədi ancaq,
Dilsiz əsrləri işıqladacaq
Ürək qanı ilə gecələr yarı
Qaranlıq otaqda yaratdıqları.
Kərim öz dostuna, məsləkdaşına
Yaxşılıq istədi, yamanlıq oldu.
Vurdu dizlərinə, vurdu başına,
Şairin sevinci bir anlıq oldu.
Sızlatdı qəlbini bu qəm, bu möhnət,
Dostunun yanında çəkdi xəcalət.
Şairsə əyləşib otağında tək

İşlədi gecələr bəzən sübhədək;
Yazdı bu baratın hekayətini,
Yazdı zəmanədən şikayətini.
Yazdı, cahan oldu bundan xəbərdar,
Sultanlar alçaldı, qalxdı sənətkar.
Verdi ədalətlə hökmünü zaman,
Dindirdi sözüylə zamanı şair.
Tək özü gülmüşdü şairə sultan,
Sultana güldürdü cahanı şair.

## BİR DƏSTƏ ÇİÇƏK

*Bülbüli-zarəm, deyil bihudə əfqan etdiyim,*
*Qalmışam nalan qəfəs qeydində, gülzar istərəm.*

Axşam şər qarışıb, qaş qaralanda
Şairin qapısı döyüldü birdən.
İlhama gəlmişdi şair bu anda
Yanar qəlbindəki döyüntülərdən.
Qapı vurğusunu heç eşidərmi
Qəlbin vurğusuna dalan sənətkar?
Çəməndə açılan lalələr kimi
Kağızın üstündə açır misralar.
Baş-başa verərək dərdi-qəmiylə,
Sənət göylərində üzür Füzuli.
Könül bağçasından öz qələmiylə
Al-əlvan çiçəklər üzür Füzuli.
Darvaza döyülür, döyülür bir də,
Şair xəyallarda, düşüncələrdə.
Həyat bir dəryadır, xəyalı yelkən,
Qaynayır ilhamı gur bulaq kimi.
Ayrılır Füzuli öz aləmindən
Ağacdan ayrılan bir budaq kimi.
Qəzəl qurtarmayır, çatmayır sona,
Qoyub qələmini davat qabına,
Çıxır darvazaya.

– Kimdir?
– Mənəm, mən.
O, açır qapını
– Füzuli, sənsən?
– Bəli, mənəm!
– Şükür, şükür Allaha.
Ürəkdə qalmadı nisgilim daha.
Sənin həsrətinlə gözlərim doldu.
Şükür ki, mənim də qismətim oldu
Səninlə, ey şair, üz-üzə durmaq –
Deyə, salavat da çevirdi qonaq.
Füzuli qonağı evə apardı.
Qonağın qəribə görkəmi vardı;
Əynində boz çuxa, belində kəmər,
Çuxanın üstündə gümüş düymələr.
Başında çal papaq, çiynində xurcun,
İldırım çaxırdı gözündə onun.
Yerli camaata oxşamır qonaq,
Doğmalıq tökülür üzündən, ancaq.
– İnan bu görüşlə, ey böyük insan,
Sən bu gün cənnəti satın almısan.
Vətəndən gəlmişəm, eloğlunam mən,
Salam gətirmişəm sənə Ərəşdən.
– Vətəndən? Gəldiyin yollara qurban,
Öpüm Vətən deyən dodaqlarından.
Deyə qonağını basdı bağrına,
Dünyanı verdilər elə bil ona.
Onu qucaqladı, elə bil, bu an
Vətənin boynuna qol saldı şair.
Onu qucaqlayan öz qollarıyla
Bağdaddan Vətənə yol saldı şair.
Başdan-ayağadək süzüb qonağı,
Üzündən, gözündən öpür, öpürdü.
Qonağın üzündə ana torpağı,
Qaynar gözlərində Göygölü gördü.
Kaman inləyirdi onun səsində,
Vətən həsrətiylə qəlbi doluydu.

Vətən elçisinin xoş nəfəsində,
Vətən güllərinin ətrini duydu.
Şair eloğluna baxır, baxırdı,
Onun duruşundan vüqar yağırdı.
Bu vüqar yaraşır vətən oğluna,
Bu vüqar Qoşqarı andırır ona.
– Zəvvaram, dedim ki, qoy əvvəlcə mən,
Gedim eloğlunun ziyarətinə.
– Bu kasıb komaya sən xoş gəlmisən,
Canım da, evim də qurbandır sənə.
İzin ver, əzizim, öpüm-öpüm mən,
O tozlu çuxanın ətəklərindən.
Ah!.. Vətən sevgisi, Vətən sevgisi,
Həsrət özümüzə qaytarır bizi.
Ömrünü qürbətdə keçirməyən kəs,
Bu hissin gücünü bəlkə də bilməz!
Zamanın tozları sirrini gizlər,
Bu qoca dünyanın, sirli həyatın.
Daşların üstündə açılan izlər
Ayaq izləridir bəlkə Qıratın.
Demə ki, sevirəm mən vətənimi,
Çox azdır "Vətəni sevirəm" – demək.
Vətənin yolunda babalar kimi,
Canını, qanını verəsən gərək.
Yedirir, içirir, geydirir bizi,
Bizə həyat verir bu ana torpaq.
Dünyaya nə üçün gəldiyimizi
Bizsə düşünmürük, bilmirik, ancaq
Yurdu özümüzə borclu da sanır,
Onu düşünmürük yalnız bir kərə.
Vətənin qışından bəzən usanır,
Yayından qaçırıq yaylaq yerlərə.
Elə ki, vətəndən ayrılırıq biz,
Vətənçin qışqırır ürəklərimiz.
– Danış, ay eloğlu, danış vətəndən,
Danış sözlərinlə qanadlanım mən.
Uçum görmədiyim dağlara sarı,

Dolansın boynuma Vətən yolları.
Anamın taxdığı həmayil kimi.
Həsrət “nun” eylədi “əlif” qəddimi1
Danış, şirin-şirin, dilinə qurban,
Danış, camaatın güzəranından.
Budur, asta-asta danışır qonaq –
Elə bil yel əsir Muğan düzündə.
Çinar xışıldayır, səslənir qovaq,
Ulduzlar sayrışır göyün üzündə.
Təmkinlə, ürəklə danışır qonaq,
Canlanır xəyalda o ana torpaq,
Şairin gözünə görünür Muğan.
Xəzərin sinəsi qalxıb – enirdi.
Qonaq cani-dildən danışdığı an
Araz hayqırırdı, Kür səslənirdi.
Vətən duyğu kimi könüldən keçir,
O, Muğandan keçir, o, Mildən keçir.
Gəlir qulağına bayaqdan bəri
Ceyranın, cüyürün ayaq səsləri.
Samux meşəsində alaçıq qurur,
Sərin “Qırxbulaqdan” o, cam doldurur.
Çoban dəyəsində qonaq da qalır,
Bu qəlbi dağlardan əzəmət alır.
Yeyir ləzzət ilə çoban dürməyi.
Könülə dağ çəkir köks ötürməyi.
Necə də xoş gəlir bu anlar ona,
Sinəsi xəzinə ozanlar ona
Babəkdən danışır, Bamsıdan deyir,
Zurna haray çəkir, tütək inləyir.
Arzular səyriyir şair gözündə,
Qoltuğunda “Xəmsə” Şeyx düzündə
Nizami qəbrinə o, baş endirir,
On ikinci əsrə o, salam verir.
Şirin söhbətini çatdırıb sona,
Qonaq əl uzadır dolu xurcuna.
– Vətəndən, ey şair, sənə hədiyyə
Bunu gətirmişəm, bax, bunu – deyə

Şairə bir dəstə gül-çiçək verir,
Güllərin ətriylə çəkib gətirir
İraq ölkəsinə Azərbaycanı.
(Vətən həsrətindən böyük dərd hanı?)
Şair çiçəkləri basır bağrına,
Nələr pıçıldamır çiçəklər ona?!
İyləyir gülləri o, yavaş-yavaş
Qəlbə hücum çəkir qüssələr yenə.
Şairin gözündən iki damla yaş
Düşür çiçəklərin üsküklərinə.
Çiçəklər su içib göz yaşlarından,
Sanki cana gəldi, dirçəldi yenə
Can gəldi şairin baxışlarından
Vətənin qurumuş çiçəklərinə.
Baxdı hədiyyəyə o, yana-yana,
Gözləri önündən nələr ötüşdü.
Şair çiçəkləri qoyub güldana,
Dedi: – Bir əfsanə yadıma düşdü:
Deyirlər, keçmişdə bir qoca Loğman
İnciyib yurdunun hökmdarından,
Bir daha vətənə dönmərəm deyə,
Gedir yad ölkəyə, uzaq ölkəyə.
İllər ötüb keçir... Dəyişir ruzgar,
O, elin rəyincə fərmanlar verir,
Loğmanın dalınca elçi göndərir,
Deyir: Vətən onu gözləyir hər an,
Qürbətə qapanıb qayıtmır Loğman,
Məktub da göndərir hökmdar ona,
Çağırır Loğmanı ana yurduna.
Yazır: Qulluğunda hazıram sənin,
Yolunu gözləyir ana vətənin.
Məktubla bərabər neçə min dinar,
Qızıl da göndərir ona hökmdar.
Şahın xələtləri, hədiyyələri,
Gəldiyi kimi də qayıdır geri.
Loğmansa Vətənə qayıtmır yenə,
Deyir: – Üz tutmaram bir də vətənə.

Hökmdar düşünür, düşünür hər gün;
Loğmanı Vətənə qaytarmaq üçün
Çarələr axtarır, tapa bilməyir,
Loğman "İnadımdan dönmərəm!" – deyir.
Ölkəyə səs düşür, bir gün bir çoban
Gəlib hökmdara deyir: – Sən dayan,
Loğmanı vətənə mən gətirdərəm.
– Necə?
– Bunu sorma, qibleyi-aləm!
Ancaq sən bir qədər rüsxət ver mənə
Loğmanı qaytarram öz vətəninə.
Bircə ay keçməmiş bu əhvalatdan
Bir gecə qayıdır vətənə Loğman.
Şah bunu bilincə qaralır qanı,
Çağırır saraya dərhal Loğmanı.
Deyir: Bu nə işdir, ey böyük insan,
Sən üstünmü tutdun çobanı şahdan?
Saymadın, məhəl də qoymadın mənə,
Çobanın sözüylə gəldin vətənə.
Ey Loğman, bu sirri, gəl, mənə anlat...
Əlini cibinə salıb, o saat
Bir yovşan çıxarır Loğman cibindən,
Deyir: Vədələrə gəlməmişəm mən,
Bax, bunun ətrinə gəldim vətənə,
Bəxşişlər, ənamlar nə gərək mənə!
Ancaq, düz düşünmüş, o yoxsul çoban
Mənə torba-torba pul göndərməmiş;
O, yaxşı bilir ki, bu qoca Loğman
Dünyanın malına könül verməmiş,
O mənə göndərdi, bax, bu yovşanı,
Torpağın ətriylə dolu yovşanı.
İyləyib mən onu birtəhər oldum,
Bilmədim şad oldum, mükəddər oldum.
Dumanlandı gözüm, hərləndi başım,
Yovşanın üstünə axdı göz yaşım.
Sızladı ürəyim, əsdi bədənim,
Durdu göz önümdə bu dağlar mənim.

Bir anın içində illər ötüşdü,
Şıltaq uşaqlığım yadıma düşdü.
Bülbüllü meşələr, sonalı göllər,
Kəklikli qayalar, yoncalı çöllər.
Reyhanlı, yarpızlı şır-şır bulaqlar,
Başı ağ çalmalı bu qəlbi dağlar,
Çiçəkli güneylər, qarlı quzeylər
Gördüm "gəl-gəl" deyə mənə əl eylər.
Yalnız bax bu səsə mən qulaq asdım,
Yovşanı öpərək bağrıma basdım.
Deməröm, qürbətdə şad olmuşam mən,
Axı bu torpaqda doğulmuşam mən.
Vətən həsrətiylə külə dönmüşəm,
Qəlbən ağlasam da, şad görünmüşəm.
Torpağa bağlıdır, torpağa insan,
İnsana hər şeydən torpaq əzəldir.
O qərib ellərin od-ocağından
Vətənin tüstüsü daha gözəldir.
Ənama, xələtə uymamışam mən,
Bu dağdan getmişdim, bu dağa gəldim.
Uzağa uçmuşdum ovçu əlindən,
Təzədən qayıdıb budağa gəldim.
Uzaqkən dünyanın dərdi-sərindən,
Qürbətdə hər dərdi duydum dərindən.
Ana torpağımın çiçəklərindən
Qoparıb döşümə taxmağa gəldim.
Bir yovşan ətriylə murada çatdım,
Vətənim "gəl" dedi, qürbəti atdım.
Gəzdim bu çölləri mən addım-addım,
Ayaq izlərimə baxmağa gəldim...
Füzuli qurtarıb hekayətini
Deyir: – Ay eloğlu, ağlatdın məni.
Sən öz hədiyyənlə – çiçəklərinlə,
Dinlə, ürəyimdən keçəni dinlə.
Mənim də bir töhfəm, bir bəxşişim var,
Apar, divanımı vətənə apar.
Bu dərd ağır gəlir, çox ağır mən –

Mənim də vətəndə görünür yerim;
Nə deyim taleyə... ana vətənə
Qoy özümdən əvvəl getsin sözlərim.
“Can sözdür, əgər bilirsə insan,
Sözdür ki, deyirlər özgədir can...”

## KƏRBƏLA SƏFƏRİ

*Fəqr imiş fəqr, Füzuli şərəfi-əhli vücud,*
*Özünə eyləmə həmdəm füqəradan qeyri.*

Ötdü aylar, fəsillər;
İllər, qanadlı illər
Şairin komasında
Görün nələr yaratdı.
O, sənət aləmində,
Hələ heç görünməmiş,
Möcüzələr yaratdı.
Onun şeir odundan
Yandı bağrı yerin də.
Doğdu yeni bir günəş
Sənət üfüqlərində.
Bir balaca komanın,
Dünyalara sığmayan,
Dünya qədər sirri var.
Bu balaca komada
Qələmin çıxardığı
Xoş, həzin xışıltılar
Səs saldı dünyalara,
Ağlatdı göyü, yeri.
Çıxıb dağlı ürəkdən
Dağladı ürəkləri.
Ay kimi Füzuli də
İşıqlatdı hər yeri.
Ancaq qəlbində qaldı
Öz dərdi, öz kədəri.
Ay da bütün cahana

İşıq salır, nur yayır,
Ləkələri yenə də
Sinəsində saxlayır.
Hamı dedi: görəsən,
Bu böyük sənətkarın
Ustadı kim olubdur?
Bəlkə anadan belə
O, şair doğulubdur?
Yox, yox! Onun ustadı
Sonsuz dərdi, qəmidir,
O, kədər aləmidir,
O, kədər aləmidir.
O, bütün insanlığın
Şərəfidir, şanıdır,
O, göylərin şimşəyi,
Yerlərin üsyanıdır.
İldırımın çaxışı,
Bir ahunun baxışı,
Göyün dumanı, sisi,
Ruzgarın iniltisi,
Bir körpənin şənliyi,
Göylərin ənginliyi,
Bir yetimin naləsi,
Könüllərin ah səsi,
Arzusu, şikayəti,
Babaların hikməti,
Düşünsək dərin-dərin
Ustadıdır şairin...
Onun hər sətirində
Torpağın öz səsi var,
Dünya görmüş bir elin
Dərdi, faciəsi var.
Ürəyindən od alıb
Qızdı soyuq kəlmələr.
O hər qəzəli üstdə
Gecələr sübhə qədər
Əritdi öz canını,

Önündəki şam kimi,
Açıldı səhər kimi,
Tutuldu axşam kimi.
Aylar, illər ötüşdü,
Ömrünün hər gününə
Bir şeir incisi düşdü.
Zamanın dalğaları
Gah qalxdı, gah da endi.
Sənətin yollarında
Füzulinin başına
Ağ çiçəklər ələndi.
Şükr eyləyib həyatda
Çoxa-aza Füzuli, –
Qocaldı, dərdlərini
Yaza-yaza Füzuli.
Oldu illər yorğunu,
Şeir, sənət yormadı,
Zəmanə yordu onu.
Dedi: – Mənim qeydimə
Bu yerdə bir qalan yox.
"Rüşvət deyildir deyə
Salamımı alan yox".
Aylar, illər ötüşdü,
Doğulduğu Kərbəla
Bir gün yadına düşdü.
– Uşaqlıq, ay uşaqlıq,
Sən bir çiçəkli yazdın,
Uzaqdın hər qayğıdan,
Sən kədər tanımazdın.
O illərmiş ömrümün
Ən fərəhli illəri.
Bu həyatı, varlığı
Mən dərk edəndən bəri
Üzüm bir an gülmədi.
Bəzən güldüm, üzümə
Ancaq zaman gülmədi.
Zaman, mənə verdiyin-

Elin dərdi-səridir;
Alnımın qırışığı,
Saçlarımın ağlığı,
Qəlbimin kədəridir.

Zaman, məndən aldığın –
Uşaqlığım, gəncliyim,
Rahatlığım, dincliyim,
Mənim azadlığımdır;
Sevincim, şadlığımdır.
Kərbəlanın yolları karvanlarla doludur,
Bu yol neçə yüz ildir "müqəddəslər" yoludur.
Bircə içim suya da burda həsrətdir insan,
Yollar cadar-cadardır, zəvvarların ahından.
Əsən səmum yeli də onların ah-vayıdır.
Bu yolla gəlib-gedən "şərəf" alıb qayıdır
Nəcəfdən, Kərbəladan.
Aldadır öz-özünü bu yollarda müsəlman.
O, elə zənn edir ki, onun bu ziyarəti,
Satın alır cənnəti.
Zənn edir ki, saxlayıb imamların yasını,
Qazanır bu dünyada o biri dünyasını.

Dodağında qəzəli: "Dərd çox... Tale zəbun..."
Məhəmməd Füzuli də yolçusudur bu yolun.
Qafilədən kənarda o, tək gedir, tək gedir.
Bu yolların dərdini ürəyinə həkk edir.
Füzuli də könlünü imamlara verdimi?!
Xeyr! Zəvvarlar kimi
Füzuli getmir ancaq şərəfçün Kərbəlaya,
Özü şərəf aparır o, bu gün Kərbəlaya.
Baş çatlayır istidən... Göydən yerə od yağır.
Dəvələr də təngiyib yeriyir ağır-ağır.
Karvan gedir, yol boyu uzanıb qatar-qatar.
Yeridikcə dəvələr, səslənən zınqırovlar,
Əruzun ahəngini xatırladır şairə...
Xəyalında düzülür kəlmələr sətirlərə:

“Mənəm ki, ğafiləsalari-karivani-ğəməm.
Müsafiri-rəhi-səhrayi möhnətü ələməm.
Həqir baxma mənə, kimsədən sakınma, kəməm,
Fəqiri-padişahasa, gədayi-möhtəşəməm...”

Birdən yağış başladı, hərə qaçdı bir yana,
Bir budaq da tapılmır adamlar daldalana.
Sular qalxıb-enirdi, sular aşıb-daşırdı,
Bu vaxt şair bir kiçik kəndə yaxınlaşırdı.
Yaman qaraldı qanı,
Şairin üzündəki o kədər tozlarını
Yağan o gur yağış da silə bilmədi fəqət
Onun kədərlərinə dəm tutmuşdu təbiət.
Təbiət də elə bil bu dəm ona ağladı,
Füzulinin dərdinə, qəminə yas saxladı.
Onun ağ saqqalından damcılar süzülürdü.
Elə bu vaxt qarşıda bir böyük qəsr gördü.
Darvazaya sığındı, yox, yağış kəsilmədi –
Şair gedə bilmədi.
Birdən açıldı qəsrin pəncərəsi...
Bu zaman
Bir səs gəldi:
– Ey qoca, qapıda nə durmusan?
İçəriyə gəlsənə.
– Sağ olun!
O kəs yenə
Əl çəkmədi.
– Buyurun, sizə qurbandır varım,
Allahın qonağına açıqdır qapılarım.
Ev sahibi hərlənib özü gəldi:
– Gəl bəri!
Füzulinin qolundan çəkib saldı içəri.
Onlar qəsrə girdilər,
O dincəldi... Şairə nahar da gətirdilər,
Bütün nahar dəstgahı qızıl qablarda gəldi,
Qızıl piyalələrdə ləzzətli mey verildi.
Cariyələr, nökərlər düşdülər əl-ayağa,

Hərəsi bir tərəfdən qulluq etdi qonağa.
Qəsr zinət içində pırıl-pırıl yanırdı.
Elə bil hər divardan bir Günəş boylanırdı.
Tavanda çil-çıraqlar, döşəmədə xalçalar,
Qəsrdəki zinətə şahlar belə əl çalar.
Ev sahibi qonaqdan sordu:
– Kimsən, nəçisən?
– Adi müsafirəm mən.
– Çox gözəl, ey müsafir, əntiqbazam mən düzü,
Nadir şeylər yayınmaz mənim gözümdən düzü.
Gedək, sənə göstərim qiymətli şeylərimi.
Qoruyuram onları gözüm, bəbəyim kimi.
Onlar durub keçdilər bir bəzəkli otağa,
Ev sahibi gözaltı nəzər salıb qonağa
Dedi: – Qonaq, yaxşı bax burdakı daş-qaşlara.
O, bir üzük götürüb şüşə rəfdən bu ara,
Dedi: – Bax, bu üzüyün qaşına, yaxşı bax, sən,
Şahın da barmağında olammaz bu üzükdən.
Qiyməti min dinardır,
Belə nadir bir inci,
De, harda, kimdə vardır?
Füzuli göz ucuyla baxıb qaytarır yenə
Üzüyü sahibinə.
– İndi bax, bu qılınca, yaxına gəl, yaxşı bax.
Dəstəyinin bir daşı mincə dinardır ancaq.
Füzuli qılınca da baxaraq saymazyana,
Qaytarır sahibinə.
Kişi pərt olur yenə:
– İndi də diqqət elə bu şətrəncə[1], müsafir,
Özü fil sümüyündən, daşları incidəndir,
Bir daşını inan ki, yüz dinara verməərəm.
Bunları sultana da, şaha da göstərmərəm.
Cildi qızıl suyuna çəkilmiş bir divanı
O, göstərir şairə.
Əntiqfüruş – Belə bir kitab hanı?
Cildindəki qızılın min dinar qiyməti var.
İçindəki rəsmlər ağılı heyran qoyar.

Füzuli – Kiminkidir bu divan?
Əntiqfüruş – Kişi, insafın olsun, özün indi hardasan?
Füzuli – Sənin evindəyəm mən.
Əntiqfüruş – Demək, onda kitab da mənimdir.
Füzuli – Səhv edirsən!
Bunun cildi sənindir,
İçindəki duyğular, yəqin ki, özgənindir.
Əntiqfüruş – Aha, indi anladım, ey müsafir, haqlısan!
Mövlana Füzulinin divanıdır bu divan!
Füzuli – Onu çoxmu sevirsən?
Əntiqfüruş – Oxumaq bilmirəm mən!
Ev sahibi cürbəcür əyləncələr, bəzəklər,
Xara şallar, ipəklər,
Kəlağaylar göstərir müsafirə dalbadal,
Qucağında gəzdirir şairisə min xəyal.
Ev sahibi görür ki, öz qəlbinə dalaraq,
Onun dediklərinə fikir vermir heç qonaq.
Əntiqfüruş – Sən ey, naməlum insan, sənə bir sualım var.
Göstərdiyim şeylərə şah özü heyran qalar.
Bu daş-qaşlar, bu süslər
Sənə bir zərrə qədər
Əsər etmədi ancaq,
Səndəki daş qəlbə bax.
Bəlkə, bəlkə, ey insan,
Sən məndən də varlısan?
Füzuli – Xeyr, mən çox yoxsulam.
Əntiqfüruş – Elə isə, bəs neçin,
Baxırkən bu şeylərə
Qamaşmadı gözlərin?
Füzuli – Üzü dönük dünyada
Çox şeylər gördüyümdən,
Axır kor olmuşam mən.
Mən bu qoca dünyada dərd satıb, qəm yeyirəm,
Odur, belə şeyləri mən görə bilməyirəm.
Sən daş-qaş göstərirsən mənə, söylə, ürəyin
Daş deyilmi bəs sənin?
Qanlı göz yaşlarıyla ömrü ötüb gecənin,

Gözündə bir quruşa dəyərmi üzük qaşı?
Mənə daş göstərmə sən, göstər isti göz yaşı!
Yoxsul dolansam da mən, vüqarım əyilməmiş,
Məni dünya süsləri heyran edə bilməmiş.
Zinətə çox vurulma, zinət dünya malıdır,
İnsan özü dünyanın zinəti olmalıdır.
Bir də... Düzünü bilsən əşyanı görmürəm mən.
Bütün bu zinətlərin arxasında gizlənən
Böyük hadisələri, mənaları görürəm.
Mənalar aləmində mən ki ömür sürürəm.
Bax bu üzük, yəqin ki, vaxtilə bir gözəlin
Barmağında parlayıb... Hanı indi o gəlin?
Bəlkə onun ürəyi artıq çoxdan dayanmış,
Ondan sonra bu üzük neçə barmaqda yanmış?
Bunu satan o bədbəxt neçin satmış görəsən?
Bu üzüyü alanda düşündünmü bunu sən?
Bu üzüklə neçə toy, neçə büsat qurulmuş?
Ah! Bu üzük kimlərin nişan üzüyü olmuş?
Görəsən hardan gəlib düşmüş sənin qəsrinə?
Bəlkə mənim sözlərim qəribə gəlir sənə?
Bax, bu qılınc... bu yaraq kimə töhfə verilmiş?
Bu, hansı bədbəxtlərin köksünə endirilmiş?
Bu qılıncın ustası
    Görəsən nə gözləmiş?
    Öz çirkin əməlindən,
Bunu düşünürəm mən.
Özünü məhv etməyə silah yaratmış insan...
Bəlkə də bu qılıncdır İbrahimi doğrayan?
Çaldıranda parlamış bəlkə birinci kərə,
Qan çiləmiş bu qılınc dərələrə, düzlərə?
Bəli, düzünü bilsən, əşyanı görmürəm mən,
Bütün bu zinətlərin arxasında gizlənən
Hikmətləri görürəm, mənaları görürəm.
Mənalar aləmində mən ki, ömür sürürəm.
Füzuli divanını qızıla tutdurmusan,
Həşyəsinə, cildinə min cür bəzək vurmusan.
Sənin fikrincə, ey dost, şeir, sənət heç nədir,

Bu kitabın qiyməti bəzək-düzəyindədir.
İndi görək şairin özü nə deyir – deyə
Başladı asta-asta divanı çevirməyə,
Tapıb axtardığını o, oxudu ucadan.
(Ev sahibi süzürdü qonağı heyran-heyran.)
"Çox təxafür qılma, cəmi mal ilə, ey xacə kim,
Simu-zər cəmiyyəti, əhli-qürur eylər səni.
Barigahi qürbdən, cəmiyyəti-malu mənal,
Hər nə miqdar olsa ol miqdar dur eylər səni".
– Kifayətdir, ey qoca, kifayətdir! – deyərək,
Ev sahibi qışqırır... Bir dəyirman daşıtək
Ev başına dolanır, o, itirir özünü,
Öyündüyü şeylərə zilləyərək gözünü,
Düşünür... Kəsik əllər, kəsik başlar bir anda
Fəryad edir, səslənir onun qulaqlarında.
Bu qılıncla doğranan kamsız ölən cavanlar,
Dilə gəlib elə bil deyir: "Sənə sözüm var,
Bizi neçin yığmısan, bura, tez ol, cavab ver?"
Bu daş-qaşlar, qılınclar qocaya hücum çəkir.
Kamsız gedən ürəklər,
Üzüklərin qaşında yanan arzu, diləklər
Məlul-məlul boylanıb, qan ağlayır elə bil.
Üzüklərin qaşları
    İnsan baxışlarıdır,
    Bunlar soyuq daş deyil.
Dəhşət alır qocanı. Basır onu soyuq tər.
Bütün bu cahi-cəlal, bu daşlar, bu bəzəklər
Özü öz ayağıyla toplanmamış bu qəsrə.
O, qabıqdan çıxıbdır hər biriyçün min kərə.
Min fırıldaq, min hiylə, min iftira, min yalan.
Burdakı zinətlərin asılıb qulağından.
O, bunları düşünür, o, bunları düşünür.
Gözündə heçə dönür
Min hiylə hesabına topladığı bu şeylər,
Düşür onun gözündən bu zinətlər bir anda,
Qulağında səslənir bu şeyləri alanda
Eşitdiyi nalələr, şikayətlər, gileylər.

Təzə görürmüş kimi
    Heyrətlə seyr eləyir
    O solunu, sağını.
Təəccüblə, diqqətlə süzür öz qonağını.
O, ərinə-ərinə
Gözlərini zilləyir qonağın gözlərinə.
Bu gözlərdə o görür hər xilqətin sirrini –
Göyün, yerin sirrini, təbiətin sirrini.
Yox, yox, görmür, o duyur.
Bu gözlərdə oxuyur:
Bir ürəyin dünyadan sonsuz təmənnasını,
İnsanın ilk eşqini, həyatın mənasını;
Səslənir qulağında hikmət dolu sətirlər,
Bu gözlərdə oxuyur başdan-ayağa qədər
Oxuya bilmədiyi Füzuli divanını.
Səksənir, bir üşütmə tutur onun canını.
Birdən o, xəbər alır:
– Deyin, adınız nədir?
– Məhəmməd!
– Sənətiniz?
– Şairəm.
– Şair, şair!
Aman Allah, işə bax!
Füzulisən yoxsa sən?
Sükut...
– Sən gərdişə bax!
Dayan, deyə o keçdi yan otağa...
    Bir azdan
Əlində bir medalyon o, qayıtdı.
– Ah!.. Aman!
Medalyonu görüncə şair dondu yerində,
Tərpənə də bilmədi, o uçundu yerində.
Bu, cavan Məhəmmədin
    Bu dünyada yeganə
    Dövlətiydi, varıydı.
Leylaya bəxş etdiyi ana yadigarıydı.
– Söylə, bu sənə hardan?

Mənim Leylam sağmıdır?
O, bu qərib diyarda yenə də dustaqmıdır?
– Səbr eləyin, – deyərək, o açdı medalyonu,
Şair gəldi dəhşətə,
sarsıtdı heyrət onu.
Medalyonun içindən Füzuli boylanırdı.
Onun şair gözləri məşəl kimi yanırdı.
Əntiqfüruş – Bir bura bax, bura bax,
Bu dalğın gözlərə bax, bu qövsi qaşlara bax,
Adam da öz şəklinə oxşayarmış bu qədər?!
Zillənir şəklə gözlər:
...Başında göy araxçın, duruşunda əzəmət,
Üzündə qəm izləri, gözlərində məhəbbət.
Məhəbbət, bu məhəbbət toplamış yığın-yığın
Bir şairin qəlbinə dərdini insanlığın.
O, bu dərdi, möhnəti özünə dərd sanmamış
Əzablara yar olmuş, əzabdan usanmamış.
Dodağında eşqinin həzin iniltisi var,
Başında bu möhnətin dumanı var, sisi var.
Baxıb məchul nöqtəyə o düşünür dərindən,
Arzuların şöləsi süzülür gözlərindən.
Nələr keçir şairin xəyalından bu anda,
Onun o düyümlənən müqəvvəs qaşlarında
Ağsaçlı qoca Şərqin dərdi yatır elə bil.
Alnındakı qırışlar adicə qırış deyil,
Öz xalqının keçdiyi iztirab yollarıdır!
Gözdən axan incilər dövlətidir, varıdır.
Quşqonmaz zirvələri andırır bu halında,
Göz yaşı həlqələnmiş elə bil saqqalında
Vətən qayalarının üzündə kölgəsi var,
Onun qulaqlarında "Vətən", "Vətən" – səsi var.
Bir gözüylə gülürsə, bir gözüylə ağlayır,
Elə bil qollarıyla dünyanı qucaqlayır.
Dünyanın ağır yükü toplanaraq bir yerə
Yüklənibdir elə bil həmin bu çiyinlərə.
Nakam məhəbbətinin üzündə kölgəsi var,
Onun qulaqlarında "Vətən", "Vətən" – səsi var.

– Bu mənim əksimdir, ah!
Bunu kim çəkmiş görən?
– Bunu satan uşaqdan soruşmuşdum onda mən.
O dedi ki, bu şəkli anam çəkmiş.
– Bəs hanı?
O sağdırmı?
– Yox, ölmüş...
Elə bil ki, dünyanı,
Tərpətdilər yerindən –
O, ah çəkdi dərindən.
Bu ahdan göy tutuldu, yel əsdi, yer titrədi.
Qara geydi bağçalar, gül-çiçəklər titrədi.
– Alovlardan insanı keçirir yalnız ümid.
Düz qırx il ürəyimdə yaşatdığım bir ümid
Quş olub uçdu getdi bircə anın içində;
Söndü ümid ulduzum kəhkəşanın içində.
Bəs hardadır o uşaq?
– Bu yaxın kənddəndir o.
– Adı?
– Adı Fəzlidir.
– Taleyin qurğusunu dərk eyləmək çətindir.
Ya rəbbim, işə bax bir!
Leyla iraq olsa da, qırx il mənim gözümdən.
Övladının adını almış təxəllüsümdən.
Sən bir təsadüfə bax,
Mən də Fəzli qoymuşam öz oğlumun adını;
Adıma oxşadaraq...
Ah!.. O, mənim şəklimi necə çəkmiş görəsən?
Bu sirri, bu möcüzü anlaya bilmirəm mən.
O ki məni görməmiş axı o vaxtdan bəri.
Necə də yerindədir üzümün cizgiləri.
Bəli, yenə məhəbbət!.. Məhəbbət dada çatmış,
Məhəbbətin gücüylə xəyalında yaratmış
O mənim surətimi,
Bu gün olduğum kimi.
Məzarıstan...
Dəhşətlidir bu ölülər ölkəsi.

Qaş qaralır əyri-üyrü daşların sıx kölgəsi.
Qəbirlərin üstü ilə sürünür ilan kimi
Burda illər, qərinələr ötüşür bir an kimi,
Gün döndükcə bir qəriblik çulğalayır hər yeri.
Sivri məzar daşlarının uzanan kölgələri
Dolandıqca hey dolanır qəbirlərin başına.
                    Burda zaman əsər etmir
                    Bir zaman insan olan –
Bu daşların yaşına.
Bu kölgələr... Bu kölgələr bir röyamı,
                              yuxumu?
Ölülərin xəyalımı, ruhumu?
Bir əbədi suallardır bu, əbədi sükunət:
“Hardan gəlib, hara gedir əzəl gündən bu xilqət?”
Bir məzarın başı üstdə dayanmışdır üç nəfər,
Bu pərişan, uçuq qəbrə zillənibdir nəzərlər.
Yatır burda Füzulinin məhəbbəti, sevgisi,
Yatır burda bir ürəyin əbədi hicran səsi,
Yatır burda dodaqlarda nəğmə olan bir dilək,
Yatır burda əsrlərə haray salan bir dilək.
Qoca şair əllərini çarpazlayıb dayanmış,
Altmış illik ömrü onun elə bil ki, bir anmış.
Yaşadığı aylar, illər göz yaşına dönərək
Axdı onun gözlərindən bir andaca incitək.
İlk gənclikdən o, dağlandı, dağ gətirdi yüz dağı.
Qadir eşqin, məhəbbətin əli ilə yazdığı
Həsrət, hicran kitabı –
Bütün dərdi, əzabı
Varaqlandı gözündə,
Tamamlandı bu gündə.
Gözlərindən axan yaş
Düşdü qəbir daşına;
Dəlik-dəlik oldu daş.
Gözlərindən axan yaş
Onun hicran kitabına nöqtə qoydu, qapandı.
Sevənlərə timsal oldu bu eşqin ilk, son andı!
Kölgə düşür üzlərə.

Leyla ilə son kərə
Vidalaşır Füzuli,
Öpür qəbir daşını.
Küləklərmi qurudur
Gözlərinin yaşını?
Yollar, izlər qaralır,
Qəbristanlıq boş qalır.
Onlar gedir, arxadan
Bir səs gəlir bu zaman,
O, nə deyir? Bəlkə də o, ruhudur Leylanın?
Füzulini səsləyir, işinə bax dünyanın.
Şair dönür arxaya, qəbirlərə baş əyir,
Ayaqları getsə də, qəlbi gedə bilməyir.
Əntiqfüruş yapışıb qonağının qolundan,
Qonaq gedir fikirli hey pərişan-pərişan.
Qoca bu vaxt çıxarıb medalyonu cibindən:
– Oğul, bunu sənə mən
Bağışlayıram, – deyə,
Verir onu Fəzliyə.

## TAUN

*Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən*
*Ki, məlum ola dərd əhlinə qəbrim ol əlamətdən...*

Müqəddəs Kərbəlaya bəla gəldi, bir bəla.
Bir həftədə qocalıb əldən düşdü Kərbəla.
Taun gəldi, nə gəldi, bu bəlanı, bu dərdi,
İlahinin özümü bu diyara göndərdi?
Qiyamətdir bəlkə bu? Çatıb dünyanın sonu?
İlahinin özümü müqəddəslər yurdunu
Belə çapdı, taladı, onun qara nəfəsi
Dilsiz daşa çevirdi toxunduğu hər kəsi.
Bir dirilik qoymadı bir həftədə ölkədə,
Bu, göylərin yerlərə qəzəbiydi bəlkə də.
Bəlkə də Kərbəladan "şərəf" alıb ucalan,

Hörməti satın alan
Vicdan tacirlərinin əməliydi bu bəla?
Oldu ölüm yatağı bu müqəddəs Kərbəla!
Küçələri, evləri taun gəzir birbəbir,
Bir qara kabus kimi o, hər yerə baş çəkir.
Obalardan-obaya, eldən-elə keçir o.
Hər gözünə dəyəni oraq kimi biçir o.
Bu yerdə taun oldu yerin, göyün hakimi,
Göydə uçan quşu da vurdu ildırım kimi.
Quruyur gur çeşmələr, quruyur axar sular,
Yataqlarda mələşir yetim qalan quzular.
Təpələrdə böyürür sağılmamış inəklər,
Solur bağda ağaclar, bağçalarda çiçəklər.
Taun sarır çölləri bir qara bulud kimi,
Gedə-gedə adamlar səpələnir tut kimi.
Baxın can verənlərin donuq baxışlarına,
Ulu ziyarətgahın o dilsiz daşlarına
Üzünü sürtüb ondan nicat istəyir onlar –
Laxta-laxta qan qusur tauna tutulanlar.
Zəvvarlara ölümdən bu yer ərməğan verir,
Şərəf üçün gələnlər "şərəf" alıb can verir.

Bir daxmanın önündə topa-topa adamlar;
Onlar durub baxışır gözlərində sual var:
Şair yatır xəstədir,
Deyirlər can üstədir.
Əsmə, külək, ötmə, quş, qanad saxla, amandır.
Hardan gəldi bu andır,
Bu taun, bu zəhrimar?
Hər baxışda sual var:
– Görən şair necədir?..
Qayalarda səslənən küləklər də inləyir,
Göy də, yer də inləyir.
İnləyir həzin-həzin,
Elə bil xəbər alır halını Füzulinin.
Pıçıldaşan yarpaqlar sorur biri-birindən:
– Şair necədir görən?

Onun halı yamandır,
Əsmə külək, ötmə quş, qanad saxla amandır.
İnsafınız bəs hanı?
Şeiriylə milyonları yuxudan qaldıranı,
Yuxudan eyləməyin;
Bu balaca daxmanın qarşısında baş əyin!
Sənin gücün, ey taun, neyləyəcək şairə?
Zəhmət çəkmə boş yerə!
O, ölümü öldürüb sənətiylə, sözüylə,
O, bir cahan gətirib bu cahanda özüylə...
Leylaya çatmasa da, o, çoxdan kama çatmış,
Axan göz yaşlarıyla o, bir çeşmə yaratmış,
Ona "eşqin çeşməsi" dedi bütün ozanlar.
O çeşmədən su içən, bu dünyanı tez anlar.
Şair yatır, amandır,
Onun halı yamandır.
Onun ömrü əbədi,
Taununku bir andır.
Daxmanın qabağında topa-topa adamlar...
Hər gözdə bir sual var.
Yaman baha oturdu taun bu bədbəxt elə,
Onun dəhşətlərini yazmaq üçün də belə
Füzuli sözü gərək, Füzuli şeiri gərək!
Hanı elə bir hünər, hanı elə bir ürək?..
Taun yüz-yüz insanı bir gündə verdi bada.
Taunun dəhşətləri hamını sarsıtsa da,
Şairin daxmasından əl çəkməyir bir nəfər,
İçəriyə zillənib sual dolu nəzərlər.
Hamı dikib gözünü ağ çalmalı həkimə,
Həkim xəcalətindən baxa bilmir heç kimə.
O, nə desin, nə desin?
Necə çarə eyləsin
Bu çarəsiz xəstəyə?
Güman gəlmir bir şeyə –
Onun gücü zəifdir xəstəliyin gücündən,
Onun yanaqlarına axır göz yaşı dən-dən.

Elə bu vaxt daxmadan yanıqlı bir səs gəlir,
Hamı, hamı heyrətlə səsə tərəf çevrilir:
– Mən indi o dünyaya uçacağam quş kimi,
Həkim, sənin yerinə qoy mən deyim dərdimi:
“Eşqdən canımda bir pünhan mərəz var, ey həkim.
Xəlqə pünhan dərdim izhar etmə, zinhar, ey həkim.
Var bir dərdim ki, çox dərmandan artıqdır mənə.
Qoy məni dərdimlə, dərman eyləmə, var, ey həkim.
...Gəl mənim tədbiri-bihudəmdə sən bir səy qıl,
Kim olam bu dərdə artıqraq giriftar, ey həkim!..
... Rənc çəkmə, sihhət ümmidin Füzulidən götür,
Kim, qəbuli-sihhət etməz böylə bimar, ey həkim...”
Qapadı gözlərini yana-yana Füzuli,
Zülmündən usandığı bu cahana Füzuli.
O, hər cövrə, cəfayə sinə gərdi, dayandı,
Yanmadı tək həyatda, öləndə də o, yandı!
Yandı, yandı sənətkar,
Külə dönər yananlar.
Külə dönmədi ancaq, günə döndü Füzuli.
Yalnız gündüzlər deyil, gecələr də dəmadəm
Gözlərində bir aləm,
Vətənin göylərində gülümsündü Füzuli.
Bütün şəhər yana-yana
Bir sel kimi axıb gedir qəbristana,
qəbristana.
Füzulinin arxasınca gedir hamı bu son dəmdə,
Elin dərdi, elin qəmi birləşibdir bu matəmdə.
Tabut gedir... Bu ağrıdan ürəklər də qana dönür,
Cənazənin arxasınca aram-aram el sürünür.
Bir ora bax, bir ora bax;
Meyitləri adlayaraq
Bir meyiti dəfn etməyə gedir onlar.
Gedir, gedir insan seli qatar-qatar.
Hindistandan, Türkiyədən, Azərbaycan ellərindən,
İran, özbək mahalından, Türmənistan çöllərindən
Min-min insan seli gəlmiş “o mənimdir, mənim” – deyə;

Füzulini qəbir evinə – son məskənə ötürməyə.
Şair gedir... Bu gün dua əvəzinə həzin-həzin
Oxuyurlar “Şəbi-hicran”qəzəlini
Füzulinin.
“Şəbi-hicran”... yanar canım, tökər qan çeşmi-giryanım,
Oyadar xəlqi əfqanım, qara bəxtim oyanmazmı?”
Bu bir qəlbin səsi deyil, milyon qəlbin bir səsidir,
Ömrü-günü əsarətdə keçən xalqın naləsidir.
“Şəbi-hicran”, qoca Şərqin öz varlığı öz adıdır.
Məhkum olan millətlərin “yandım” deyən fəryadıdır.
Könül qəmli, gözlər nəmli, baş aşağı gedir hamı,
Şairə el məhəbbəti aparır bu izdihamı
Çoxu elə gedə-gedə yıxıldığı yerdə qalır,
Taun gülür qəhqəhəylə, ölümlərə o, əl çalır.
Ölüm belə gələ bilmir izdihama qorxu, hədə.
Şairə el məhəbbəti qalib gəlir, ölümə də.
“Şəbi-hicran” deyə-deyə çatır onlar
qəbristana.
Şərqin qoca bülbülünü dəfn edirlər
yana-yana.
Bəs o kimdir, o purvüqar?
Qəbrin üstə son torpağı səpələyən o ixtiyar?
Saqqalından damcı-damcı axır onun göz yaşları,
O, əyərək qamətini qəbrə sarı;
Öpür qəbrin torpağını, birdən-birə
Üzü üstə dəyir yerə.
Ah! Odamı təslim etdi öz canını bu tauna!
Bəli, dostun qəbri üstə çatdı onun ömrü sona.
Dostlar, gəlin, bir tanıyın siz də onu,
Əbdül Kərim məzarda da tək qoymadı öz dostunu.
Füzulinin dərdləridir, – dedi, – mənim öz dərdlərim,
Füzulinin dərdlərini ömrü boyu ötdü Kərim.
Könül yaxan ney səsində, o, nəğməylə ömür sürdü,
Öləndə də həmin o ney köksü üstə görünürdü.

## EPİLOQ

Füzulimiz qədim İraq torpağında rahat yatdı.
Kərbəlada ikinci bir Kərbəlanı o yaratdı.
Ötdü aylar, ötdü illər, dünyanın hər bucağından
Bu məzarı ziyarətə axın-axın gəldi insan.
Bu məzarla İraq çatdı daha böyük şan-şöhrətə.
Müsəlmanlar gəlirdisə Kərbəlanı ziyarətə,
İndi bütün dünya üçün ziyarətgah oldu bu yer
Şərafətli bir diyara şərəf verdi bizim şair.
Bütün dinlər, təriqətlər birləşirdi bu məzarda.
Gələnlərə, gedənlərə
Kərbəladan milyon kərə
Daha artıq şərəf verdi bu məzar da.
Füzulinin doğum günü bəlli deyil bir insana,
O gələndə bu cahana,
Kim bildi ki, Azərbaycan torpağına gün doğuldu.
Ancaq onun ölüm günü ən böyük bir tarix oldu.
Hamı bir cür doğulmurmu doğulanda? Taleyə bax!
Öləndəsə hərə bir cür ölür, ancaq!

Öldün, o zamandan keçdi dörd yüz il,
Yanır qəlbimizdə sənət çırağın.
Dörd min il keçsə də saralan deyil,
Sənin söz gülşənin, sənin söz bağın.

Əsrlər ötsə də, o vaxtdan sənin
Hər dərdin, hər qəmin bizə tanışdır.
Qəlbindən od adan sətirlərinin
İstisi hələ də soyumamışdır.

Səni yaşadan da söz hünərindir,
Nəğmələr yarandı ahü-zarından.
Kədərin böyükdür, eşqin dərindir,
Doğuldun vətənin yaralarından.

Eşqin bir ümmandır, arzun bir aləm,
Nə var ki, yazmağa beş-on qəm olsa;
Yazıb dərdlərini qurtara bilməm
Mənim hər kirpiyim bir qələm olsa.

Ömrünü ahlarla vermədin bada,
Arzu dəryasında bir yelkən oldun.
Zaman özgəsini yandıranda da
Alışan o oldu, yanan sən oldun.

Ağladın, yayıldı səsin hər yana,
Bülbül bağçalarda ötdü – dedilər.
Gələndə Məhəmməd gəldin cahana,
Gedəndə: "Füzuli getdi" – dedilər.

*Şəki – Bakı, May – dekabr, 1958*

# Gülüstan

*Azərbaycanın birliyi və istiqlalı uğrunda çarpışan Səttar xan, Şeyx Məhəmməd Xiyabani və Pişəvərinin əziz xatirəsinə*

İpək yaylığıyla o, asta-asta
Silib eynəyini gözünə taxdı.
Əyilib yavaşca masanın üstə
Bir möhürə baxdı, bir qola baxdı.
Kağıza həvəslə o da qol atdı,
Dodağı altından gülümsəyərək.
Bir qələm əsrlik hicran yaratdı,
Bir xalqı yarıya böldü qılınc tək.
Öz sivri ucuyla bu lələk qələm,
Dəldi sinəsini Azərbaycanın.
Başını qaldırdı,
Ancaq dəmbədəm
Kəsdilər səsini Azərbaycanın.
O güldü kağıza qol çəkən zaman,
Qıydı ürəklərin hicran səsinə.
O güldü haqq üçün daim çarpışan
Bir xalqın tarixi faciəsinə.
Əyləşib kənarda topsaqqal ağa,
Hərdən mütərcimə suallar verir.
Çevrilir gah sola, baxır gah sağa,
Başını yellədib təsbeh çevirir.
Qoyulan şərtlərə razıyıq deyə,
Tərəflər qol çəkdi müahidəyə...
Tərəflər kim idi?
Hər ikisi yad!
Yadlarmı edəcək bu xalqa imdad?!
Qoy qalxsın ayağa ruhu Tomrisin.

Babəkin qılıncı parlasın yenə.
Onlar bu şərtlərə sözünü desin,
Zənciri kim vurdu şir biləyinə?
Hanı bu ellərin mərd oğulları,
Açın bərələri, açın yolları.
Bəs hanı bu əsrin öz Koroğlusu –
Qılınc Koroğlusu, söz Koroğlusu?
Babaların şəni, şərəfi, əlbət,
Bizə əmanətdir, böyük əmanət...
Yoxmu qanımızda xalqın qeyrəti?
Belə saxlayarlar bəs əmanəti?
Qoy ildırım çaxsın, titrəsin cahan!
Ürəklər qəzəbdən coşsun, partlasın.
Daim haqq yolunda qılınc qaldıran
İgid babaların goru çatlasın!
Qoy əysin başını vüqarlı dağlar,
Matəmi başlandı böyük bir elin.
Mərsiyə söyləsin axar bulaqlar,
Ağılar çağırsın bu gün qız, gəlin!..
Tərəflər sakitdir, qəzəbli deyil,
Məhv olan qoy olsun, onlara nə var.
İmzalar atılır bir-bir, elə bil,
Sevgi məktubuna qol çəkir onlar.
Atıb imzasını hər kəs varağa
Əyləşir sakitcə keçib yerinə.
Eynəkli cənabla, təsbehli ağa,
Qalxıb əl də verir bir-birinə.
Onların birləşən bu əllərilə
Ayrılır ikiyə bir el, bir Vətən.
Axıdıb gözündən yaş gilə-gilə,
Bu dəhşətli hala nə deyir Vətən?
Bir deyən olmadı, durun ağalar!
Axı bu ölkənin öz sahibi var.
Siz nə yazırsınız, bayaqdan bəri, –
Bəs hanı bu yurdun öz sahibləri?
Bəs hanı həqiqət, bəs hanı qanun?
Böyükdür bu yurdun tarixi, yaşı.

Bəs hanı köksünə sərhəd qoyduğun,
Bir vahid ölkənin iki qardaşı?
Görək bu hicrana, bu müsibətə,
Onların sözü nə, qərəzi nədir?
Bu xalq əzəl gündən düşüb zillətə,
Öz doğma yurdunda yoxsa kölədir?
Necə ayırdınız dırnağı ətdən –
Ürəyi bədəndən, canı cəsəddən?
Axı kim bu haqqı vermişdir sizə,
Sizi kim çağırmış, Vətənimizə?
Neçə vaxt səngərdə hey ulaşdılar,
Gülüstan kəndində sövdalaşdılar
Bir ölkə ikiyə
Ayrılsın deyə!..
Göy də guruldamış deyirlər o gün,
Çölləri, düzləri buludlar sarmış.
O göy gurultusu Oğuz xaqanın
Ruhuymuş, hönkürüb fəryad qoparmış.
Gülüstan kəndinin gül-çiçəkləri
Bir günün içində soldu, saraldı.
"Gülüstan" bağlandı, o gündən bəri,
Bu kəndin alnında bir ləkə qaldı.
Bağrı köz-köz oldu "Yanıq Kərəm"in
Tellər inildədi, yandı, nə yandı.
Aşığın sazında daha bir həzin,
Daha bir yanğılı pərdə yarandı.
Həmin gün ölkəni apardı sel, su,
Tutuldu çöhrəsi Günün, Ayın da.
Qoca Nəbatinin eşqi, arzusu,
O gün batmadımı Arpa çayında?
Ağlayıb dağlardan əsən küləklər,
Bu məşum xəbəri aləmə yaydı.
Sanki dilə gəldi güllər, çiçəklər:
"Bu işə qol qoyan qollar sınaydı".
Arazın suları qəzəbli, daşqın,
Şirin nəğmələri ahdır, haraydır,
Vətən, quşa bənzər qanadlarının

Biri bu taydırsa, biri o taydır.
Quş iki qanadla uçar, yüksələr,
Mən necə yüksəlim tək qanadımla?
Ürəklər bu dərddən tüğyana gələr,
Axar gözümüzdən yaş damla-damla.
Cənablar, bir anlıq düşündünüzmü?
Verdiyiniz hökmün ağırlığını?
Bu hökmün dəhşəti əllimi, yüzmü?
Biz necə götürək bu gözdağını?..
Başı kəsiləndə bu məğrur elin
Könül fəryadını hiss etdinizmi –
Qoca Füzulinin, igid Babəkin
Etiraz səsini eşitdinizmi?
Cənablar, bir damcı mürəkkəblə siz
Düşünün, nələrə qol çəkmisiniz?
Bir damcı mürəkkəb bir vətəndaşı
Qanına bulayıb ikiyə böldü.
Bir damcı mürəkkəb olub göz yaşı
İllərlə gözlərdən axdı, töküldü.
Min ləkə vurdular şərəfimizə
Verdik, sahibimiz yenə "ver" – dedi.
Lap yaxşı eyləyib doğrudan, bizə
Biri "baran" – dedi, biri "xər" – dedi.
Bizi həm yedilər, həm də mindilər,
Amma arxamızca gileyləndilər.
Hökmü gör nə qədər böyükmüş anın.
Möhür də basdılar varağa təkrar.
Yox, varağın deyil, Azərbaycanın
Köksünə dağ boyda dağ basdı onlar.
İmzalı, möhürlü ey cansız varaq,
Nə qədər böyükmüş qüvvətin, gücün.
Əsrlər boyunca vuruşduq, ancaq
Sarsıda bilmədik hökmünü bir gün.
Ey kağız parçası, əvvəl heç ikən,
Yazılıb, qollanıb yoxdan var oldun.
Böyük bir millətin başını kəsən,
Qolunu bağlayan hökmdar oldun.

Bir eli ikiyə paraladın sən
Özün kağız ikən paralanmadın,
Köksünə yazılan qəlb atəşindən,
Niyə alışmadın, niyə yanmadın?
Araz sərhəd oldu, əsdi küləklər,
Sular yatağında qalxdı, köpürdü.
Üstü dama-dama taxta dirəklər,
Çayın kənarında səf çəkib durdu.
Sular, sizdən təmiz, nə var dünyada?
Ləkədən xalidir axı qəlbiniz.
Bağrınız alışıb niyə yanmadı
Bu çirkin əmələ qol qoyanda siz?
Ey Araz, səpirsən, göz yaşı sən də
Keçdikcə üstündən çölün, çəmənin.
Səni arzulara sədd eyləyəndə,
Niyə qurumadı suların sənin?
Dayanıb Arazın bu tayında mən
"Can qardaş" deyirəm, o da "can" deyir.
Ey zaman, sorğuma cavab ver, nədən
Səsim, yetən yerə əlim yetməyir...
Qarışıb gözümdə, qarışıb aləm,
Dərd dərdi doğrayır, qəm qəmdən keçir.
Arazın üstündən keçə bilmirəm,
Araz dərdim olub, sinəmdən keçir.
Taxta dirəkləri torpağa deyil,
Qoydular Füzuli divanı üstə.
Yarıya böləndü yüz, yüz əlli il
Gəraylı, bayatı, muğam, şikəstə.
Dəmir çəpərləri eşqim, diləyim
Tarixim, ənənəm üstə qoydular.
Yarıya bölündü canım, ürəyim,
Yarıya bölündü Arazda sular.
Taxta dirəkləri qoydular, ax, ax!..
Qəlbimin, ruhumun dilimin üstə,
Biz güldük, ağladıq, yenə də, ancaq
Bir sazın, bir telin, bir simin üstə.
Ürəkdən ürəyə körpü? Bir dayan!

Dərdimiz dinirsə bir sazın üstə.
Şəhriyar yaralı misralardan,
Körpü salmadımı Arazın üstə?!
Bu taydan o taya axışdı sel tək
Gözə görünməyən könül telləri.
Bu selin önünü nə çay, nə dirək,
Kəsə bilməmişdir yüz ildən bəri.
Ağalar bilmədi birdir bu torpaq
Təbriz də, Bakı da – Azərbaycandır,
Bir elin ruhunu, dilini ancaq
Kağızlar üstündə bölmək asandır.
Böl, kağız üstündə, böl, gecə-gündüz,
Torpağın üstünə dirəklər də düz,
Gücünü, əzmini tök də meydana,
Qoşundan silahdan sədd çək hər yana.
Torpağı ikiyə bölərsən, ancaq
Çətindir bədəni candan ayırmaq!
Ayırmaq kimsəyə gəlməsin asan,
Bir xalqın bir olan dərdi-sərini.
O taydan bu taya Mustafa Payan
Oxuyur Vahidin qəzəllərini.
Dolandı zəmanə, döndü qərinə,
Şairlər od tökdü yenə dilindən.
Vurğunun o həsrət nəğmələrinə
Şəhriyar səs verdi Təbriz elindən:
"Heydər baba, göylər qara dumandı.
Günlərimiz bir-birindən yamandı.
Bir-birizdən ayrılmayın, amandı,
Yaxşılığı əlimizdən aldılar,
Yaxşı bizi yaman günə saldılar.
Bir uçaydım bu çırpınan yelinən,
Qovuşaydım dağdan aşan selinən,
Ağlaşaydım uzaq düşən elinən,
Bir görəydim ayrılığı kim saldı,
Ölkəmizdə kim qırıldı, kim qaldı".

*1959*




("**Gülüstan**" poemasının II hissəsi)

***Məhəmməd Cöhrəqanlıya***

**1**

Zərurət görmədim təsadüf qədər
Məqsədə yönəlir bu başsız axın.
Məndən rica etdi bir vətənsevər*
Yazım davamını mən "**Gülüstan**"ın.

Yazmışdım mən onu düz qırx il qabaq.
O vaxtdan bu yana çox sular axdı.
Arazın suyunda enib-qalxaraq
Ürəkdə bəslənən arzular axdı.

Torpağa düşmədi apardı yellər
Arzu toxumları sulara düşdü.
Yandı, pörşələndi həsrət könüllər
Yenə bu minvalla illər ötüşdü…

"Gülüstan" adicə haraydı, haydı
Qulaqlar kar olur biz qışqıranda.
Mən onu yazanda şah zamanıydı,
Başqa bir zamandır indi İranda.

Millət qarşılaşdı başqa yasaqla
Çəkdi imtahana böcək, quşları.
Üsullar dəyişdi, gedən bıçaqla,
Gələn pambıq ilə kəsdi başları.

*İshaq Ozan oğlu nəzərdə tutulur.

Dünya çalxalandı, sular duruldu
Tərsinə dolandı əsrin məhvəri.
Zaman hökm elədi, vaxt hakim oldu
Ayağa qaldırdı qul millətləri.

Qullar silahlandı qəzəbdən, kindən
Ayıra bildilər dumandan sisi.
Qovdu ağasını məmləkətindən
Kölə Afrikanın kölə zəncisi.

Göyə dirək oldu amanım, ahım,
Halalca haqqımız bizdən yan qaçar.
Zəncinin baxtını açan Allahım
Bəs mənim bəxtimi nə zaman açar?

Yaman uzun çəkdi hökmü bu qəsdin,
Ayrılıb ikiyə döndü bir Vətən.
“Gülüstan” adlanan bu ifritənin
Kağızı, qələmi nədənmiş, görən?

O kağız, o yazı yumdu gözləri
Yanan ürəklərdə od külə döndü.
Bizim aramızda o gündən bəri
“Gülüstan” tikanlı məftilə döndü.

Baş idik, ayağa indi yol olmaq
Bizi dərdimizə bu gün yad eylər.
Bir vaxt hakim ikən dönüb qul olmaq
Bizim bəxtimizə yazılmış məgər?

Bir vahid millətə, iki hakimin
Dili doğmalaşdı…Bu lap ağ oldu.
Doğma anamızın şəkərdən şirin
Bizə öyrətdiyi dil yasaq oldu.

Hakimlər özü də bilirdi aşkar
Mənim öz dilim var, öz tarixim var.
Siz haqqın üzünü boyalayırkən
Həqiqət də aydın, yalan da aydın.

Yüz min ermənininin məktəbi varkən,
Yirmi milyon türkə onu qıymadın.

Dinində, törəndə bizimlə birkən
Yasandan sən mənim haqqımı sildin.
Dininə düşməni əzizləyirkən,
Sən öz dindaşına düşmən kəsildin.

Özündən, sözündən qaçaq dilimiz
İslanıb üşüdü qarda, çisəkdə.
Yüksək məqamlarda yasaq dilimiz
Qovulub yaşadı kənddə, kəsəkdə.

İnsan olmaq üçün uşaq dil açar
Yasaqlar önündə biz dilsiz olduq.
Dil varsa, xalq da var, şan-şöhrət də var
Dil yoxsa, millət yox, heç varlıq da yox.

Soruşduq: – Dilimiz yoxsa, biz kimik?
– Farsdan dönməsiniz, – dedilər bizə.
Baxıb gözümüzün içinə dimdik,
Onlar qəsd elədi mənliyimizə.

Belə “tarixçilər”, belə nadanlar
Sizdə də, bizdə də dürəkdir, ancaq.
Düşmən olsalar da, millətə onlar,
Hakimi-mütləqə dirəkdir, ancaq.

Firdovsin söz açdı türk oğlu kimi
Əfrasiyab adlı Alp Ər-Tunqadan.
Məgər fars idimi sizin Rüstəmi
Döyüşə çağıran o böyük xaqan?

Rüstəm Zal – İransa,
Əfrasiyab – Turan,
Beləysə, fars olub
Türk nə zamandan?

Məgər türk deyildi mənim şahlarım
Əsrlər boyunca mülki-İranda?
Bəs səni tutmazmı naləm, ahlarım
Məni "farsdan dönmə" adlandıranda?

Türkün zatındadır kişilik, mərdlik
O, öz düşmənini vurmaz arxadan.
Türkə, Türk dilinə bu düşmənçilik
Sizdə bir adətdir qalü-bəladan.

Tarixə baş vuraq: bu ağ, bu qara
Mərdlik mayasıyla yoğrulmuş babam.
Haqqını tanıdıb çox haqsızlara
Amma haqsıza da mərd olmuş babam.

Bəzən özümüzü bəyənmədik biz
Dedik, filankəsə gərək oxşayaq.
Yandı öz bağımız… fikir çeşməmiz
Özgə bağlarını suladı ancaq.

Heç kəs inciməsin, dedik, qoy bizdən
Yandıq yad evində bir çıraq kimi.
"Buyur" deyə-deyə hörmətimizdən
Qonağı elədik evin sahibi.

Bizim böyük-böyük ustadlarımız
"Xəmsə"lər bağladı özgə dilində.
Dönüb yadın oldu bizim varımız
Babam talan oldu öz mənzilində.
Ya da abidələr ucaldıb dedik:
Fəhləlik bizimdir, ustalıq sənin.
Çox zaman özgəyə qulluq eylədik
Beyin bizim oldu, əsər özgənin.

Nadir də, Qaçar da ölkələr aldı
Vətən ucalmadı, taxtı ucaldı.
Öz doğma elini ayağa saldı
Şahlar bizim oldu, zəfər özgənin.

Saldıq özümüzü özümüz gözdən
Kül ilə oynadıq, əl çəkib közdən.
Ölkələr nur aldı şəfəqimizdən
Günəş bizim oldu, səhər özgənin.

Mənim sərvətimə cahan göz dikdi
Sərvətim, dövlətim ona gərəkdi.
Babam yer şumladı, babam yer əkdi
Zəhmət bizim oldu, bəhər özgənin.

Açdı sinəsini bizə bu torpaq
Aləmi bəzəyib lüt olduq, ancaq.
Cıdırda çapsaq da hamıdan qabaq
Hünər bizim oldu, nəmər özgənin,
Qızıl bizim oldu, kəmər özgənin.

Meydan oxusaq da, çərxi-dövrana,
Bəzən özümüzlə üzbəüz olduq.
Düşməni əzsək də, mərdü-mərdana,
Bəzən düşmənimiz özümüz olduq.

Zamanın küləyi, de, əsdi hardan?
Uduza-uduza axır udulduq.
Vaxtın axarında gəldi bir zaman
Biz iki hakimə dönüb qul olduq.
Ayılın, hakimlər, dönür bu dövran
Qorxun haqqı görən Allahınızdan.
Tarixi gerçəyi danmayın barı
Sizin çörəyiniz diziniz üstdə.
Tarixi əzmiylə yaradanları
Niyə çökdürdünüz bu gün diz üstə?

Sədi dərs də verdi sizə ədəbdən
Sizsə, başqasını bəyənmədiniz.
Möhtəşəm bir dini alıb ərəbdən
Ərəbə "çəyirtkə yeyən" dediniz.

**2**

Quzeydə ayağa qalxdı məmləkət
Bir təpə bir dağla üz-üzə gəldi*.
Millətin qəlbində boy atan nifrət
Köksün həmləsiylə o dağı dəldi.

Yaman acıq gəldi bu nifrət ona
Tankların altında əzdi milləti.
Sığdıra bilmədi dağ qüruruna
Təpə önündəki məğlubiyyəti.
Millət millət olur, arzu, niyyəti,
İnamı, inadı,
öz imanıyla.
Dərk edib bu haqqı, bu həqiqəti,
Suvardıq torpağı şəhid qanıyla.

Eşidib qəlbimin üsyan səsini,
Yazdım "Şəhidlər"in faciəsini:
"Dilək bir çiçək də bitirə bilməz
Bu gündən sabaha körpü olmasa.
Azadlıq ağacı bar verə bilməz
Şəhidlər qanıyla suvarılmasa.
…O şənbə gecəsi gecikdi səhər
Zaman itirmişdi o gün sağ-solu.
Ömürdən keçərək, keçdi şəhidlər
Bir qanlı gecədə minillik yolu.

O şənbə gecəsi ölüb-dirildik
Şərəf papaq oldu, başlara qondu.
O qətl gecəsi xalqın min illik
Şücaət tarixi təkrar olundu.

Qatil gülləsinə qurban gedirkən
Gözünü sabaha dikdi şəhidlər.
Üçrəngli bayrağı öz qanlarıyla
Vətən göylərinə çəkdi şəhidlər.

---

*1990-cı il 20 yanvar qırğınına işarədir.

O şənbə gecəsi, o qətl günü
Mümkünə döndərdik çox namümkünü.
Xalqın qəlbindəki qorxu mülkünü
O gecə dağıdıb sökdü şəhidlər".

**3**

"Gülüstan" yarandı düz qırx il əvvəl
"Şəhidlər" nəticə, "Gülüstan" təməl.
Azadlıq verilməz bilək bir kərə
Azadlıq alınar, budur doğru yol.
Axı "Gülüstan"dan ta "Şəhidlər"ə
Gedən uzun yoldu keçilən bu yol*.
Daş körpü – vəhdətim daş Xudafərin!
Gərəksiz daşların qalağı oldu.
Üstündən bir kimsə keçmədi… min-min
Könül həsrətinin gözdağı oldu.
Gəldi başımıza nələr, ay nələr,
Goramı aparaq bu dərdi, qardaş?
Bütün bu bəlalar, bu faciələr
Həmən "Gülüstan"dan göyərdi, qardaş.

Quzeydə yerini göstərdik yada,
Zorun təməlini haqq deşə bildi.
Gördük, bizdən başqa bu gen dünyada
Bütün ayrılanlar birləşə bildi.

Biriykən ikiyik, bu halımızla
Biri-birimizə həsrət qalmışıq.
Biz hələ bu gün də xəyalımızla
Həsrətin üstündən körpü salmışıq.
Buna da şükr edib, "təvəkkül" – dedik,
İmdadçün həmişə üz tutduq göyə.
Elə zaman gəldi, keçmək istədik
Xəyali körpüdən biz, daş körpüyə.

---

*Bu misralardakı fikir dostum H.Həsənovun "İstiqlal" adlı kitabıma yazdığı ön sözdəndir.

Daş körpü – vəhdətim, daş Xudafərin!
Gərəksiz daşların qalağı oldu.
Üstündən bir kimsə keçə bilmədi
Bölünən bir xalqın gözdağı oldu.

Biri-birimizə gendən "gəl" – dedik
Tanrı üz çevirdi elə bil bizdən.
O qədər üstündən keçə bilmədik
Körpünü ot basdı qəhərimizdən.

İki əsrdir ki, o daş körpünün
Bu tayında mənəm, o tayında sən.
Sökülüb-dağılır daşlar günbəgün
Sərhəd dirəkləri xəbərsiz oldu
Bizim qəlbimizdən keçən körpüdən.

Qəsbkar qəsdini əbədi sanmış
İki başda duran tağlara bir bax.
Çoxu dağılsa da, dimdik dayanmış
Birinci tağ ilə axırıncı tağ.

O tağın biri mən, o biri sənsən
Onlar əsrlərlə dözüb sellərə.
Selin zərbəsinə tağlar dözübsə,
Nə gəlib arzusu bir könüllərə?

Bu gün qismətimiz qəm-kədərdisə,
Dünənki birliyim heç unudulmaz.
Çayın altındakı torpaq birdisə,
O tayı bu taydan ayırmaq olmaz.

Neçə il əvvələ qayıdaq yenə
Diləklər dikəldi, "mən varam" – dedi.
Bu böyük diləyin zərbələrinə
Sərhəd dirəkləri tab gətirmədi*

---

*1989-cu ilin dekabr ayında quzey azəri türklərinin tikanlı sərhəd məftillərini yarıb o taya keçmələrinə işarədir.

Bu taydan o taya haray qaldırıb,
Özünə güvəndi bu millət yenə.
Dəmir məftilləri dişiylə qırıb
Oğullar doladı biləklərinə.

Araz öz yoluyla yenə axırdı
Həsrət divarını o gün aşdılar.
Qardaşlar qollardan zənciri qırdı
Çayın ortasında qucaqlaşdılar.
Dərdi boğazlayıb o gün sevincdən
Onlar hönkür-hönkür hey ağlaşdılar.
Qardaşlar ağladı o gün doyunca
Soldatlar, sərbazlar dəhşətə gəldi.
O günün ertəsi Araz boyunca
Tikanlı dirəklər yenə dikəldi.

Qovuşdu birgünlük bu tay o tayla
Bir günlük sevincdən çaş-baş oldular.
Qardaşı qardaşdan ayırmasıyla
Soldatla sərbaz da qardaş oldular.

Ölmədi, o günü gördü Bəxtiyar
Dedi: – Haqq önündə zor bərbad olsun.
Dedi: – Mən o günü gördüm, Şəhriyar,
Qabaqda işıq var, ruhun şad olsun.

Bu yerdə ustadla neçə il əvvəl
Telefon söhbəti yadıma düşdü*:
Mən ona “gəl” – dedim, o mənə “gəl-gəl”
Əllər görüşmədi, səslər görüşdü.
Məndən xəbər aldı: – Neçə yaşın var?
Yaşımı söylədim, dedi: – Min alqış!
Dedim: – Nəyə alqış, ustad Şəhriyar?
Dedi ki, cavansan, sən mənə baxmış.
Arzum göyərmədi, keçibdir yaşım,

*1981-ci il yanvarın 23-də Şəhriyarla olan telefon söhbətim.

O vüsal gününü sən gör, qardaşım".
Getməz ağzımızdan o günün dadı
Mən gördüm o günü bircə gün, ancaq.
Başımız üstündə yenə oynadı
Bu tayda "dubinka"*,
o tayda şallaq.
Biz bunu bacardıq… Ancaq nə fayda?
Verdik əlimizdən yelə fürsəti.
Allah bir də nə vaxt, hansı dolayda
Bizə verəcəkdir elə fürsəti?

Tarixdə neçə yol uduzduq, nədən?
Zirvəyə qalxmışdıq, biz niyə endik?
Səbrlə, tədbirlə ölçüb-biçmədən
Ağla güvənmədik, hissə güvəndik.

Səttarxan, Bağırxan və Pişəvəri
Bizimçün hər biri diridən diri.
Onlar qəhrəmandı, qəhrəman, fəqət
Təkcə igidliklə kar aşmır indi.
Uzağı görmədən, təkcə cəsarət
Arzuya, istəyə yol açmır indi.

Onlar ölçmədilər uzunu, eni
Tədbir tökmədilər, əzab çəkdilər.
Tuta bilsəydilər günün nəbzini
Arzu güllərini dərəcəkdilər.

Qırx il həsrət qaldı almana alman
Dövrana baxdılar, vaxta baxdılar.
Onlar qanadlanan arzularından
Zamanın çiyninə qanad taxdılar.

Düşündük, dərdimiz artdı ilbəil
Vaxtın damarını tuta bilmədik.
Siz: "zaman başqadır, vaxt o vaxt deyil",
Bizsə o arzuyla şeirlər dedik.

*Dubinka – Dəyənək (rus sözüdür)

İstiqlal qazandı quzeydə ölkə
Bunu gözləmişdi millət yetmiş il.
Bu gün aldığımız azadlıq bəlkə
Bizi biz edəcək istiqlal deyil?

İstiqlal qazandıq, kim “oxay” dedi?
Təzə bəlalara biz sinə gərdik.
İstiqlal milləti sevindirmədi
İstiqlal qazanıb, torpaq itirdik.

Çəkdi bu milləti hərə bir yerə
Məqsəd – kürsü eşqi, amal – mənfəət.
O qədər çəkişdik, həm firqələrə
Həm də bölgələrə bölündü millət.

Umdu, nəsə umdu Vətəndən hamı
Amma unuduldu məmləkət dərdi.
Kürsüyə çatmaqçün biri Ağdamı
Biri də Şuşanı güdaza verdi.

Bunlar həqiqətdir, ay bədbəxt, sənin
Hansı amal ilə qəlbin döyündü?
Unudub dərdini bütöv Vətənin
Kürsü hərisliyi amala döndü.

**4**

İslam bayrağıyla başqası gəldi
Hamı düşündü ki, dünya düzəldi.
Solub-saralırdı sahibsiz, təki
Bizim viran olmuş könlümüzdəki
Arzu çiçəkləri…
                    o gün suladıq.
Biri-birimizi muştuluqladıq.
Bizim Söhrab Tahir, Balaş, Mədinə
Bayram libasları geydi əyninə.
Ertəsi eşitdik möhtərəm imam

Yaratdı ölkədə “cümhuri-islam”.
Çox gözəl, cümhura nə irad, nə söz?
Məgər bu deyilmi istədiyimiz?

Şahlıq diyarında, şah ölkəsində
“Döndü həqiqətə” yüzillik xəyal.
Türkün öz dilində, öz ləhcəsində
Qəzetlər, dərgilər çıxdı dalbadal.

Nə oldu sonrası? Keçdi bir qədər
Boyalar silindi, bozardı üzlər.
Gördük vədlərdən təkcə söz qalıb
Zülm qah-qah çəkir, haqsa hönkürür.
Şahlıq devrilsə də, başqa rəng alıb
Yaşayır əvvəlki zülm başqa cür.

Adını dəyişib, əhdini danıb
Yenə də həmən zülm, həmən əsarət.
Qarmağa taxılan ətə aldanıb,
Tələni görmədi zavallı millət.

Zülm nə din bildi, nə dil, nə Vətən,
Cəhalət uydurdu İslam adına.
Açıqfikirlilər qaçdı ölkədən,
Dözməyib cahilin xurafatına.
Düşünən başları qovdu ölkədən
Farsı da, kürdü də, türkü də qəsdən.
Deyən tapılmadı, otur yerində
Mən qafil deyiləm sözə aldanam.

De, hanı bəs sənin əməllərində
Şəri boğazlayan müqəddəs İslam?
Məgər yuvasından didərgin düşən
O bədbəxt kimsələr müsəlman deyil?
İslamda insanlıq ləyaqətindən
Nitqlər söylədin minbərlərdə sən,
Yurddan qovduqların bəs insan deyil?

Minbərdən bağırdı söz gövşəyənlər:
“İslama hər yerdə dayağıq” – deyə.
Bizi darda qoyub “İslam” deyənlər
Niyə dayaq oldu bəs erməniyə?

Dandın həqiqəti sən bilə-bilə
Sübutun uydurma, dəlilin əbəs.
Erməni qəsbinə kiriməyinlə
Xoruzun quyruğu görünmürmü bəs?

Qorxuram bu yerdə belimiz sına
Adını qoymusan “İslam dövləti”.
Özün de, budurmu din qardaşına
İslam dövlətinin xətri, hörməti?

Bunun da kökünü bilirik nədir?
Səninçin “arilik” dindən öndədir.
İslama “vay” dedi, dinə “vay” dedi
Arxaya çəkildi din qohumluğu.
Sizi erməniyə dayaq eylədi
Əcdadda birləşən qan qohumluğu.
Tapıldı bizdə də cəhalətindən
Dinin cövhərini anlamayanlar.
Atıldı meydana, yapışıb dindən
Onu ciblərinə qazanc sayanlar.

Kəbəyə getdilər hər il dalbadal
Ziyarət deyildi, ticarətdi bu.
Bəs hanı haqq yolu? Bu səfər, bu yol
Hacılıq adıyla tacirlik oldu.

Dedilər: Dərdlərə son qoymaq üçün
“İslam partiyası” gərəkmiş bu gün.
Bir deyən olmadı amma onlara
“A qardaş, din hara, siyasət hara?”
Nədir bu partiya? Mən anlamıram
Firqə, dar çərçivə, firqə bir qəfəs!
O boyda ucalıq, o boyda İslam
Firqə qəfəsinə sığışarmı bəs?

Din ilə ucalır ruhumuz göyə
Göylər bir qiyasa, ölçüyə gəlməz.
O böyük din ilə bircə firqəyə
Bəşərin yarısı sığışa bilməz.

**5**

Sökülür dan yeri, görmürsənmi sən
Zamanın özündən, vaxtın özündən?
Bu nə boş xəyaldır, nə şirin röya?
Közərir çınqa od külün içində.
Dünyanı titrədən qoca Rusiya
Bölünüb söküldü bir gün içində.
Köksünə dağ üstdən dağ çəkilən xalq
Bir gün dağ çəkəcək dağın köksünə.
Məftil çəpərləri qıra bilən xalq
Bir il gec, bir il tez – qıracaq yenə.

Torpağı yoğurur vaxt özü qanla
Vaxt gəldi, bircə söz min dünya açar.
Artıq anlamışıq ahla, amanla
Nə məftil əriyər, nə sərhəd uçar.

Zülm öz-özünə kəsilir qənim
Baxın öz yönünü dəyişən çarxa.
Suyun gəlməsinə şübhəm yox mənim
Bir vaxt şırıl-şırıl su gələn arxa.

Salaq yadımıza bu gün, cahanın
Rəngləri dəyişən beş qitəsini.
Biz də görəcəyik Azərbaycanın
Güneyli-quzeyli xəritəsini.

*Noyabr, 1999*




## I ÜSYAN

*"Hümmət, a vətəndaşlar!*
*Qeyrət, a vətəndaşlar!"*

***Sabir***

Bahar zər qələmilə
Naxış vurur torpağa.
Qışdakı məşəqqəti
Unutdurur torpağa.
Şamaxıda Sabirin
Balaca bağçasında
Əyləşib iki yoldaş,
İki dost, iki sirdaş.

Səhhət, Sabir... iki qəlb
Səslənir, bir-birinə
Köklənən simlər kimi.
Bir nəğmənin eşqinə
Bir dinən simlər kimi.

S ə h h ə t

Bəli, padişahımız
Təzə bir fərman verib.
O, ölüyə azadlıq,
Diriyə zindan verib.

S a b i r

Ağız yummaqdır, ancaq!
Bu da təzə fırıldaq!..
Çeşmələr təşnəsinə
Bircə udum azadlıq,

Harda, harda qalmısan,
Mənim suyum azadlıq,
Mənim odum azadlıq?!
Sənsiz gülə bilərmi
Üzümüzə
səadət?

S ə h h ə t

Neyləyək, bir udum da
Udumdur... heçə lənət!..

S a b i r

Min arzu bəsləyirəm,
Mən, axı, hər nəfəsdə,
Qanadım var, göyüm yox,
Necə uçum qəfəsdə?..

Azadlıq – səhərimdir;
Gündüzüm, axşamımdır.
Eşqimdir, ilhamımdır.
O, dənizim, yelkənim,
Əsil haqqımdır mənim!
Neçə ümman yaradar,
Ahımdan göyə qalxan
Yalnız bircə buludum?!
Niyə mənə haqqımı
Versinlər udum-udum?
Xəyalım azad olsun,
Düşüncəm azad olsun.

Ürəyimin sözünü
Mən yazmaq istəyirəm,
Qoy qələm azad olsun.
Mən görmək istəyirəm
Gözlərim azad olsun.
Danışmaq istəyirəm
Sözlərim azad olsun.
Qışqırmaq istəyirəm

Qoy dilim azad olsun,
Dodağım azad olsun.
Eşitmək istəyirəm
Qulağım azad olsun.

Əsarət zəncirini
Mən qırmaq istəyirəm,
Qollarım azad olsun.
Gəzib bütün dünyanı
Arzumu qulaqlara,
Bağırmaq istəyirəm,
Yollarım azad olsun!

Ələmlər bəstəsiyəm!
Min arzunun səsiyəm,
Mənə dərman neyləsin?
Mən arzu xəstəsiyəm?

İçib-içib doyunca
Azadlıq çeşməsindən;
Söndürəydim odumu,
Çeşmələr təşnəsinə,
Özün söylə, neyləyər
Suyun bircə udumu?..

S ə h h ə t

Məgər görməmisənmi
Damcı necə daş dəlir?

S a b i r

Dəlir, çox yavaş dəlir.

S ə h h ə t

Dəqiqələr, saatlar
Axır dönüb il olur.
Dama-dama göl olur.
“Molla Nəsrəddin”ə bax,

Onu zaman yaratdı.
Mirzə Cəlil damcıdan
Axı, ümman yaratdı.

İndi o böyük ədib
Səni çağırır, səni –
Deyə Səhhət cibindən
Çıxartdı məcmuəni.

Zamanın əsəbləri
İndi çəkilib tarım.
Oxudu ilk səhfəni:
– "Sizi deyib gəlmişəm,
Müsəlman qardaşlarım..."
Sabir yata bilmədi
O gecəni sübhədək.
Açıldı arzuları
Gözündə çiçək-çiçək.
Nədir hələ bilmirəm
Mən o gecənin adı;
Bircə bunu bilirəm
O gecə... ah... o gecə
Tək səhəri doğmadı;
Doğdu göyü, yeri də.
Doğdu bizi təzədən
Mirzə Ələkbəri də.

Dan yeri ağaranda,
O qalxıb yatağından
Açdı pəncərəsini.
Dinləməyə başladı
Bağçada "hop-hop" deyən
Şinəbubun səsini.
Bu səhərə,
            bu səsə
O niyə səcdə qıldı?
Açdığı o pəncərə
Bağçaya açılmadı,
Şeirimizə açıldı.

Qələm nalə qopartdı,
Kağıza dəyən kimi
Bu səs kağız üstünə
Dağ basdı,
            od çilədi.
Bu səs əsrlər boyu
Yatan babamı belə
Yuxudan silkələdi:

"Yox, mən çığırmalıyam,
Yox, mən bağırmalıyam!
Köməyimə,
            dadıma
Göyü çağırmalıyam,
Yeri çağırmalıyam!
Mən bütün qaydaları
Qanunları,
Sədləri
Dağıdıb qırmalıyam!"

"Hansı qanunda var ki,
Öz elindən olasan,
Hədəf də sən olasan,
Güllə də sən olasan?.."

Vətənin
            dərdlərilə
Yandı,
Alışdı Sabir
Dərdin dodaqlarıyla
Dindi,
Danışdı Sabir:
"Xalqların cərgəsində
Mən də varam deyirəm.
Mən dünyadan özümə
Həqiqət istəyirəm,

Sədaqət istəyirəm.
Mən "Hümmət istəyirəm,
Mən qeyrət istəyirəm..."

"Min ildir sirdaşımız
Ələm oldu, qəm oldu,
Niyə, niyə bəs bizim
Qeyrətimiz kəm oldu?

Yarım bu tayda qaldı,
Yarım o tayda qaldı.
Toyum burda çalındı,
Yarım o tayda qaldı.
Daha bu əzablara
Canımda bir tabım yox...
Mən təpədən-dırnağa
Sualam...
Cavabım yox...
Bilmirəm öz əlimdən
Mən hara, hara qaçım?
Bir əlim qanlım oldu,
Bir əlimsə harayçım!

Bizi xəlbirə qoyub,
Sovurdular havaya,
Biz toz olub ələndik.
Min ildir, anamızdan
Süd yerinə qəm əmdik.

İnlədikcə, azalmır
Dərdlərimiz daha da
Ürəkdə köz-köz olur.
Bu haqdır, ağladıqca
Kişi qeyrətsiz olur.
Bizdən sonra oyanan
Ala bildi haqqını,
Biz hələ ağlayırıq,

Tarixin təkərinə
Hey ümid bağlayırıq”.
Yox, mən bağırmalıyam,
Yox, mən çığırmalıyam!...”

## 2. ÜRƏK VƏ ÇÖRƏK

*“Artdıqca həyasızlıq olur el, mütəhəmmil,*
*Hər zülmə dözən canları neylərdin, ilahi?”*
***Sabir***

Zərrədə küllə bax!... Şirvan dedikcə
İslam aləminə lağ etdi Sabir.
Tiyanda sabunu dağ elədikcə
Fikrində zamanı dağ etdi Sabir.

Qaranlıq daxmada gecə sübhədək
O, işıq naminə yazdı, yaratdı.
Sabirin qəzəbli gülüşlərindən
Vətən göylərində Günəş dan atdı.

Bütün sualların cavablarını
Tapdı ilhamında, təbidə Sabir.
Böyük bir ölkənin dərdini yazdı
Sabun tiyanının dibində Sabir.

Dünyaya sığmayan fikirlərini
Zaman, bir tiyana bağlamadımı?
O dedi: – Anlamaq istəsən məni,
Düşün ləqəbimi, unut adımı!

Düzü, çox düşündüm... Təxəllüsünü
Niyə Sabir qoydu Mirzə Ələkbər?
Böyük gələcəyə dikib gözünü
Demək istəmiş ki, dözən əzilər!
Demək istəmiş ki, Vətən lalədir,
Bağrının başında qarasıyam mən.
Müsəlman nə demək?

Təşbehi-Sabir,
İslam dünyasının yarasıyam mən!
Demək istəmiş ki, səbr edən insan,
Dünyadan əbədən üzülüşübdür.
"Şükür" – deyə-deyə bədbəxt müsəlman
Səbrin lay-lasından cəbrə düşübdür.

Demək istəmiş ki, zavallı Şərqin,
O sonsuz səbrinin kasasıyam mən.
Çatıb xirtdəyimə daha qəzəb, kin,
Səbrim tükənibdir, daşasıyam mən.

Deyirəm, anası süd deyil, ona
Atəş içiribdir öz döşlərindən.
Axır göz yaşları hey yana-yana
Sabirin yaralı gülüşlərindən.

Onun gülüşləri səbirdənmi? Yox!..
O, kinin, qəzəbin qəhqəhəsidir.
Onun gülüşləri bir atəş, bir ox!
Səbrə qılınc çəkən üsyan səsidir!
Dərdini xalqıyla bölüb ağladı,
O gülüb ağladı, gülüb ağladı!

Cahilə nə var ki?.. Ürəklər dələn
Dəli qəhqəhəni bir gülüş sanar.
Sabirin şeirini oxuyub gülən,
Nə Vətən anlayar, nə millət qanar.

Bir gün fitva verdi axund minbərdən:
– Lənətlə çəkilsin Sabirin adı.
O günün səhəri qəssab Mir Həsən
Şairə bir misqal quyruq satmadı.
Axund tapşırdı ki, Şirvanda heç kəs
Mirzə Ələkbərlə alver etməsin.
Axundun əmrindən o çıxa bilməz
Burada bir sirli illət var, yəqin.

Qəssab bilmədi ki, Mirzə Ələkbər,
Neçin onun kimi yanaşmır dinə.
Qəssab bilmədi ki, qara gecələr
O yazıb-yaradır işıq naminə.

Qəssab bilmədi ki, sel tək çağlayır,
Alışıb yaradır o, ac qarına...
Qəssab bilmədi ki, o gün ağlayır.
Millətin gələcək övladlarına.

Qəssab bilmədi ki, bu xalqın nədən
Özü ağırlıqda qəm yükü vardır
"Təvəkkül" deməkdən, "şükür" deməkdən,
Ağzında dili də cadar-cadardır.

Çağırdı elləri o, haqq yoluna,
Məslək yolçusuna el "yolsuz" dedi.
O, böyük insanı qəssab bir yana,
Ömür yoldaşı da başa düşmədi.

Qəlbi qəlbimizdə daim döyündü,
Yumulu gözlərə göz verdi Sabir
Yazdı... Qarşımızda güzgüyə döndü, –
Bizi özümüzə göstərdi Sabir.

Saldı ürəyinə Sabir hər şeyi,
Min ilin dərdini çəkdi bir anda.
Yolunda canını qurban verdiyi
Bədbəxtlər də onu anlamayanda.

Sözüylə, şeirilə o, zaman-zaman
Donuq şüurlara min toxum əkdi.
Dəmir çəkic altda fəryad qoparan
Dəmir parçası tək o, nalə çəkdi.
Qızılı döydülər... Haray-həşirsiz
Yapıxıb mum kimi eləcə qaldı.

Dəmiri döydülər... Qışqırığından
Qulaqlar tutuldu, gözlər qaraldı.
Qızıl dedi: – Dəmir, söylə nədir bu?
Məni də döydülər, axı, sənin tək.
Səsimdən bir adam xəbər tutdumu?
Dəmirsən, əzaba dözəsən, gərək.

Dəmir söylədi ki: – O zərbələrdən,
Ahü-nalə çəkib ağlamadım mən.
Bədbəxt yaranmışam mən, a bəxtəvər,
Səni dəmir döydü – özgəsi döydü.
Ona ağladım ki, məni döyənlər
Özgəsi deyildi, özümünküydü.

Bir gün fitva verdi axund minbərdən,
– Lənətlə çəkilsin Sabirin adı.
O günün səhəri qəssab Mir Həsən,
Şairə bir misqal quyruq satmadı.

Sabun bişirməkçün ona yağ gərək,
Bəs indi neyləsin? O, çox düşündü.
Neyləyə bilərdi? O, yalqız, o, tək.
Dükan da bağlandı, ocaq da söndü.

O, qaralan ocağa
Baxa-baxa düşünür.
"Yoxsa arzularım da
Bu qaralan köz kimi,
Ocaq kimi tez sönür?..
Yox, yox! Bu mümkün deyil,
Sönən ocaqdır ancaq.
Qəlbimdəki ocaqsa,
Daha betər yanacaq.
Yazıram zəmanədən
Atəş, od uda-uda.
Könlümdəki ocağı

Heç söndürə bilərmi
Dəryaların suyu da?
Bəs bir bölük külfətim?..
Onların hər arzusu
Bu ocağa bağlıdır,
Axı, külfətim üçün,
Könlümdəki ocaqdan
Bu ocaq maraqlıdır.

Bu ocaqla yaşayır
Evdəki lüt balalar,
Sinəmdəki ocaqdan
Onlara nə fayda var...”

Milyonları düşünən
Böyük bir qəlb sahibi.
Közərən köz önündə
Alışır ocaq kimi...

Milyonları düşünən,
Milyonların yolunda
Əriyib muma dönən
Milyon-milyon insanın
Azadlıq yollarında
Çıraq olan, nur olan,
Milyonlarçın doğulan,
Balaca bir külfətin
Çörəyidir, suyudur.
Milyonların yolunda
Atəş udan, od udan
Külfətinin yolunda
Zəhər udur, qan udur.
Milyonlara dərs deyən
Mis tiyana baş əyir –
Bir balaca külfəti

Dolandıra bilməyir.
“Yox, yox! Bu mümkün deyil,
Sönən ocaqdır, ancaq.
Könlümdəki ocaqsa,
Daha betər yanacaq...”

Ona yağ satmadılar
Sabun bişirmək üçün.
Ürəyinin yağını
Əridərək günbəgün
Şair yazdı... Şeirlə
Haqqını anlamayan
Nadanları bizlədi.
Ürəklərin minillik
Pasını təmizlədi.
Sabun!
Şeir!
İşə bax!
Təsadüfmü bu, ancaq?

Hər ikisi təmizlik!..
Sən bu təsadüfdəki
Ahəngə bax, məğzi gör.
Sabun zahir üçünsə,
Şeir batin üçündür...
Sabundan əl çəkməli!
“Bəs mən necə dolanım?”
Deyə o, fikrə dalır...
Əməllər, arzularla
Yaşayanda ucalan,
Çörək dərdi çəkəndə
Görün, necə alçalır...

## 3. İMTAHAN

*"Zahida! Gəl soyunaq bir kərə paltarlarımızı!*
*Çıxaraq zahirə batindəki əfkarımızı.*
*Hər kəsin ağı qara isə utansın, a balam!"*
***Sabir***

O, həqiqət naminə
Qələm çaldı... həqiqət!
Sabun bişirmək – peşə,
Şeir yaratmaq – sənət.
Sabun – çörək üçündür.

Şeir – ürək üçündür.
O, könlünü, eşqini
Vətənə, xalqa verdi,
Çörəyi də ürəklə
Qazanmaq istəyirdi.
– Necə?..
– Müəllim olmaq!
Körpəcə ürəkləri
Pərvazlayıb uçurmaq!
Onların nəzərində
Arzular dünyasından
Minbir kaşanə qurmaq!
Balalara hər şeyin
Öz yerini tanıtmaq!
Ah!.. Onlara... onlara,
Özlərini tanıtmaq!
Həm bu günü tanıtmaq,
İndidən, lap indidən
O körpə balalara
Dost, düşməni tanıtmaq!

Şairim, düz deyirsən.
Mən səni anlayıram.
Düzü, müəllimliyi

Mən bütün peşələrin
Ən ucası sayıram.
O, elə ulduzdu ki,
Bu gün yanır... işığı
Bizə sabah görünür.
Özü batsa da, ancaq
Vətənin göylərində
Min-min ulduza dönür.

* * *

O bilmir ilk mənzili
Son mənzili haradır;
Bugünkü əməliylə
O, sabahı yaradır.
Omrü bir nur parçası
O, sabahın carçısı!..

Bəli, müəllim olmaq!
Bunun üçün nə gərək?
Ona bildirdilər ki,
Rəsmi vəsiqə, gərək.
Vəsiqə!
– Kimdən?
– Hardan?
Dedilər:
– Mollalardan.
Yox, yox! O uda bilməz
Bu təhqiri, bu dərdi.
O ki ana dilindən
Dərs demək istəyirdi.
İstəyir ki, balalar
Bizim ana dilinin
O büllur çeşməsindən
Nur içib feyz alalar...
Bəs bunun mollalara,
Bilmirdi nə dəxli var?

– Dərs demək istəyirəm
Şəriətdən, cənablar,
İmtahan edin məni.
Dayanıb heykəl kimi,
Cahillərin önündə
Cahillərin düşməni.
Taleyə bax, günə bax,
Zamanın hökmünə bax!
Zaman öz loğmanını
Pəncəsində inlədir.
Əsrin nəbzi, nəbzində
Döyünən bir arifi
Cahil imtahan edir.
Zaman – onun ustadı,
O, zamanın həkimi.
Zamanın qarşısında
Dayanıb xəstə kimi...
Yağır bir-bir suallar:
– De görək, cəhənnəmin
Neçə yüz qapısı var?
Əsrin hər cəfasına
Dözüb dayanan insan, –
Əsrin cəhənnəmində
Alışıb-yanan insan
Sayır qapılarını
Xəyali cəhənnəmin...

Dözür, buna da dözür,
Ona vəsiqə gərək.
Özü bilir dalını...
Min cənnətə dəyişməz
O ki öz amalını.
Mənasız suallara
Cavab verir
Birbəbir
O, bığaltı gülərək.
İyirmicə uşağa

Müəllim olmaq üçün
Ona vəsiqə gərək...
Axund nə biləydi ki,
Qarşısında dayanan
Milyonların ən böyük
Dahi müəllimidir.
Əsrin ağız dolusu
Həqiqət mahnısını
Ötən sarı simidir...
Böyük müəllim idi
O ki, vəsiqəsiz də.
O, əzilən xalqının
Üsyan deyən səsiydi.
Vətən üçün od tutub
Alovlanan ürəyi,
Onun vəsiqəsiydi.
O ürəyin başında
Qaysaqlanan yaralar,
Daim yanan yaralar,
Ən gözəl möhürüydü
Onun vəsiqəsinin...

Axundda ağıl hanı?
Düşünə dərin-dərin,
Axund nə biləydi ki,
Dayandığı minbərin
Kökünə balta vuran
Elə bunun özüdür.
Bu buxara papaqlı,
Bəstə boylu müəllim,
Xalqın görən gözüdür.
Axund nə biləydi ki,
Ona imtahan verən,
Bu məğmun, miskin insan –
şeirilə çoxdan çıxıb
Əsrin imtahanından.
Axund nə biləydi ki,

Millətin qulağına
Haqq sözü deyən budur –
Gündə min yol adını
Lənətlə yad etdiyi
“Ağlar-güləyən” – budur.

## 4. ÜMİD MƏKTƏBİ

*“Yaşasın şəhriyari-hürriyyət”*
***Sabir***

Onunçun həyat – ümid.
Onunçun zaman – ümid,
Onu ucaldan – amal,
Onu yaşadan – ümid.
Onun ümid günəşi
Aləmə şölə saçdı.
Dükanını bağlayıb
“Ümid” məktəbi açdı.
Elə bil ki, bununla
O çatdı bəslədiyi
Hər arzuya, mətləbə.
Ümidini bağladı,
Bu ikicə sinifli
Balaca bir məktəbə.

O unutdu elə bil
Dərdini də büsbütün.
Dərs verdiyi hər uşaq
Bir ümid çırağıydı,
Bu böyük şair üçün...

“Mənim bağım, baharım,
Fikri işıqlı oğlum,
Məktəb zamanı gəldi,
Dur, yaraşıqlı oğlum”.
Açdı şeirlərilə
O, yumulu gözləri,

Tanıtdı körpələrə –
Şanlı sabaha gedən
Cığırları, izləri...
Körpələrin gözündə
Nuh əyyamından qalan
Vərdişləri qırdı o.
Onların ürəyində
Min çıraq yandırdı o.
Qanmaq öyrətdi Sabir,
Qandırdıqca onlara
Yanmaq öyrətdi Sabir.

Hər şeyin öz adını
Başa saldı o bir-bir.
Kor, donuq baxışlara
Görmək öyrətdi Sabir.

Nifrət öyrətdi Sabir
"Daş qəlbli insanlara" –
Buz tək soyuq qanlara.
Məhəbbət öyrətdi o,
"Fatma, tükəzbanlara".

Bir istiyə bərabər
Qızınmaq öyrətdi o.
Bir soyuğa bərabər
Üşünmək öyrətdi o.
Hər kəsə özünü yox,
Hamıya bir mətləbi
Düşünmək öyrətdi o.
O öyrətdi nobellər
Obasından baş alıb
Bura niyə gəlibdir?
Çaqqal dağdan arana
Hansı iyə gəlibdir?..
O öyrətdi niyə biz
Yadlar üçün bu qədər
Cazibədar olmuşuq,
Niyə yadı bəzəyib,
Özümüz xar olmuşuq?..

Balaca körpələrə
O öyrətdi ayıqlıq,
O öyrətdi sayıqlıq.
O öyrətdi vətənə,
Doğma elə sədaqət.
O öyrətdi dəyanət!
O söylədi: "Yaşasın
Şəhriyari-hürriyyət!"

O, bircə il dərs dedi
Bu "Ümid" məktəbində.
O, şeirilə beşcə il
Bütün Şərqə dərs deyib
Özgə məktəb yaratdı.
İlhamından, təbindən.
O, gülüş arxasından
Damcılayan göz yaşı! –
O – bizim şeirimizin
Ən böyük vətəndaşı!..

## 5. AMAL

*"Seyli-tən oylə təməvvücə alıb dövrü bərim –*
*Bənzərəm bir qocaman dağa ki, dəryadə durar".*

***Sabir***

Deyirlər, naşiri şeirləriçün,
Ona pul ayırdı on manat ayda.
Ancaq qəzəblənib nəyəsə bir gün,
Bu az məbləği də göndərmir daha.

Axır ümidi də kəsilir tamam
Dayanmır, o yanır,
Yaradır yenə,
Coşur, əzildikcə daha da ilham,
Həqiqət naminə, düzlük naminə!
şeirinin, sözünün müqabilində,
Onun mükafatı hücumlar oldu.
Yalan danışmadı, onun dilində
Həqiqət əbədi bir şüar oldu.
Təhqirdən, təhdiddən hər saat, hər gün

Onun sinəsində neçə ox yanıb.
Sənət yollarında bir amal üçün
Bizmi çox yanırıq, omu çox yanıb?

Biz hara gedirik, gül, çiçək, alqış,
O, hara gedibsə, min təhdid, hədə.
Bizimtək hörmətlə qarşılamamış,
Qəlbini gizlədib onu sevən də.

Özünü hörmətə layiq sanmadı,
Böyük qəlb xidmətə əvəz istəməz.
Hörmətlə, izzətlə qarşılanmadı,
Ən böyük hörmətə layiq olan kəs.

O, amal yolunda mücahid oldu.
O, nə pul tanıdı, nə alqış bildi.
Əzəldən ürəyin alovu, odu,
Hansı məbləğ ilə qiyas edildi?..

Yox, yox! İlham ki, var, könül atıdır,
Çapacaq həmişə o, harın-harın.
Öz qəlbinin səsi mükafatıdır,
Bir amal yolunda yaradanların.

Amal! Həqiqətin səsidir ancaq,
Onu boğ! Sinədə dayana bilməz.
Haqqı, ədaləti ayaqlayaraq,
Oda da atsalar o, yana bilməz!

İlham da amalın, məsləkin oğlu,
Amalın var isə, ilhamın da var.
Hünərlə açılar sənətin yolu!
Amalsız ürəkdə ilham yas tutar!
Sənət fədakarlıq, sənət cəsarət,
Sabir möhkəm durdu məslək atında.
Nə pul, nə mükafat, nə şan, nə şöhrət!
Ölçüsü amaldır istedadın da...

Bir amal eşqinə yaratdığından,
Dalğalar içində o, dağa döndü.
Elə ucaldı ki, o böyük insan,
Şərqin hər yerindən Şərqə göründü!

## 6. DƏRMAN

*“Arizi qəmlər əlindən ürəyim şişmiş idi...”*
***Sabir***

Sabirin “arizi qəmlər əlindən”
Ciyəri dağlandı, ürəyi şişdi.
O ürək dünyanı dərk edən gündən
Nə qədər cəfaya tab eyləmişdi.

Ən kiçik dərdi də azı min kərə,
Saldı ürəyinə hər saat, hər gün.
Qəlbinə saldığı sonsuz dərdlərə
Daş dözə bilməzdi, ət necə dözsün?..

Tiflisi dolandı, Bakıya gəldi,
Özünü göstərdi çox həkimlərə.
Hamısı toplandı, məclis düzəldi,
Yozdu xəstəliyi hərə bir yerə.

Həkimlər düşündü hey dərin-dərin,
Davalar, dərmanlar vermədi fayda.
Həkimlər bilmədi, dərdli şairin
Dərmanı tapılmaz əczaxanada.

Həkimlər bilmədi, bir xəstəliyin
Səbəbi həmişə eyni deyildir.
Həkimlər bilmədi, dərdli şairin
Dərmanı – azadlıq, loğmanı – eldir.
Həkimlər, həkimlər, sizdən əlhəzər!
Dərmanınız eyni, nüsxəniz eyni.
Yüz nədir, min nədir, neçə min yaşar,
İnsana versələr istədiyini!

Neçəniz bir yerə hey toplaşdınız,
Əlac tapmadınız bir dərdə yalnız.
Sabir təkbaşına arzularından
Yazdı milyonların dərdinə dərman!

*Bakı, yanvar-fevral, 1962*




*Həkim dostum Cavanşir!*
*Bəşərin cismani ağrıları siz həkimlərin, mənəvi ağrıları isə qələm sahiblərinin ürəyindən keçir.*

## PROLOQ

Dodağımda:
        "Beynəlmiləl" nəğməsi,
Qulağımda: hələ də
        Əzilən millətlərin
        Zəncir səsi,
        ah səsi...
Qarşımda:
        qoca Hemin[1]
        Dünyadan "Şikayəti".
        Başımda:
        Əsrimizin
        ağırlığı,
        siqləti...
Başımın üstündəsə:
        Allahlara kar olub,
        İnsanları eşidən,
        İldırımdan od alıb
İnsanlığa bəxş edən,

Qartalın pəncəsində
Köksü qanlı Prometey.
(Nə üzündə əzab var,
Nə dilində bir giley).

[1] Heminquey

Xəyalımda,
        Əhrimənlə Hörmüzün
        Əbədi mübarizəsi...
Bir də... bu qayğılardan
        Ayrılmaqçün,
        Xəyyamın
        Şərab dolu kuzəsi...
Düşünürəm...
        Nə olsun,
Məndən dərin düşünmüş
Məndən ağıllı başlar.
Bir fayda verməmişdir
Düşüncələr,
        qorxular,
        həyəcanlar,
        təlaşlar...
Dünya nemətlərindən
İlham düşdü payıma.
Yenə az-çox dünyanı
Dərindən
        görmək üçün
İlham çatdı hayıma.
Bu ilham,
        bu xəyalla
Dolandım
        səhər-axşam
Başına dünyamızın.
Gördüm:
        Günün,
Zamanın
Əməlləri
        Yaraşmır
Yaşına dünyamızın.
Çox qocadır ərzimiz
Ancaq,
Başqadır bizim
Ərzimizə ərzimiz.

Tarixdən də qocadır,
Zamandan da qocadır,
Ancaq qocaman deyil,
Onu belə qocaldan
Vaxt deyil,
Zaman deyil.
Bir kainat əks olur
Bəzən bircə qətrədə.
Bir damlada,
gilədə.
O, necə qocadır ki,
Dərk edə bilməmişdir
Öz-özünü
        hələ də.
Tələ quran dünyanın
Özü bu gün tələdə!..
İndi...
Sonsuzluqlara
Dikib
Gözünü dünya.
Boşluqlarda axtarır
Bəlkə
        özünü dünya?..

Radiolar bu gün verir
Bizə dünya xəbərləri –
Təzə dünya xəbərləri.
Açır bizim önümüzdə
        kitab kimi
Qitələri,
Şəhərləri..
Yəqin sabah verəcəkdir
O, kainat xəbərləri:
Ulduzlardan danışacaq
Ora uçaq,
        bura uçaq!
Ulduzların arasında çəkiləcək

Körpülərdən danışacaq.
Radiolar bu gün verir
Bizə dünya xəbərləri-
Təzə dünya xəbərləri:

**Birinci xəbər**

Günün günorta çağı
Prezidenti vurdular.

*Rücu:*

Qəzetləri
gümanla,
şübhəylə
doldurdular.
Ayaq açıb şübhələr
Adamların dalınca
İlan kimi süründü.
Amerika
Başdan-başa
Qara şübhəyə döndü.
Bürüdü
ştatları
şəhərləri
Həyəcan.
Cinayət axtaranlar.
Əsl canidən özgə
Şübhələndi hamıdan.
Yazdı hüquqşünaslar.
Hərə öz gümanını
Yazdı,
bildi həqiqət.
Şübhə qaranlığında
İtirildi həqiqət.
Neçə dəfə,

Yalançı
Məhkəmələr quruldu.
Cani,
Yerlərin deyil,
Göylərin sirri oldu.
Aya,
Ulduza gedən
Sirli yollar tapıldı,
caniyə tapılmadı.
“Gördüm” deyən olmadı.
Oğul istər,
Bu sirrin
        dənizinə baş vurub
        qəvvas kimi üzəsi!
Bu da
        əsrin,
                zamanın
Bir özgə möcüzəsi!..
Uydurmanın,
Riyanın
Gah əskilən,
        gah artan
Hüdudsuz arşınıyla
Həqiqət ölçülərmiş...
Bir nadanın əlində
Prezident də ölərmiş!..

## İkinci xəbər

Yenə Çində “inqilab”.
Bəli,
        böyük bir ölkə
Düşübdür böyrü üstə.
Əqidələr cürbəcür,
Adamlar dəstə-dəstə.
Çıxıblar yollar üstə...

*Rücu:*

Qəfləti qasırğadan
Sınmış şüşələr kimi,
Könüllər – çilik-çilik.
Mədəniyyət adına
Hərc-mərclik,
vəhşilik!..
Mao deyir “allaham,
Gərək bu yer kürrəsi,
Mənim rəyimcə dönsün.
Mən nə düşünürəmsə,
Hamı elə düşünsün...”
Deyir, sənin yerinə,
Görürlər,
düşünürlər.
Yeddi yüz milyon cana
İki göz,
bir baş
yetər!..
Sən düşünüb
boş yerə,
Ağlına güc vermə, gəl!
Ən ağır yükdür ağıl.
Sən onu gəzdirmə, gəl.
Zamana bax,
Dərdə bax!
Ağır silahlar susub
Ağıllar döyüşəndə.
Yeddi yüz milyon ağlı
Bir ağıl salmaq istər
Bu gün,
qıfıla,
bəndə!..
Mümkünmü?
Yox!
Yaxşı bax!

Yaman yetişib zaman.
Döndərmək çox çətindir
Onu öz axarından.
Axar su kir götürmür.
Düşüncələr, ürəklər
Daha zəncir götürmür.
Mao,
Dünən sən özün,
İnqilab etmədinmi?
Azadlıq şüarıyla
Çini tərpətmədinmi?
Vətən sənin şəninə
Qoşduğu nəğmələrdə
Dedi: – Sən inqilabçın,
Azadlıqçın doğuldun,
Bəs bu gün azadlığa
Sən niyə qənim oldun?
Məni yaradıb
                    özün,
Mənim düşmənim oldun.
Nə qəribə zamandır
İnsan,
Gül də verirmiş
Dünən daş atdığına.
Bir gün,
          düşmən olurmuş
Özü yaratdığına!..

## Yazıçı Lao-Şenin son sözü

– Yatdıq boz səhrada, quru yerdə biz,
İllərlə yaşadıq səngərlərdə biz
Bilmədik rahatlıq, dinclik bircə gün.
Vuruşduq,
Qan tökdük bu günlər üçün.

Xalqın cəsarəti,
kini,
nifrəti.
Od oldu,
Yel oldu,
Tüğyana gəldi.
Özümüz yaratdıq bu cəmiyyəti,
Bu gün özümüzə düşmən kəsildi.

Haqsızlıq önündə səf çəkib durduq,
Məgər bu günçünmü biz vuruşurduq?
Çətməyə saldılar eşqi, ilhamı,
Bir cürə düşünsün dedilər, hamı.

*Rücu:*

Baxa da bilmirəm,
lap zəhləm gedir,
Mənim inkubator cücələrindən.
Hamısı bir rəngdə, bir biçimdədir
Seçə də bilmirsən biri-birindən.

Hamının əynində toxunma paltar,
Şişburun çəkmələr ayağımızda.
Ucalır yol boyu eyni binalar
Kibrit qutusutək sol-sağımızda...

Qəzet, kitabdan da gəlmişik cana,
Eynidir cümlə də, eynidir söz də.
Eyniyyət içində ürək bir yana,
Vallahı, yoruldu gözlərimiz də.

Fəlakət, bədbəxtlik, dərd ondadır ki,
Yaşadıq beləcə can güdə-güdə.
Fikri də,
hissi də,
biz paltar kimi
Dükandan alırıq eyni ölçüdə.

Azadlıq naminə qan tökən də biz,
Bu gün azadlığa sədd çəkən də biz.
Belə yaşamaqdan axı nə məna?
Deyə tapançanı sıxdı alnına...

**Üçüncü xəbər**

VYETNAMDA MÜHARİBƏ

Rücu:

Vyetnam, bu əzmi sən hardan aldın?
Bu əzmə, qüdrətə heyrandır cahan,
Dünyaya səs salan bir əjdahanın
Önündə dağ kimi necə durmusan?
Pentaqon düşündü,
Vuruşdan əvvəl
Yüz ölçdü, bir biçdi hər şeyi təkrar.
Sənin qüdrətini, sənin əzmini
Dəqiq maşınlarla hesabladılar.

Pentaqon düşündü döyüşdən qabaq:
On min neyləyəcək neçə yüz minə?
Maşın ömür kəsdi altı ay ancaq
Sənin iradənə, sənin əzminə.
Ağalar, maşına qəzəblənməyin,
Cansız rəqəmlərin nə günahı var;
Əzmi, iradəni özünüz deyin,
Necə hesablasın cansız maşınlar?

Maşın vara bilməz bu incəliyə,
Maşın zoru ölçər,
Gücü hesablar.
Maşın nə bilsin ki, "mən haqqam" – deyə,
Coşan ürəklərdə nə boyda güc var...
Deməyin günahkar maşınlar oldu,
Artıq sizin üçün işləmir zaman.

Maşın nə bilsin ki, bir ürək odu
Min qat qorxuludur yüz-yüz bombadan.
Haqqını dərk edən özünü anlar,
Bunu məndən yaxşı Pentaqon bilir.
Haqqın gözlərilə güllə atanlar
Nə qüvvət tanıyır, nə qanun bilir.

Dananq cəngəlliyi,
                    Gecə tən yarı...
                    Qoca bir qarı
Hərbi bazalara gedən yolları
Dolanır birbəbir, gəzir birbəbir.
Cızıb sinəsini xəritə çəkir...
Köksə köçürülür cığırlar, yollar.
(Burda yada düşür qədim nağıllar).
Özünü yetirir o, cəngəlliyə.
Mən də bu cığazı bacardım! – deyə
Bir xəritə kimi açır köksünü.
Qoca bir qarıda bu qədər belə,
Şücaət, iradə bəs hardan oldu?
Deyərdim, ən aciz adamlar belə
İnamın gücünə qəhrəman oldu.

Vyetnam təpədir, düşməniysə dağ.
Deməyin bu qüdrət ona bəs hardan?
İnamdır,
                    inamdır,
                    inamdır ancaq.
Onu döyüşlərdən qalib çıxardan.

Vyetnam, qüvvət də, haq da səndədir,
Sənin bütün gücün əqidəndədir.
Güclüsən min dəfə öz düşmənindən,
Çünki o haqsızdır, haqsan amma sən.
Korun duyğusu da ona göz olar,
Əgər eşqi varsa, inamı varsa.
Gücsüzün bir gücü dönüb yüz olar
Özünə, haqqına o inanırsa.

Səhhətin qədrini yataqda bimar
qalandan soruş.
Azad yaşamağın qədrini ancaq,
zindanda dustaq
olandan soruş.

Azadlıq!
Azadlıq əldən getdimi,
Dünya da xəyala darısqal gələr.
İnsan azadlığı itirən kimi,
Bütün fəlakətlər dalbadal gələr.

Gedər ağızlardan dad da, ləzzət də,
Ağıl da, ürək də gülər arzuya.
Azadlıq olmayan bir məmləkətdə
Həqiqət riyadır, ədalət boya!

İnsan ürəyində kin də, nifrət də
Əbədi köz bağlar, bir anlıq olmaz.
Azadlıq olmayan bir məmləkətdə
Adamlar yaşayar, insanlıq olmaz.

Düşünən beyinlər sönər zülmətdə –
Yalanla həqiqət üzbəüz olar.
Azadlıq olmayan bir məmləkətdə
Düz əyri adlanar, əyri düz olar.

İdrak da boğular, söz də, sənət də,
Ağıl kilidlənər dildə, dodaqda:
Azadlıq olmayan bir məmləkətdə
Nadan başda gəzər, aqil ayaqda.

Bunları apaçıq sən bildiyindən,
Azadlıq yolunda döyüşə girdin.
Axı, azadlığın ləzzətini sən
Qədim tarixindən yaxşı bilirdin.

*Rücu:*

Filin ayağına hələ körpəykən
Zəncirli, qıfıllı qandal vurdular.
Niyə?
Çünki filin gələcəyindən,
Ağır zərbəsindən çox qorxurdular.
Günlər aya döndü,
                aylar il oldu.
Böyüdü,
                bala fil, yekə fil oldu.

O, elə bildi ki, elə sandı ki,
Bəzəkdir, ziynətdir qandallar filə.
Fil elə bildi ki, elə qandı ki,
Dədə, babası da yaşamış belə.

Onu incitmədi bu dustaq halı,
"Yəqin ki, bu mənim haqqımdır" – dedi.
Fil öz ayağında gördü qandalı,
Məhbus olduğunu qana bilmədi...

Zərərsiz heyvandır gördülər bu fil,
Azad elədilər onu zəncirdən.
Ancaq... elə bil ki, o, heç fil deyil,
Bir addım atmadı durduğu yerdən.
"Yeri! Yeri!" – deyə vurdular onu.
Qalxmadı,
Qamçıya başını əydi.
Axı, azadlığın nə olduğunu
Fil hardan biləydi, fil nə biləydi.

Vyetnam, sökülür üfüqlərdə dan,
Sənə arxa durur solun, sağın da.
Həmişə sən azad yaşadığından,
Bilirsən qədrini azadlığın da.

İşığın qədrini sinəsi dağ-dağ,
Gözləri sonradan tutulan bilər.
Azad yaşamağın qədrini ancaq
Həbsdə sinəsi köz olan bilər.

Baş açıq,
Əl yalın,
Ayaqlar yalın,
Amerika əsgəri qaçdı cəbhədən.
Dedi: – Vətənini qoruyanların
Qanını tökməkdə haqlıyammı mən?

Dedi: – Vyetnama gəldiyim ilk gün
Vicdanım təmizdi,
Alnım açıqdı.
Demə, aldadıblar bizi büsbütün,
Həqiqət burada qarşıma çıxdı.

Belə anlatmışdı zabitlərimiz:
Ədalət, azadlıq əsgəriyik biz.
Qədim Vyetnama gedirik bu gün
Onların haqqını qorumaq üçün.

Kimdən?
Çox düşündüm bu sualı mən.
Sonra başa düşdüm:
            Öz-özlərindən!..
            Millət bir,
            Vətən bir,
            hava bir,
            su bir.
            Yol iki,
            söz iki,
            təriqət iki.
Qardaşı qardaşa düşmən edibdir
Bir ana torpağın iki məsləki,

Bir böyük məmləkət, qanammıram mən,
Saxta kağızlara necə büküldü?
Qara siyasəti Ağ evin, dünən
Bir xalqı, bir yurdu ikiyə böldü.
İnsan bəd ayaqda hər şeyi anlar,
Qılınc kəsə bilir bəzən qında da.
Mən burda ilk dəfə gördüm,
                    yalanlar
Olurmuş həqiqət paltarında da.

Ax, rəngli cümlələr, boyalı sözlər,
Abırlı
            ismətli,
            həyalı sözlər.

Mən görə bilmədim o zaman neçin,
Arxanızda duran o haqsızlığı?
Bircə mənası var dedim hər sözün
Mən seçə bilmədim qaradan ağı.

Mən indi bilirəm, bilirəm artıq
Nədir əsl həyat,
Əsl azadlıq!
Biz ağ yalanlara çox uymuşuq, çox,
Deməyin dərisi qalına vay, vay!

Deyin, həqiqətin paltarını yox,
Özünü görənin halına vay, vay!

Sözün bəzəyini, saxta zərini
Mən indi görürəm, təcrübəm ki, var.
Böyük cənabların dediklərini
Tərsinə çevirsən həqiqət olar.

Onlar "silahları ləğv edək!" – deyir
Onlar silahlanır gizlində ancaq.
Heç kəs bir-birinə könül verməyir.
Söz alıb söz verir hey qucaq-qucaq.

İnamlar naminə söz yığın-yığın,
Bağlanır birbəbir müqavilələr.
Deyirəm, əslində inamsızlığın
Ən böyük rəmzidir müqavilələr...
Cənablar “silahlar məhv olsun” deyə,
Bir-bir imza atır müqaviləyə.
Danışıb gülürlər lap şirin-şirin,
Gülüşlər dalında işlər gizlənib.
Qalxıb görüşürlər...
                    bu görüşlərin
Dalında qıcanan dişlər gizlənib.

Ax, niyə, ax, niyə bunları bildim?
Mən diri ölüydüm,
                    bilib dirildim.
Bildim...
Ax, bu yükü götürmür ürək.
Bildim...
Nədən ötrü?
                    De, kimdən ötrü?
Əgər bilməsəydim...
                    başqalarıtək,
Mən də yaşayardım bir insan ömrü...

Yalana, böhtana biz çox uymuşuq,
Deməyin dərisi qalına vay, vay!
Deyin, həqiqətin paltarını yox,
Özünü görənin halına vay, vay!

Hər gün bir ölkədə qopur vəlvələ,
Zalimlər, zülümlər gəldi-gedərdir,
Bəşərin tarixi – qədimdən hələ
Azadlıq yolunda çəkişmələrdir.
Azadlıq alınar, yaddan umulmaz,
Azadlıq verilməz ərməğan təkin.
Verilən azadlıq azadlıq olmaz,
Başqa bir rəngidir o, əsarətin.

Şərəfdir ölmək də azadlıq üçün,
Bu məslək dəyməzmi bütün dinlərə?
Deyirəm, eşq olsun dünən və bu gün
Azadlıq yolunda can verənlərə!

Azadlıq – həyatın ən parlaq gözü,
Azadlıq – ən uca, ən şanlı bayraq.
Azadlıq arzusu, azadlıq sözü
Dünyanın ən böyük dinidir ancaq.

Azadlıq – cəsarət, azadlıq – hünər.
Azadlıq əsgəri heç əyilərmi?!
Bütün xalqlar üçün azadlıq qədər
Böyük bir səadət ola bilərmi?

Məzlumun yurdunda bostan əkibdir,
Zülmü öz içində qocaldan ölkə.
Bu gün azadlığa qılınc çəkibdir,
Azadlıq heykəli ucaldan ölkə.

Bəs o, necə danır axan qanları?
Bu saxta rənglərdən, de, nə götürdük?
Daim həqiqətdən dəm vuranları
Həmişə biz belə yalançı gördük.

Mən "hayıf" demərəm tutub əlini
Azadlıq yolunda axan qanlara.
Alqış! Azadlığın tunc heykəlini,
Qəlbində yaşadan mərd insanlara!

## Dördüncü xəbər

Cənab Conson narahat,
Ledi Conson narahat –
Amerikada oğurluq,
Artır,
Artır
hər saat.

*Rücu:*

Xırda oğurluqların
Törətdiyi cinayət,
Böyük oğurluqların
Dəhşətindən ağırmış...
Xanım Conson
Ölkənin
Kübar xanımlarını
Məşvərətə çağırmış:
– Kimdir burda günahkar?
– Neyləmək?
– Bir-bir deyin,
Kimin nə təklifi var?
– Qaranlıqdır küçələr,
İşıqları çoxaltmaq!
– Bəlkə... valideynlər...
– Yox-yox! Nə danışırsan
Günahkar əsrimizdir,
Qızışıbdır beyinlər...
Söz verilir Ertaya –
Zənci müğənnisinə:
– Gərək bütün ürəklər
Vicdan, insaf odunun
Atəşinə isinə.
Varmı bizdə bu vicdan?
– Erta, nə danışırsan?
– Mən nə danışdığımı
Bilirəm...
qulaq asın.
Kim istər,
öz ölkəsi
Yad əllərdə talansın?
Ölkəmizin içində
Oğurluğa dözməyib,
Qanunu bərkitmişik.
Ancaq yad ölkələrə
Oğurluğa getmişik!

**Beşinci xəbər**

Cənab Conson
Görk üçün
Əmr edir qəzetlərə:
“ – Bildirsinlər Ağ evin
Növbəti xəbərini:
Prezident çəkinmədən
Vyetnama göndərir
Öz qızının ərini”

*Rücu:*

Tez yayır bu xəbəri
“Amerikanın səsi” də:
“Ədalətin naminə”
Vyetnamda döyüşür
Consonun yeznəsi də.
Yazdı başqa qəzetlər:
“Bu da prezidentin
Əzmidir,
Hünəridir...”
Ancaq... heç yazmadılar
Vyetnamda döyüşən
Consonun tək qızının
Səkkizinci əridir...

Çox da ata göndərir,
Bu gedər gəlməz yola
Razılaşdı nədən qız?
Doqquzuncu,
Onuncu
Ərlərə getməzmi bəs
Səkkizinə gedən qız?..

## EFİRDƏ DÖYÜŞ

Düyməni burursan,
Efirdə səslər...
Qarışıb dolaşır biri-birinə
Bir ölkə havadan hey axşam-səhər
Böhtanlar yağdırır özgələrinə.

Əvvəllər beləydi:
durub döş-döşə
Çıxardı düşmənlər açıq döyüşə...
Qılıncda parlardı qəzəb, ədavət,
Bu açıq döyüşdə sözə nə hacət?
Arxadan vurmazdı düşməni düşmən,
Həm ölən kişiydi, həm də öldürən...

Dəyişdi dünyanın köhnə əhvalı,
Artıq bu adətlər qocaldı, getdi;
Koroğlu demişkən: “Tüfəng çıxalı,
Mərdlik də dünyadan baş aldı getdi...”
Bu gün, bu əsrdə biz nahaq yerə
Vəhşilik demirik bu adətlərə.
Deyirik, məhv olsun ədavət gərək,
Qardaş olmalıdır bütün adamlar.
Böyük duyğularla yaşasın ürək,
Axı, qan tökməkdə nə yaxşılıq var?

Ancaq dərd odur ki,
ədavətin də
Özü məhv olmadı, sözü dəyişdi;
Xain ürəklərdə,
qəzəb də,
kin də,
Astarı saxladı üzü dəyişdi.
Qan tökmək qanunla yasaq olandan,
Qanları qaraltmaq dəb olub yaman!..

İnqilab elədik, zülmü devirdik,
Uymadıq zamanın min qəzasına.
Biz mərdü mərdanə döyüşə girdik,
Haqsızı çatdırdıq öz cəzasına.

– Bəs onda?..
Bilirəm, nə soracaqsan,
Nədir bu yaltaqlıq, ikiüzlülük?
Əfsus! Öz yoluyla gedirkən zaman,
On safı korlayır bəzən bir çürük...

Dəyişir sonunu hər şey, diqqət et
Dəyişir adətlər, qanun-qaydalar.
İndi ədavətin başında beret,
Üzündə təbəssüm, əlində gül var.

Baxırıq keçmişə indi uzaqdan,
Araya illərdən dağ endirmişik.
Kinin, ədavətin əyninə çoxdan
Mədəniyyət donu geyindirmişik.

Təhsillə, sənədlə sanırıq ki, biz
Çatmışıq ən ali mədəniyyətə.
Ancaq qıcqıranda əsəblərimiz,
Məhəbbət bir anda dönür nifrətə.

Qəzəbli anlarda
İnsan büsbütün
Dəyişir, alçalır,
(gözlərdən iraq...)
O, öz mənliyini böyütmək üçün
Dediyi "mən"lərlə kiçilir ancaq.

Arxada "filankəs alçaqdır" deyən,
"Alçağın" üzünə irişir indi.
Açıqca döyüşə girə bilməyən,
İmzasız məktuba girişir indi.

Yazır ki: "Oğrudur filan, filankəs",
Yazır ki: "Onların gözü tox deyil".
Hamıdan yayınıb gizli-gizli bəs
Özgəyə gor qazmaq oğurluq deyil?

Özgəyə xəlvəti quyu qazanda,
Söylə, öz-özündən utanmadınmı?
Öz dəsti-xəttində sən "K" yazanda
Kişilik sözündən utanmadınmı?

Qələm gələcəyə yol göstərəndir,
O ki, yaranmayıb böhtanlar üçün.
Qələm könüllərdən çiçək dərəndir,
Ona yaraşarmı gor qazmaq bu gün?
Düşün babaları:
Müdrik sözləri
Yurdun dövlətidir, elin varıdır.
Qobustan dağında qılınc izləri
Düşmənə imzalı məktublarıdır.

Düyməni burursan,
Efirdə səslər...
Qarışıb dolaşır biri-birinə;
Bir ölkə havadan hey axşam-səhər
Böhtanlar yağdırır özgələrinə.

Amerikanın səsi,
Bi-bi-si,
Pekin...
Dinməmiş bilirsən nə deyəcəkdir.
Dolub qulaqları bəşəriyyətin –
Axı, bu yalanlar kimə gərəkdir?

Biri digərinə "zülümkar" deyir,
Özü də bilir ki, yalan danışır.
Zalım öz gözündə tiri seçməyir,
Özgə gözündəki qıldan danışır.

Efirdə qarışıb səslər səslərə,
Yalanlar titrəyir,
Əsir havada.
Bir mətləb səslənir gündə min kərə,
Sözlər bir-birini kəsir havada.

Susun, ey bayquşlar, yazıqdır insan,
Sizdə bir azacıq insaf varmıdır?
Bu bəşər övladı eşq ucbatından
Dünyaya gəlməkdə günahkarmıdır?

İnsanın qayğısı, dərdi cürbəcür,
Ona aman vermir həyəcanları.
Onsuz da qəlbləri təlatümlüdür,
Qoyun qulaqları dincəlsin barı.

Efirdə dəhşətli bir çarpışma var,
Səslər bir-birindən qeylü-qal edir;
Yalan fabrikləri – teletayplar
Hər saat min yalan istehsal edir.
Ölkələr qışqırıb, deyir: "Mənəm, mən!"
Eşidə bilmirik "O da var!" – deyən.

Nigar Koroğludan sordu: – Heç səni
Bir yıxan olubmu, biləydim bunu?
Koroğlu dedi ki: "Gizir Mustafa
Bu gün çaya basdı qoç Koroğlunu".

Daladı qurd kimi bəşəriyyəti,
"Mən!", "Mən!" – deyə-deyə Hitler də bir vaxt.
Özgə hesabına, o, bir milləti
Böyütmək istədi, kiçildi ancaq.

İndi silahları əvəz edib söz,
Boyunlar söz ilə düşür qarmağa.
Böhtanlar yağdırır Bonn, gecə-gündüz
Çalışır haqsızı haqlandırmağa.

Hakim masasında zor aldı qanun
İttiham eləyir vicdanı, arı,
Dünya təmtəraqlı səhnədir,
onun
Yalandır, böhtandır rejissorları.

Namərdlər ağzında haqq çilik-çilik
Doğranıb səpildi efirə yerdən...
Böhtanlar yurdunda mərdlik, kişilik;
Baxır adamlara abidələrdən...

**Beyin axını**

Amerikanın qızılı var,
Dolları var.
Bu dolların gücünə də
Uzaq, yaxın ölkələrə
Gizli-gizli yolları var.
Ölkələri deyil yalnız
Gözəl-gözəl duyğuları,
Dərin-dərin fikirləri,
Zəncirlərə sala bilən
Güclü-güclü qolları var.
Alır, satır o, hər şeyi –
Şirin-şirin diləkləri,
Beyinləri,
Ürəkləri...
O, suları bulandırır
Qızılların şəfəqilə.
O, gözləri qamaşdırır
Ağızları sulandırır.
Tələsinin qırmağına
Quyruq taxıb
Asiyanı dolandırır,
Afrikanı dolandırır...
Bəzək vurub

O, “azadlıq heykəlinə”.
İngilisin barmağını
Çoxdan kəsib,
Calaq edib öz əlinə.
Xırda-xırda ölkələrə
Layla çalır.
Siyasəti hamarlayıb,
Xəyalları tumarlayıb
Fikirləri tora salır...
Afrikadan,
Asiyadan,
Avropadan
Amerikaya ağıl axır, beyin axır.
Yüz-yüz axır,
Min-min axır...
Beyinləri xammal kimi daşıyırlar
Qalaq-qalaq.
Onu sataq,
Bunu alaq!..
Dili bağlı,
Qolu bağlı,
Köksü dağlı millətlərin,
Təkcə varı, sərvəti yox,
                    hissi,
                    fikri,
Düşüncəsi talan olur.
Həqiqətin doğru, düzgün tərcüməsi
Yalan olur.
Neçə-neçə ildən bəri
                    beyinləri
Bir dollara dəyməyənlər,
Alır, satır
Fikir dolu,
Əməl dolu,
İşıq dolu
                    beyinləri.
Söz qudurub haqqı danır,
“Həqiqəti” təmsil edən,

Qanun saplı baltalarla
Haqqın başı parçalanır.
Bu qanunlar layla çalır
Millətlərə bələyində,
Yalanların başı durur bir ölkədə,
Əlləriysə gəzir başqa bir ölkənin
ürəyində...
Millətlərə xeyirini, zərərini
O göstərir,
Qanun əkib,
Qızıl dərir.
Amerikaya beyin axır,
əməl axır,
işıq axır.
Bu əməllə, bu işığa
Afrikalı gendən baxır,
Asiyalı gendən baxır.

## ÜSYAN

*Amerikanın Vyetnamdakı müharibəsinə etiraz etdiyinə görə həkim B. Spok məhkəməyə verilmişdir.*

– Neçin axmalıdır uzaq diyarda
Amerika gəncinin günahsız qanı?
Bu qəsdli, qərəzli vuruşmalarda,
Sizdən soruşuram,
ədalət hanı?
Bayquş əməllidir əməlləriniz,
Buna biganədir qanun da, din də.
Neçin xoşbəxtliyi tapmalıyıq biz
Başqa ölkələrin bədbəxtliyində?

Neçin sahibini evdən qovlayaq,
Neçin şəhərlərə od ələyək biz?
Neçin ürəklərə dərd, ələm qoyaq,
Neçin yanaqlara yaş çiləyək biz?

Qorxub cəmiyyətin xəstəliyindən,
Artıq təbabətdən əl çəkirəm mən.
Tək-tək xəstələri sağaltmaq hələ
Deyil əlimizdə o qədər çətin.
Ey həkim dostlarım, verək əl-ələ
Dərdini düşünək bu cəmiyyətin.
Üzüldük,
            düşündük,
                        bilmədik ancaq
Nədir dərmanımız, çaramız bizim.
Biz burda xəstəyik,
                        bilmədik ancaq,
Vyetnamda açıldı yaramız bizim.
Bu sözlər üstündə tutdular onu,
Çəkdi məhkəməyə oğru doğrunu.
Dedilər: – Vətəndaş deyilmisən sən?
Bəs sənin qeyrətin, namusun hanı?
Bizi imdadına səslərkən Vətən,
Güldürdün Vətənə bütün cahanı.
Dedi: – Günahkarı məgər dünyamı?
Kəsir kökümüzü öz əllərimiz.
Billah, gülməlidir,
                        Vyetnamdamı
Vətən qeyrətini çəkməliyik biz?

Bəs onda... hər yerdə deyirik nədən,
Zülmün zəncirini çoxdan qırmışıq,
Biz ki, yurdumuzu dövri-qədimdən
Azadlıq ölkəsi adlandırmışıq.
– Azadlıq! Hər şeyin, axı, həddi var.
– Bizi məhv elədi hədlər, hüdudlar.
– Demək hüdudlara nöqtə qoyulsun?
Həkim, çox böyükmüş sənin niyyətin.
– Yarımçıq azadlıq qoy sənin olsun.
Bütövü gözəldir hər səadətin.
– Həkim, zamana bax, özünü danla,
Görmüşük döşünə çox döyənləri.

Zaman özü udur vaxtla, zamanla
Fikrini kökləyə bilməyənləri.
– Həqiqət boyanın dalında yatır,
Utanmaz-utanmaz böhtan da atır,
Zamana boyalar, vaxta boyalar,
Min dilli boyalar, saxta boyalar,

Gün dedim Günəşə, ay dedim Aya,
Öyündüm xəyali gündüzlərimlə.
Baxmaq istəyirəm, axı, dünyaya
Mən öz gözlərimlə, öz gözlərimlə.
Bir eşqim, min arzum, min diləyim var,
Çalma min ürəyi tək bircə simlə.
Mənə ürək vermə, öz ürəyim var,
Duymaq istəyirəm öz ürəyimlə.

Qoy özünə qalsın bu səfsəfələr,
Mən seçə bilirəm düzü əyridən.
Mənə ağıl vermə, öz ağlım yetər,
Qanmaq istəyirəm öz ağlımla mən.

Vətəni hamıdan çox sevdiyindən
Vətənin düşməni – dedilər ona.
Həmişə... Zindana dönübdür Vətən
Vətənin ən böyük oğullarına.

Gəlin, varaqlayaq keçmiş illəri,
Düşünən başlara qılınc çaldılar.
Danteni,
            Puşkini,
                        Feyxtvangeri,
Hadini Vətəndən qaçaq saldılar.

Haqqı bayraq edən,
                        qədimdən bəri
Batıb iynə kimi gözünə əsrin.
Böyük ürəklərin böyük sözləri
Dəyib sillə kimi üzünə əsrin.

Böhtanlar atıldı, damğa vuruldu
Andı Vətən olan vətəndaşlara.
Bu nədən belədir?
                    Bir hakim oldu
Həmişə boş başlar dolu başlara.

Nədən qarşı qoydu "mənəm" deyənlər,
Cılız mənliyini yüz-yüz minlərə?
Bu nədən belədir
                    düşünməyənlər
Bir düşmən kəsildi düşünənlərə?..
Sual yerindədir.
                    Cavabı: Qorxu!
Boş başlar şübhəylə, qorxuyla dolu!

Zoru bu dünyada haqq sayanların
Ən böyük silahı iftira, böhtan.
Öz nahaq işini anlayanların
Həmişə üşümüş canı qorxudan.

Vuruşmuş, döyüşmüş onlar müttəsil,
Zülmü hədələyən haqqın səsiylə,
Zora güvənənlər, ağılla deyil,
Düşünmüş həmişə əzələsiylə.

Haqqa deyiniblər: – Deyəsən, sənin
Yemin bir balaca artıq olubdur.
Doğru danışanın, doğri deyənin
Papağı həmişə yırtıq olubdur.

Vətəni hamıdan çox sevdiyindən
Vətənin düşməni dedilər ona.
Vətən zindan olub dövrü-qədimdən
Vətənin ən böyük oğullarına.

## QARA-AĞ

*Cərrah Kr. Bernard ikinci ürəkköçürmə əməliyyatını diş həkimi Blayberqin üzərində aparmışdır. Blayberq indi bir zəncinin ürəyi ilə yaşayır.*

İndi deyirsən ki, insandır hamı,
Bəs onda?..
Blayberq, de, yadındamı;
– Dişimi çək! – deyə sənə yalvaran,
Zəncini evindən qovdun o zaman.
Dedin:
– Çəkilməsə dişi zəncinin
Günəşmi sönəcək, Aymı batacaq?
Ayrıdır millətin, ayrıdır dinin,
Mənim pasientim ağlardır ancaq.
O sənə yalvardı,
Rədd elədin sən.
Dedin: – Zəhləm gedir dilənçilərdən.
O getdi...
Sübhədək çəkib əl-aman,
Gözünü qırpmadı diş ağrısından...

Ağlını itirir insan az qala
Zamanın dolaşıq keşməkeşində.
Ağrıyan zəncinin dişiymi?..
                                        Əsla!
Zaman ağrıyırdı onun dişində.
Ancaq... heç bilmədin, heç bilmədin sən
Dünyada çox böyük bəlalar da var.
Çoxları azlara məhkum eyləyən
Zamanın da yaman oyunları var.
İllər düyün-düyün ötüşdü...
                                        Bir gün,
Ürək ağrısından yatağa düşdün.
Sən onda umdun ki, yer üzündəki
Həkimlər tək səni düşünüb ansın.

Yalvardın hamıya əl açıb,
təki
Bir az da, bir az da ömrün uzansın.

Bir günlük ömürçün kim bilir, bəlkə
Sən qurban verərdin ciyərparanı.
Qarşına çıxartdı taleyin yenə
Qapından qovduğun həmən qaranı.

Qapından qovduğun həmən zəncinin
Ürəyi döyündü köksündə sənin...
Zəncinin əməyi,
Duzu, çörəyi,
Böyük duyğularla vuran ürəyi
Sizə gərəkmiş!
Hamının ürəyi, demə, ürəkmiş!..

İndi deyirsən ki, insandır hamı,
Blayberq, Blayberq, bəs yadındamı,
Qapından qovduğun o qara zənci?..
İndi özün de,
Sənmi dilənçisən, omu dilənçi?
Zəncinin ürəyi sənin sinəndə
Vurandan bəri,
Sevməyə başladın, de, bəlkə sən də,
O böyük ürəkli qara üzləri?..

## Dəblər

Restorana gəlmişəm,
Yeyəm,
İçəm,
Həzz alam.
İtmi boğuşdururlar,
Bu nə səsdir, ay balam?..
Orkestr haray salıb,
Yöndəmsiz gurultular

Bir-birindən seçilmir.
Vallah, ağız deyəni
Qulaq eşidə bilmir.
Bəlkə...
            Geri qalmışam –
Əsr çox qabaqdadır,
Mənə uzaqdan baxır?..
Neyləyim ki, bu yönsüz,
            eybəcər gurultular
Beynimə mismar çaxır.
Biz bu kəlmə səslərə –
Bu uydurma,
Bu saxta,
Bu düzəlmə səslərə
Əsrin səsimi deyək?
Mən bilmirəm,
            özgənin
Qabağından qalanı,
Axı, niyə gövşəyək?
Məgər yenilikmidir,
Özünü bəyənməyib,
Özgəni doğma tutmaq?
Geyib özgə çəkməsi,
Yerişini unutmaq?
Başa salın bir məni,
Gözəl nəğmələrimiz
                        var ikən
                        nədən ötrü
Yamsılayaq özgəni!..
Yenilikmi?
Bağışla!
Yamsılamaq – ən böyük
Köhnəlikdir, köhnəlik!
Bizi hara aparır
Bu "yenilik" ədası?
Həndbolun,
Futbolun
Hakimlik iddiası?

Hara olur qoy olsun,
Çörək çıxartdığım yer
Vətənimdir – deyənlər –
Vətənin qeyrətini
Ömründə çəkməyənlər,
Futbol oyunlarında
Dönür vətənpərvərə.
Öyünür əbəs yerə!..
Onun Vətən qeyrəti
Özü kimi saxtadır
Qeyrətinin siqləti
Ayaqlarda sürünən
Futbol ağırlıqdadır.

Nədir bu əyləncələr? –
Dərk edə bilmirəm mən.
Adamlar usanıbmı
Dərin düşüncələrdən?..
Deyirlər, Amerikada
Alimlər baş sındırıb
İnsan üçün
            cürbəcür
Kokainlər,
Tiryəklər,
Əyləncələr
            düşünür.
Neçin?
İnsan fikirdən.
Qayğıdan,
Düşüncədən
Bir az ayrılsın deyə.
Bu dünyadan üzülüb
Özünə dalsın deyə...
LSD – təzə tiryək.
Nəşələnməkçün
                        insan
Ağlın itirsin gərək.

Bircə günlük kef üçün,
Bəzən insan
əl çəkir
Ağlından da büsbütün.
Dərdə bax!
Əl götürür
Düşüncədən, ağıldan,
Ağıl əsrində insan!..
Nəyə gərək düşünmək?
Gül,
Hırılda, nəşələn!
Özünü dərdə salır
Çox düşünən,
Çox bilən!
Əsr buramı gəlmiş?..

İnanmıram buna mən!
Bu gün bu dəb, sabah o dəb.
Bu dəb gedir,
                    o dəb gəlir.
Paltarımız köhnəlməmiş
                    dəb köhnəlir.
Dəb dəyişir, biz açmamış gözümüzü
Bu dəblərə
Uyğunlaşa-uyğunlaşa
İtiririk özümüzü.

Nəğmədə də,
          şeirdə də təzə dəblər...
Dəyişdikcə
                    bu qaydalar,
                    bu ölçülər,
                    bu ədəblər,
İnam itir
Təqlid gəlir,
                    zövq alçalır.
Özümüzdən bəs nə qalır?

Axı, neçin özümüzü
Qurban verək dəblərə biz?
Gəlin, tapaq özümüzü
bir kərə biz!
Hər yetənə baş əyməyək;
Adamda bir sifət gərək,
inam gərək!

Yazıq söyüd!
Nə meyvəsi, nə barı var,
Onunçun da
Nə qeyrəti, nə arı var.
Vüqar ki, yox, "bəli" deyir,
Gah bu yelə,
Gah o yelə!
Ey dəblərə uyan oğlan,
sən də belə!
Öz barın ki, yoxdu sənin,
Vüqarın ki, yoxdu sənin,
Gərək ağzın tez sulana
Özgələrin meyvəsinə,
Öz səsin ki, yoxdu sənin,
Elə dəm tut yad səsinə!...

## Suallar

Nəsimi söylədi: – Allahdır insan,
Onun qüdrətilə dünya bir zaman
Gülüstan olacaq,
Cənnət olacaq!..
İnsanın gücünə inandı...
ancaq,
Bu günsə...
başqadır hökmü zamanın,
Cahanı qorxudur insan fitnəsi,
Atom bombaları – köhnə dünyanın
Başının üstündə barmaq hədəsi.

Elə bil Nəsimi qalxıb məzardan,
Deyir: – Mən güvəndim sənə, ey insan.
Sənin əməlinlə indi söylə bir,
Bu qoca dünyamız bəs hara gedir?

Tolstoy dedi ki: – Bəşər ucalsın,
İnsan öz nəfsinə qələbə çalsın.
Vicdan nəğməsilə boy atsın bəşər,
Yaratsın,
Yaşatsın,
                    yaşatsın bəşər!
İnsan təmizlikdə bənzəsin suya,
Ağıl yoldaş olsun eşqə, duyğuya.
Vicdanın səsinə dəm tutsun əməl,
Dünyanın dərdini ovutsun əməl
Bəşərdən həmişə yaxşılıq uman
O böyük peyğəmbər, o böyük insan,
Yaşayıb görsəydi bu dəhşətləri, –
Yeraltı, yerüstü müsibətləri
Deyərdi: – İnsana dünya dar olmuş,
Əməli başına bir çidar olmuş.
Nədir insandakı
                              bu tamah,
                              bu nəfs,
Dünya bu minvalla hara gedir bəs?

“Qürurla səslənir insanın adı!”*
Deyən
          əsrimizin böyük ustadı,
Güclülər önündə alçalanları,
Yalana, böhtana əl çalanları
Görsəydi, deyərdi: – Bu nə kəshakəs?
Bu qoca dünyamız hara gedir bəs?

Hadi də,
          London da,

---
* M.Qorki

Sveyk də,
Hem də,
Həyata necə də qəlbən vuruldu.
Elə ki, tapdılar nəşəni qəmdə,
Hər biri özünə bir qatil oldu.
Onlar dedilər ki, – əsəblərimiz
Daha dözə bilmir, gərilib simtək.
Könüllü gəlmədik bu dünyaya biz,
Nə olar, dünyadan könüllü getsək?..

Onlar dedilər ki, – bəzən bir günü
İnsan neçə-neçə ömrə dəyişməz.
Daşıya-daşıya ağır yükünü,
Bu qoca dünyamız hara gedir bəs?

İnsana xidmətdə gördü Şveyser
Bütün mənasını, dadını ömrün.
Gəzdi ölkələri, gəzdi birbəbir,
Yaşatdı, yaratdı başqalarıyçün...
Deyir insanlara Şveyser bu gün:
– Özünü düşünür, özünü hər kəs,
Bu qoca dünyamız hara gedir bəs?

Nələrə qadirmiş insan hünəri!..
Səsiylə yarışan təyyarələrin
Gurultusunda
Elə bil düşünür Sent-Ekzuperi:
– Ağıldan, əməldən geri qaldı səs.
Bu qoca dünyamız hara gedir bəs?

Gözəgörünməzdən ummadıq kömək,
İnsanın özüdür – dedik – pənahı.
Yerdə axtarmadıq biz Arşimettək,
Fikrimizdə tapdıq istinadgahı.

Ucaldıq göylərə, baş vurduq yerə,
Güldü üzümüzə göyün qatları,
Mindik maşınlara, təyyarələrə,
Verdik kolbasaya biz Qıratları...

Həmişə irəli!
Geri dönmədik.
Duyduq qəlbimizdə günün səsini,
Ancaq...
            düşünmədik,
                        heç düşünmədik
Qıratın, Bozatın faciəsini...

Nə olar... bir baxsaq keçmişə hərdən,
Düşünək dünyanın qəmini bir-bir.
O qədim, möhtəşəm abidələrdən
Düşən kərpiclərin dərdi kimindir?

Nə qədər güclüsən, ey qadir insan,
Özün bir yanasan, əzmin bir yana.
Nə qədər acizsən, əsir olursan
Özün öz əlinlə yaratdığına...

Nə qədər güclüsən,
                        öləcəyini
Bilsən də
                        işdədir yenə əllərin.
Nə qədər acizsən,
                        qorxudur səni
Öz fikrin,
Öz hissin,
Öz əməllərin!
Gözlə görünməyən bir zərrəylə sən
Bu boyda dünyanı hədələyirsən.

Güclüsən, ən uzaq ulduzun belə
Sirrinə, sözünə vaqifəm – dedin...
Acizsən, ən yaxın dostunun hələ
Qəlbindən keçəni duya bilmədin.
Həm elə güclüsən, həm belə gücsüz,
Ağılda güclüsən, ürəkdə aciz.

## Gəl, ana təbiət

Yorulduq,
bir dayan,
maşını saxla!
Nə qədər yol gedək rezin “ayaqla”?
Səhərdən bu yerə səfərdəyik biz.
Maşın da adamtək yorulur yəqin.
Deyirəm, nə olar ayaqlarımız
Bir az da bu qara torpağa dəysin!

Təkərlər fırlanır.
Yol gedirik biz,
Dikib uzaqlara gözlərimizi.
Təkərlər fırlanır,
addımsız, izsiz
Bu eldən o elə aparır bizi...

Ağappaq yollardan elə bil bu an
Ağ mərcan taxıbdır dağlar boynuna.
Çıxmışıq şəhərin dar qucağından,
Ana təbiətin geniş qoynuna...

Görürsən, ürəyə söz dəyəndə də
Tutulur,
kövrəlir,
küsür hamıdan.
Bəzən adamlardan inciyəndə də
Dağlara, daşlara üz tutur insan.

Söz də xəncər kimi işləyir cana,
Qanı laxtaladır əzab, iztirab.
Şəhərin sözünə, suallarına
Ana təbiətdən umuruq cavab.

Güllərin şəbnəmi, otların şehi
“Gəl, məni duy!...” – deyə bizə göz dikir.
Dağların küləyi, bağların mehi
İncik ruhumuza bir sığal çəkir.

Çalışır, vuruşur nə qədər insan
Adamlar içində yer tutmaq üçün

... Nərgizə baxıram,
Mənə kəm baxan
Nadürüst gözləri unutmaq üçün...

Haçalı dağlara baxıram,
mənə
Qıcanan dişləri unutmaq üçün.
Baxıram üfüqün genişliyinə
Soyuq baxışları unutmaq üçün.

Baxıram sıldırım, daş qayalara,
Yolum üstünə
Atılan daşları unutmaq üçün.
Baxıram dağların dik vüqarına,
Əyilən başları unutmaq üçün.

Gəl, ana təbiət, qovuşum sənə,
Sənin bir parçandır, axı, ilkimiz.
Nolar, əslimizə qayıdaq yenə,
Axı, bu torpaqla bir vəhdətik biz.

Mayam da, südüm də səndədir mənim,
Bu yorğun ruhumu, gəl, dindir mənim...
İlkimiz təmizdir təbiət qədər,
Əmdiyi süd kimi safdır körpələr.

Güllərin şəbnəmi, otların şehi,
“Gəl, məni duy!...” – deyə bizə göz dikir;
Dağların küləyi, bağların mehi
İncik ruhumuza bir sığal çəkir.

Keçidlər adlayıb, dağlar aşdıqca,
Böyüyür anbaan ürəklərimiz.
Ana təbiətə yaxınlaşdıqca,
Dönüb özümüzə qayıdırıq biz.

Yəqin ki, oxuyur quşlar dərədə,
Eşidə bilmirik motor səsindən.
Laləli, nərgizli çəmənlərə də
Baxırıq maşının pəncərəsindən.

Olsaq da torpağa bu qədər yaxın,
Hələ yol gedirik öz yerimizdə.
"Qutular" içində olur,
bir baxın,
Ana təbiətə səfərimiz də...

"Qutular" kiçiltdi ürəyimizi,
Sıxdı bədəni də,
Sıxdı canı da...
Yağışdan, yağmurdan qoruyub bizi,
Aldı əlimizdən bol havanı da...

Hərdən həkimlərin məsləhətilə
Çıxırıq bulvara bir tələb kimi.
Uduruq havanı biz gilə-gilə
Aptekdən verilən sarı həb kimi.

De, düşək,
Qurtaraq benzin iyindən.
Nola bir yel əsib tufan qoparsın.
Dərək bu döşlərin gül-çiçəyindən
Validol iyini bizdən aparsın.

Kiçik otaqlara çəkilib qış, yaz,
Gəzdik dahilərin söz bağlarını
Dedik kitabları qapayıb bir az,
Çevirək çöllərin varaqlarını...
Enişdə, yoxuşda əldən salıbdır
Bizi, bir-birinə calanan yollar.
Elə bil dağları əsir alıbdır
Dağların belinə dolanan yollar.
Yolların önündə baş əyir dağlar,

Dağların qoynunda obalar yeni,
Əyləşib gedirik...
                                indi ayaqlar
Təkərlərə verib vəzifəsini.

Əyləşib gedirik göydə, yerdə biz,
Uzanıb üzürük gəmilərdə biz.
Fikrimiz öndədir həmişə bizdən,
Səyyahıq...
                Xəyal ki, görünmür gözə
Alıb hərəkəti bədənimizdən
Verdik beynimizə, ürəyimizə.

Beynin haqq-hesabı candan sorulmur
Fikirlər qoynunda yol gedirik biz.
Odur, bədənimiz çox da yorulmur,
Yorulur beynimiz, ürəklərimiz.

Min arzu,
Min qayğı,
                                hələ üstəlik,
Dava təhlükəsi,
Atom hədəsi,
İnfarkt, qan təzyiqi!..
                                İki xəstəlik –
Əsrin gərginliyi, əsrin zədəsi!

Düşürük maşından biz gülə-gülə,
Dəyir nəm torpağa ayaqlarımız.
Sükut layla çalır çəmənə, çölə,
Sükut!..
Cingildəyir qulaqlarımız.

Oxqay!
Havaya bax, necə təmizdir.
Burdan qaçaq düşər azar, bezar da.
Bakı canımızdır, ciyərimizdir,
Ancaq... bu havaya həsrətik orda...

Elə bil nur yağır havadan yerə,
Xoşbəxtlik göləndə üzür bu çöllər.
Deyirəm, yəqin ki, burda bir qətrə
Radyaktiv zəhərdən tapılmaz əsər.

Radyaktiv sözündən gözüm qaraldı
Bu söz ağlımı da başımdan aldı
Qopdu ürəyimdən bir yanıqlı səs:
– Qrenlandiyada, deyirəm, görən,
İtən bombaları tapdılarmı bəs?

Sual hamımızı çaşdırdı bir dəm,
Bu təmiz hava da zəhərə döndü.
Dönüb gözümüzdə qaraldı aləm,
Laləli yamaclar oda büründü.

Elə dil dəyişdi hamının rəngi,
Aldı çöhrələri narın bir kədər.
Hava da gözəldir,
                        neyləyəsən ki,
Könül havamızı zəhərləyiblər...

## EPİLOQ

Təzadlar!
                        Təzadlar artır ilbəil.
Zaman öz-özünü necə danır hey.
Gedirik...
            Getdikcə qısalmır bu yol,
Çəkirik... Çəkdikcə dərd uzanır hey...

Bu qədər yazmışam, hələ azdır, az.
Ən böyük, ən dərin söz içimdədir.
Haqq-nahaq,
            düz-əyri,
                        qəm-sevinc,
                                    qış-yaz
Mənim öz içimdə, öz içimdədir.
Mənim ürəyimdə baş-başa durur,

Qorxuyla cəsarət,
Şübhəylə inam.
Biri o birinə min cür tor qurur,
Onlar vuruşurlar...
                    Mən harayçıyam!

Cəsarət – vüqarım, əzmim, hünərim,
Qorxu – mütiliyim, itaətimdir
Özümə düşməndir öz fikirlərim,
Bunlar barışmasa... fəlakətimdir.
Cəsarət qorxunu üstələyəndə,
"Beş adam içində, deyirəm, mən də
Adamam...
          Öz yolum, öz əməlim var,
Axı, niyə qorxum?
                    düz əməlim var..."

Bunu öz-özümə söyləsəm də mən,
Qorxu baş qaldırıb sinəmdə hərdən
Bir ilan kimi
İzləyir hər yerdə cəsarətimi...

Bilmirəm, içimdə baş-başa duran,
Məni gah dindirən, gah da donduran
Bu müdhiş xəyallar,
Bu hallar nədir?
Cəsarət gələndə rahatlıq gedir...
Qorxu hökm edəndə...
                    kiçilirəm mən...
Vicdanım gizlənir xəcalətindən.

Bir də görürsən ki, oyanır vicdan,
Deyir: – Həyatmıdır səni qorxudan?
Axı, neyləyirsən bu çürük ömrü?
Kişi kimi yaşa beş günlük ömrü.
Qorxuyla cəsarət durub döş-döşə
Təzə bir inamla girir döyüşə!

Neçə "mən" yaşayır tək bircə "məndə",
Öldürən də mənəm, axı, ölən də.

Su da özümdədir, od da özümdə.
Dost da özümdədir, yad da özümdə.
Rəhm də məndədir, zülm də məndə,
Həyat da məndədir, ölüm də məndə...

İnsanlar döyüşür biri-birilə,
İnsanlar döyüşür öz-özlərilə.
Yaman döyüş gedir göydə, yerdə də,
Döyüşlər hər zaman girir bir dona.
Utanmaz-utanmaz hər dövrdə də
Yıxırıq günahı əsrin boynuna.

De, kimdir yaradan bu fəsadları?
Döyüşdə yaranır ən böyük söz də.
Əsrin nə günahı?
                    Bu təzadları
Gəlin, biz axtaraq öz içimizdə.
Sonsuz döyüşlərdə həyat yüksəlir,
Bütün yüksəlişlər qovğadan gəlir.

Bəzən bir saatda, bir neçə gündə,
Daşıyır illərin yükünü insan.
Bəzən özümüzü tapmaq üçün də,
Biz keçə bilirik varlığımızdan.

Sükunət...
          Dayanır dilsiz məzarda,
Qəbrin başdaşına ilişib zaman.
Vuruşa-vuruşa
                    bu vuruşlarda
Özünü axtarır həmişə insan...

– Məzarda tapırmı?
– Nə deyim sənə!
Başqa cür yaşamaq son təsəllimiz.
Axı, əslimizə dönürük yenə,
İlkimiz torpağa qarışanda biz...

*1966–1967*




*Tələbələrimə*

1

Bir gün müəlliməm,
Bir gün şairəm.
Daim bir məcazda ola bilmirəm!
Mənim də qismətim beləymiş, demə,
Naşükür deyiləm öz qismətimə.

Yarıya bölünür günüm, saatım,
Vaxt mənim sərvətim, sonsuz varımdır.
Müəllimlik – mənim günüm, həyatım,
Şairlik – ən uca duyğularımdır.

2

İmtahan...
İmtahan götürürəm mən.
Gəlir tələbələr, gəlir birbəbir.
Hər gələn cavanın tərpənişindən
Ağlı, düşüncəsi mənə bəllidir.
Kimi cəsarətlə çəkir bileti,
Kimi qorxa-qorxa yanaşır mizə.
Kimi bildiyindən umur qiyməti,
Kimi də güvənir mürvətimizə.
Kimi nişan alır əvvəldən sonu,
Dediyi mətləbi hiss edir, duyur.
Kimi əzbərləyib oxuduğunu,
Danışmır,
Elə bil kitab oxuyur.

Sözündən özünün xəbəri yoxdur
Cümlələr ütülü,
Sözlər soyuqdur.
Bir il bu sinifdə
bildiklərimi,
Alışa-alışa danışmışam mən.
Onların önündə
bir çıraq kimi
Sözümdən od alıb alışmışam mən.
Məqsədim bir olub:
Bu təzə nəsil
Dünənə güvənsin, bu günü sevsin.
"Özgəni" danmasın,
ancaq, müttəsil
Özünə tapınsın,
Özünü sevsin.
Mənim də kəsirim az deyil, şəksiz,
Dünyanı asmışam əsəblərimdən.
Bircə sözümü də ancaq ürəksiz,
Boğazdan yuxarı deməmişəm mən.

Hər cümləm – dünyada ayaq izlərim,
Köklənib könlümün öz ahənginə.
Könül qaynağında bişən sözlərim
Bürünüb hissimin qızıl rənginə.
Ən böyük fikrimi, sözümü bəzən,
Danışa-danışa yaratmışam mən.

Yanlışı zamanın özü düzəldir,
Fikri də istərəm mən, əlvan-əlvan.
Özünün yanlışı min pay gözəldir,
Özgənin düzünü təkrarlamaqdan.
Könlüm qanadlandı,
Fikrim ucaldı,
Gəncliyin önündə alışanda mən.
Dedim: "Nə" sualı arxada qaldı,
"Neçin"dən yapışın,

İndi “Neçin” dən!
Mən ki, deməmişəm, Loğman Sabirin
Harda,
Hansı ildə
            doğulduğunu.
Demişəm, dilidir o, dərdimizin,
Vətən nədən ötrü doğubdur onu...
İstərəm,
            hər cavan
                        yandığım kimi,
Alışsın!
Məni də yandırsın yenə!
Mənim yana-yana dediklərimi,
Həmən yanğıyla da qaytarsın mənə.

Gəlir, bir çəlimsiz, ucaboy oğlan.
Danışır,
İnam var, inam səsində,
Məsləki görünür baxışlarından,
Ürəyi səslənir hər kəlməsində.
Üzü də tüklüdür...
Baxıram ona.
Gecəni yatmayıb, şişib gözləri.
Mənim gəncliyimi andırır mənə
Əsəbi görkəmi, yanıq sözləri...
“-Siz belə dediniz, filankəs belə,
Filan alimlərsə... deyir filan cür.
Mənim fikrimcəsə...”
Bu fikrin hələ
Bişməyib.
Mənəsə gözəl görünür.
Niyə?
Soruşsana...
            Gün təzələndi.
O səni gözləyir, sən sabaha bax...
Biz öz sözümüzü demişik, indi,
Bu meydan sizindir, sizindir ancaq!

Mənim yana-yana dediklərimi,
Sən mənə qaytardın bu gün ayrı cür.
Sən səcdə qılsaydın mənə büt kimi,
Mən sonsuz olardım,
Şükür,
Çox şükür!
Bir təzə rəng verdi o, hər mətləbə.
Bu böyük zəfərdir,
Bu ki dərd deyil.
Şagird,
Ustadından neçə mərtəbə,
İrəli getməsə...o, şagird deyil.
Mən bu tələbəyə nə yazım indi?
Qələm kağız üstə gəzdi, sevindi...
Yazdı qiymətini o özü!
Mən yox!
O, rəngdən rəngi yox, ətri götürmüş.
Meyvədən danışdım mən ona ancaq,
O, könül gözüylə toxumu görmüş!..

Saçları çiynində, mini yubkalı,
Gözləri sürməli birisi gəldi.
Bileti çəkincə dəyişdi halı:
-Bilmirəm... – deyərək yola düzəldi.
"İki"ni yazımmı?
Məgər bununla
vəzifən bitirmi?
Yox!
Dayan, yavaş!
Başının çölünü bəzəyincə o,
Başının içini bəzəyəydi kaş!
Təzədən çağırdım,
Dedim: – Bilet çək!
Çəkdi.
İki kəlmə danışdı,
Qalxdı.
O ki var danladım.

İndi neyləmək?
Durub matdım-matdım üzümə baxdı.
Yazdım “iki”sini...
                    çətin,
                    çox çətin!
Tələbə bilmir ki,
     Müəllimlərin,
Yazdığı hər “iki”,
          Min sual kimi
Onun yuxusuna girir,
          Söz sorur.
“İki”lər hər biri, qara xal kimi
Onun məsləkində qaralıb durur.

Çox inamla gəlir tapşırılanlar
Özündən razıdır,
Adından əmin.
O elə baxır ki,
               guya borcu var
Onun dədəsinə mənim dədəmin...
Beləcə, birisi durub önümdə
     döyür gözünü.
İşarır...
Bu gizli işarəsiylə
                    Deyir sözünü...
Bileti əlində, işarır yenə,
Demək istəyir ki, “tanıyın məni”.
Suallar dalında cavab yerinə
Görür tanışının “əzəmətini”.
O başa düşür ki, hirslənmişəm mən,
Deyən, bu xınadan deyil o xına.
Əl çəkir o arsız təbəssümündən,
Əlini astaca qoyur alnına.
Düşünür.
Köməyi umur başından.
Başında nə var ki, köməyə gəlsin,
Qoparıb bir-iki söz yaddaşından,

Danışır: “Baxanda görürük...”
    Çətin!
Danışır mənasız,
Danışır hədər.
Bayaqkı vüqarı çöküb diz üstə.
Yarımçıq cümlədir, qırıq kəlmələr,
Əriyib toz kimi düşür miz üstə.

Qırıq kərpiclərə bənzəyir sənin
Sönük cümlələrin, qırıq sözlərin.
Qırıq kərpiclərlə ev tikmək sənə
Asanmı görünür?
Dayan, düşün bir.
Kərpiclər hərəsi baxır bir yana,
Niyə bir-birinə yapışa bilmir?
...Dili topuq çalır,
Rəngi ağappaq...
Oğlan xırdalanıb yumağa dönür.
Əlində tutduğu kiçik bir varaq,
Onunçun əlçatmaz bir dağa dönür.
Tərəzi qurmuşam sual-cavabdan
Bir gözdə suallar,
Bir gözdə oğlan.
O baxdı üzümə dilsiz, ağızsız.
Danladım,
        dinmədi,
                o, qulaq asdı.
Bu boyda vücudu, bir varaq kağız
Gör necə kiçiltdi,
                gör necə basdı...
Qiymət verməliyəm mən ona indi,
O öz qiymətini özü bilmədi.
Günün doğuşunu dan yerində yox,
Axtardı xırdaca çöp işığında.
O öz qiymətini, dəyərində yox,
Gördü özgələrin tanışlığında.
Ona deyən yoxdur hanı mənliyin?

Sən özün özünü niyə danırsan?
Öz gücünə deyil,
                    a bədbəxt, neçin
Özgənin gücünə arxalanırsan?
Gəldin tapşırıqla!
                    Heçsən, demək, sən.
Mənliyin kiminsə kölgəsindədir.
Əgər sən varsansa...
                    Keçib özündən,
Özünü bu qədər alçaltmaq nədir?
Sən bir büllur idin...
Önümdə sındın.
Oldun para-para, sən çilik-çilik.
Özgə kölgəsinə niyə sığındın –
Səni alçaltmırmı bu diləncilik?
Dərsini bilmədin...
Bəs neyləyim mən?
Oğul, heç olmasa buna
                    cavab ver.
Sən özün-özünə inanmayırkən,
Mən necə inanım sənə?
                    Cavab ver!..
Çətinmi?
Yanıram bəs, axı, mən də!..
Dil-dil ötən dilin niyə lal olmuş?
Suallar hər yandan hücum çəkəndə,
O boyda vücudun bir sual olmuş...
Sonu görünməyən yollarda çaşqın
Səyyaha bənzədək biz ömrümüzü.
Dünyaya sualı olmayanların,
Sualdır varlığı, sualdır özü!..
Cavabı ömürdən uzun suallar
Yerin hikmətidir, göyün sirridir.
Suallar,
          suallar,
                    dərin suallar,
Daim yüksəlişin pillələridir.

Hər kiçik sualda neçə sual var.
Sual yüksəlişdir,
Sual bilikdir.
Həmişə sual ver,
Həmişə axtar,
Ən böyük dahilik tələbəlikdir.
Sonsuz həyəcanlar, sonsuz təlaşlar,
Sualdan başlanıb, yoxdan var olmuş,
Ən böyük dahilər, ən böyük başlar,
Suallar dalınca qaçanlar olmuş.
Sual – fikirlərin çığıran səsi –
Bütün uçuşların dayaq nöqtəsi!..
O bunu bilmədi,
bilməz heç zaman!
Zənn etmə, qəsdindən o, dönəcəkdir,
Tutub alimlərin boş damarından,
Elmin yollarında sürünəcəkdir.
Keçəcək beləcə havayı beş il,
Onunçun elm-yük,
Zəhmət – ziyandır.
O, elmin yolunda mücahid deyil,
Vurğun yolçuları yamsılayandır.
Üzümə şiniyib o veyil-veyil,
işarır yenə,
Yəqin ki, o indi özünün deyil,
Gülür tanışının gücsüzlüyünə.

Tanış...
Mənim ona çox hörmətim var.
Kağızın üstündə dayanır qələm.
İtsinmi ortada salam-kalamlar?
Yox! Onun üzündən keçə bilmərəm.
Müəllim – tələbə... İki sərt baxış
Dayanıb ortada müştərək tanış.
Salama, xahişə ilişib qələm,
Vurur bir yandan da ədalət məni.
Düzlük tələb edir məndən vəzifəm,

Çəkir əyriliyə vəziyyət məni.

Keçən il bağımda ev tikdirirdim,
Arayış düzəltdim,
                    ərizə verdim.
Olmadı işimə bir can yandıran
Nə daş tapa bildim, nə taxta-şalban.
Axır, tanış oldum bir müdirlə mən,
İşlərim düzəldi səxavətindən.
Düşdüyüm o çətin, o bərk ayaqda
O, satın alırmış məni, heç demə.
Minnətli yaxşılıq – bir-iki taxta,
Bu gün qiymətini göstərir mənə.
Mən nə biləydim ki, həmin bü müdir,
Qəsdinə duracaq haqqın bir zaman.
Məni minnətiylə haqdan döndərir
Bir-iki taxtayla məni aldadan.

"İki"ni yazımmı?
Bəs sonra?
Yox, yox...
Kağızın üstündə dayanır qələm.
Kəsilən tələbəm deyil,
Yaxşı bax.
Vəzifə başında kəsilən mənəm...
Taxta istəmişdim mən ondan... osa,
Məndən dəyərsizə dəyər istədi.
Mən ki düşmən idim söz anlamaza,
Məndən düşmənimə səngər istədi.
O mənə daş verdi, əvəzindəsə
Aldı ürəyimi bir baqqal kimi.
Ürəyi daş olan bir filankəsə,
İndi necə qıyım öz ürəyimi?

Ürəyim – öz fikrim, andım, əqidəm
Əsil oğul bu yolda gərək baş qoya.
Görün, nəyi nəyə dəyişməliyəm?

Ürəyi, məsləki daşa, taxtaya...
Mən onu kəsmədim, üç yazdım ona
Bu "üç"lə dağ basdım haqqın bağrına.
"Üç"lərlə vicdanı veririk bada,
"Üç" – başdan eyləmək, "üç" – natamamlıq.
Biz bu "üçlər"dəki saxtalıqla da
Haqqın, ədalətin belini qırdıq.

Hər "üç" – bir yarımçıq, kəmsavad həkim,
Hər "üç" – bir cinayət, vaxtsız bir ölüm.
Hər "üç" – balasını itirən ana,
Hər "üç" – tikildikcə sökülən bina.

Müəllimlər, gəlin, düşünək dərin,
Kəsir özümüzü öz qılıncımız.
Bizim verdiyimiz saxta "üçlərin"
Barı – cinayətdir, səbəbkarı biz.

Mən onu kəsmədim, kəsə bilmədim
Kəsib vicdanımı "üç" yazdım, bu an
Vicdanım qışqırdı,
Ona – "Sus!" – dedim!
Oğlan gülə-gülə çıxdı qapıdan.
Güldü, sinəsini dağladıb haqqın,
Güldü, anasını ağladıb haqqın.
Bu gülüş düzlüyün sapını qırdı,
Onun gülüşündə haqq ağlayırdı.
O çatdı qəsdinə... Dikəldi...
Bəs mən?
İndi mən əyilib döndüm yumağa.
Demək, şirnikdirdim onu indidən,
Özgənin haqqını oğurlamağa...

Hələ bu nədir ki?.. Dalı "əcəbdir",
Daldadır ev yıxıb, qan qaraltması.
Ən böyük haqsızlıq törədəcəkdir,
Haqqı olmayanın haqqa çatması.

Əlim yazdısa da, “ yox” dedi könlüm,
Qələmin altında inlədi könlüm.
Özgə qiymətinə o, sahib oldu,
Nə verər sonrakı hay-haray bizə?
Deyirəm, həyatda bu mahir oğru
Özgənin yerini tutsa – vay bizə!
Mən onu kəsmədim, kəsə bilmədim,
Vicdanım qışqırdı...
                    Ona “sus!” – dedim!
Vicdan,
          Yazıq vicdan!..
                    Bəzən həyatda
Yaşamaq naminə səni əzmişik.
Bizdən güclülərin ayağı altda
Səni istəmədən qurban kəsmişik.
Ölüm hədələyib dərd gülən zaman,
Deyirik, bəxtimiz yenə yatıbdır.
Əlimiz hər yerdən üzülən zaman,
Gücümüz həmişə sənə çatıbdır.
Vicdan da bir yana...
Bir cani kimi,
Qaydanı, qanunu ayaqladım mən.
Dandım məsləkimi, düz əqidəmi,
Ürəyin yerinə daş bağladım mən.

Qanundan, düzlükdən danışırıq biz,
Uca kürsülərdən ağız dolusu.
Sözlərdən utanmır əməllərimiz,
Özümüz oluruq haqqın oğrusu.
İndi soruşuram:
          – Kimdir müqəssir?
Tələbə?
Yoxsa, mən?
Yoxsa, o müdir?
Mən də müqəssirəm,
                    oxucu, sən də.
Heç kəs dayanmasın burda yad kimi.

Mənə o müdir də kömək edəndə,
Qanunu beləcə əyməmişdimi?
Yarpaq töküləndə, ot saralanda,
Bilirik, ömrünü tapşırır bahar.
Mən ondan qanunsuz taxta alanda,
Biləydim, bu gündən mənimçin də var!
Bəlkə, düz demirəm?
            Haqsızam, bəlkə?
Heç kəs yaxasını çəkməsin yana.
Qanunu əyəndə hərə bir tikə,
Böyük cinayətlər çıxır meydana...
Nədir o cinayət?
            Həmin tələbə
Sabah bitirəcək darülfünunu.
Müəllim gedəcək o bir məktəbə,
Savadsız müəllim!
            Yaxşı, bəs sonu?
Sonu cinayətdir,
            cinayət!.. Min min!
(Cani öz-özündən intiqam alır)
Elə cinayət ki,
                        bu cinayətin
Canisi bilinmir, cəza mat qalır.
Mənim qaşığıma çıxacaq gec-tez
Mənim doğradığım...
                        həyat dövr edir.
Bir vaxt görərəm ki,
                        həmin savadsız
Mənim övladıma "savad" öyrədir.
Durduğum budağa çaldım baltanı –
Çaldım öz balamın gələcəyinə.
Qanunu əyəndə,
            onun ziyanı
Qayıdıb özünə dəyəcək yenə...
Bilmədi...
Mən ona "üç" yazdım... Bəli!
Bəs o işvəli qız, gözü sürməli?

Niyə bir müdirin tanışlığına
Verdiyim o "üç"ü qıymadım ona?
Sözümüz bir olmur əməlimizlə
Düzlük nalə çəkir, ədalət yanır.
"Düzlük" – deyə-deyə öz əlimizlə
Həqiqət boğulur, düzlük tapdanır.
"Yox!" – deyə dilləndi başqa səs yenə.
Dayan!
Vicdanınla dayan təkbətək.
İndi ki qol çəkdin əyriliyinə,
Qıza da o "üç"dən yazasan gərək.
Dedim: – Sən haqlısan,
                    qab əyildimi
Su gərək tökülə axıra kimi.
Qıza da "üç" yazdım...
                    Hər şey pozuldu.
Qiymətlər hamısı baş-ayaq oldu.
Hökm etdim ürəyə, qıydım vicdana.
İşimi korladı bircə yelbeyin.
Mənim götürdüyüm bu imtahana
İmtahan deməyin, həqsızlıq deyin.

Mənə tapşırdılar şərəfli, çətin –
Qiymət vermək kimi bir vəzifəni.
Özümdən soruram: – Bəs sən neylədin?
Gör necə aldılar özündən səni!
Niyə tapılmadı o qüdrət məndə,
Verim qiymətini, verim hər kəsin?
Saxsını almazla bir eləyəndə,
Günahkar sərrafdır,
                    almaz neyləsin?
Qorqud adamlara ad qoyanda da
Əməli düşündü,
Dəyəri gördü...
Güvənib Dədədən aldığı ada
Hər kəs o ad ilə ömrünü sürdü.

Mən verə bilmədim, ay Qorqud Dədə.
Doğru qiymətini burda heç kəsin.
Qorxum ondandır ki, cəmiyyətdə də,
Bunlar qiymətini ala bilməsin.

Pozular qaydalar, dağılar nizam,
Verməsən hər kəsin öz qiymətini.
Gövhər də çatlayıb üzülər tamam
Sərrafdan almasa düz qiymətini...

Mahnıda bəmi var, zili var səsin.
Həyatda yeri var, axı, hər kəsin.
Gözlər ağlamasın, gözlər neyləsin –
Sən qaşa verəndə göz qiymətini.

Yalanın əlilə gerçək boğuldu,
Yaxın uzaq oldu, qara ağ oldu.
Dünyanın növrağı tamam pozuldu,
O gün ki, itirdi söz qiymətini.

## Son söz

Sonrakı qazancdır müəllimliyim,
Amma şairliyim, öz fitrətimdir.
Burda birləşdilər...
                    Bu dastan mənim,
Özümdən özümə şikayətimdir.
Sənət, həqiqəti deyən sən oldun,
Dünyanı dünyaya göstərən oldun.
Təmizlik – məsləkin, ucalıq – Tanrın.
Xəyanət bilməmiş sənətin dili,
Ucalıq eşqilə yaşayanların
Məsləki düzlükdən od götürməli!

*1970*



# Muğam



*Üzeyir bəy Hacıbəyovun xatirəsinə*

**Bəlkə**

Bir quş ötür budağında
Bu nəğmənin laylasına
Çəmən, çayır mürgüləyir.
Naləsilə yazıq bizə
          Nəsə deyir,
          Nəsə deyir...
“Cik-cik”, “cik-cik”...
Bilirikmi dediyini?
-Yox, bilmirik, biz bilmirik.
Quş dilini bilmiriksə,
Günahkarmı o quşcuğaz?
Səbrini bas,
Ləhcəsinə, naləsinə,
Dilindəki qəm səsinə
Qulağınla qulaq asma,
Ürəyinlə sən qulaq as.
O nalənin atəşində
Öz qəlbini oda yaxsan,
Mətləbini bilməsən də,
Ürəyini duyacaqsan.
Tar da elə...
O sızlayır için-için.
İçindədir hər mətləbi,
Naləsidir eşitdiyin.
O quş kimi

Tarın da öz ləhcəsi var, öz dili var.
Mətləbinin axırı var, əvvəli var.
Əvvəl öyrən sən bu dilin
Nöqtəsini,
Vergülünü.
Ayıra bil
Dağ gülündən
Bağ gülünü.
Ayıra bil
Ocaqdakı od külündən
Sinədəki dağ külünü.
Bu dünyanın ağrıları, acıları
Necə sığır Çahargahın
Bəstənigar pərdəsinə?
Dağlara çıx, diqqət elə
Qayalarda yumalanan
Daş səsinə,
Öz səsinə
Səs axtaran quş səsinə...
O səsdəki
Qırıq-qırıq hıçqırıqlar nə nalədir?
Qırqovulun döşündəki rənglər nədir?
O rənglərdə muğamdakı
Əlvan-əlvan pərdələri,
Pırıl-pırıl səsləri gör.
O düşünür,
Həm də bizi düşündürür.
Ney üstündə yeddi səsin,
Oyuq-oyuq yuvaları,
Nədir belə?
Bəlkə elə
Balaları perik düşən
Qaratoyuq yuvaları?
Səslər, qırıq bir arzunun can səsimi?
Yuvaları dağıdılmış
Çolpaların naləsimi?
Qayalardan sızan suyun,

Dərələrdə azan suyun
Səslərini
Bir-birindən ayıra bil.
O, bir deyil, yox bir deyil.
Addım-addım, nəfəs-nəfəs
Dağı dolan, dərəni gəz,
Bax hər yerin çiçəyinə
Bil dağların çiçəyi nə,
Dərələrin çiçəyi nə?
Çiçəklərin öz rəngində, öz ətrində
Nəğmədəki səsləri gör, xalları gör –
Enib qalxan keçidləri,
Cığırları, yolları gör.
Dağa gedən cığırlarda
Qarşına bax, dünyanı gör.
Sığırçının belindəki
Arşına bax, dünyanı gör[1].
Bəlkə o da bizim kimi
Ölçmək istər bu dünyanı?
Bircə qarış yer üstündə
Bizə göstər bu dünyanı...
Söz var, qəlbə yol açmayan
adi bir səs, quru nəfəs.
Səs də var ki,
Sözün deyə bilmədiyi sözü deyir.
Elə səsin özü şeir, sözü şeir.
Söz – qəlbdəki bir mətləbin
Öz səsidir...
Nəğmə – səsin şeyriyyəti,
Şeir sözün nəğməsidir.
Bəlkə... Muğam bir nağıldır, əfsanədir.
Bilək, onun bu dünyaya sözü nədir, qəsdi
nədir?
Nağıllarda bir göyərçin
Bir qəribi şah elədi.

[1] Əfsanəyə görə, sığırçının belindəki ağ xətt bir arşındır.

Bu dünyanın kələ-kötür işlərini
rəndələdi...
Ötənlərin dərdlərinə dola-dola
İnanaqmı bu nağıla?
Bu arzudur, bu diləkdir.
El deyir ki, arzularım
Gələcəkdir,
Güləcəkdir...
Bəlkə, düzgün böləmmədik
Biz o zaman
Göydən düşən üç almanı?
Bilək, niyə şüşədədir
Divin canı?..
Niyə, niyə gözləyib el
"O sahibi-əzzamanı?"
Bəlkə, muğam bir gözləyiş,
Bir həsrətdir?
Əl var ikən, qol var ikən,
Baş var ikən, diş var ikən,
Bu gözləmə müsibətdir.
Canavarın aldatdığı
Şəngülümün, Şüngülümün
Qanı, bəlkə, düşüb tarın kök siminə?
Muğamdakı hıçqırıqlar
Üsyan edir, bəlkə, divin tilsiminə?
Ürəyinin tellərindən
Tellər çəkib tara xalqın.
O tellərin nəğməsində
Öz ruhunu, öz qəlbini ara xalqın.

Tanımaqmı istəyirsən
Görmədiyin bir xalqı sən?
Əvvəl onun nəğməsinə sən qulaq as,
Onu öyrən.
Öz sözünü, sorğusunu
Xəyalını, duyğusunu
Xalq yaşadır nəğməsində.

Tarixin bir dövrü yatır
Bir bəmdəki "ah" səsində.

Çahargahın Müxalifi
"Çaldıranda"[1] at saldıran,
Qılınclardan od aldıran
Döyüş səsi...
Çahargahın Cövhərisi
Kol dibində
Qar altından
Çıxan tənha bənövşənin üşüməsi –
Qılınc səsi, qalxan səsi,
Bənövşənin üşüməsi.
Biri hünər,
O birisi göz yaşıdır.
O sərtliklə bu incəlik
Bir muğamda yanaşıdır.
Dinlə tarı, dinlə neyi.
O – keçmişdən
Asta-asta söhbət açan
Səs muzeyi...
O – şöhrətli, şanlı muzey.
O – danışan, həm də bizi danışdıran
Canlı muzey.
Gah səsində göy gurlayır,
Gah inləyir həzin-həzin.
Həm babamın yaşıdıdır,
həm nəvəmin.

**ŞUR**

Varaqlama o tarixi,
İki qəlbin həsrətini
Varaqlarda döyündürən
Bir maraqlı roman kimi.

[1] Çaldıran vuruşması.

Dinlə Şuru
Öz qəlbini sənə açan,
Hər kəlməsi alov saçan
Tarix yaşlı baban kimi,
Gözüyaşlı anan kimi.
Tüstüsünə aman elə,
                    Oduna yan.
Dayan, düşün,
Düşün, dayan.
Dinlə onu.
                    Hər guşəsi
Quş qonmayan qayalardan daş tərpədər,
Kirpiklərdə yaş tərpədər.
Mahnılar var, ayaqları,
Muğamlarsa baş tərpədər.
Bu dünyanın
                    Ağrısını,
                    Acısını
                            Duydunmu sən?
Duymadınsa,
Bir çiçək də dərəmməzsən
          Sən bu hikmət çəmənindən.
Dayan, basma ayağını
                    Bu çəmənə.
O, sirrini açmaz sənə.
Əvvəl öyrən, bu vətənə
Hardan,
                    Hansı külək əsib?
Qara yellər dilləndirən
                    Bir qarğıdan
Kim, nə zaman,
                    Nədən ötrü tütək kəsib?
Şur nə deyir, nə danışır narın-narın?
Öyrən, nə vaxt qaynağına daş atılıb
                    Dağlardakı bulaqların?
Öyrən, nə vaxt aparıbdır
                    Sel Saranı?

Kim salıbdır dildən-dilə
Bu dəhşətli macəranı?
Niyə kəsdi sel aranı,
Həsrət qoydu o tərəfə
Xançobanı?
Öyrən, niyə Xəstə Qasım
Birdən belə sayru düşüb?
Kərəm niyə
Əslisindən ayrı düşüb?
Ədalətin şərbətinə
İlk dəfə kim zəhər qatdı?
Keşişləri, Həmzələri
Kim yaratdı,
Nə yaratdı?
Koroğlunun nərəsinə,
haqq səsinə
Yer gurladı,
Göy gurladı.
Dünən onun qapısında boyun bükən
Bu gün necə oğurladı
Mərd kişinin Qıratını?
Nənəm Nigar, bəlkə, onda
Çağırıb ilk bayatını?
Qobustanda rəqs eləyən
Qayalara, daşlara bax.
Təbiətin öz əliylə
Çarpalanan çapıq-çapıq qaşlara bax.
Cəngi səsi
Birləşdirir göyü, yeri.
Bəlkə, elə burdan gəlir
Muğamların ilk rəngləri,
Təsnifləri, ritmləri..
Cəngi səsi...
Gumbuldayır nağaralar,
Ağız açır mağaralar,
Qan sıçrayır beyinlərə,
Qollar keçir çiyinlərə:

“Hoydu, hoydu, dəlilərim,
Yeriyin meydan üstünə.
Havadakı şahin kimi
Tökülün al qan üstünə...”
“...Uca-uca dağ başında
Yaz bir yana, qış bir yana.
Titrəşir ağzım içində
Dil bir yana, diş bir yana...
Çəkəndə Misri qılıncı
Leş bir yana, baş bir yana”.
Cəngi deyir:
– Düşmən gəlir, keç irəli!
Yallı gedir.
Bayandurun, Koroğlunun dəliləri...
Burda oxu,
Sinələri nəğmələşən
Hər qayanı,
Hər sal daşı.
Təbiətin ruhundadır
Bu uyarlıq, bu nəğməlik.
Təbiətin özü çalır “qaval daş”ı.
Qayadakı sərtliyə bax,
Cəngidəki mərdliyə bax.
Əllər süzür incə-incə,
Ayaqlarsa, yeyin-yeyin.
Yallı da bir vəhdətidir
O sərtliklə bu mərdliyin...
Cəngi səsi
Birləşdirir göyü, yeri...
Bəlkə, elə burdan gəlir
Muğamların ilk rəngləri,
Təsnifləri, ritmləri?
Bu rənglərdə, nəğmələrdə
Saxlayıbdır muğamlar da
Saflığını, özlüyünü –
Qanadında qürur, vüqar,
Cövhərində qəm düyünü...

O düşünür, düşündürür.
Gah yandırır, gah söndürür.
Xallardakı xəyallarla, fikirlərlə
Yox, boşalmır,
Ürək dolur.
Böyük qəmin, böyük dərdin
Vüqarı da böyük olur.

Aydan arı, sudan belə durum mənim,
Ay yanıqlı Şurum mənim.
İstərəm ki, əlvan-əlvan çiçək olub
Dolaşdığın pərdələrə
Mən səpiləm.
"Uca dağlar" başındakı
"Azərbaycan maralı"nın
Gözündəki "Qara giləm"...
Nənələrin toxuduğu
Xalıların xanasında xanalandın
xınalandın.
Göygölümün ləpəsində sonalandın.
Sevgililər dodağında
Yanıb söndün,
Sönüb yandın:
"Dəryada gəmim qaldı,
Biçmədim zəmim qaldı,
Çox çəkdim yar cəfasın,
Mənə də qəmim qaldı..."

Novruz ötüb, yazbaşıdır,
Bu nə səsdir?
Göydə topa buludların
Bir-biriylə güləşməsi,
Dağlardakı qar üstünə
Xal düşməsi,
Dərələrdə suya dönüb
Gülüşməsi,
Marxallarda qar uçqunu

Yazla qışın savaşıdır,
Novruz ötüb... Yazbaşıdır...
Sellər, sular aşıb-daşır,
Bir-birilə qucaqlaşır.
Qayaların qabağında
O əyilir, o burulur.
Təpələrdən səpələnir
toz-toz olur.
Yaylaqları gəzə-gəzə,
Dəyir daşa, enir düzə
Ağacların budağına
Düymələri düzə-düzə...
Daşır, coşur,
Yollar boyu nəğmə qoşur:
"Qəhrəman"ı qayalarda şaqqıldayıb
qəhərlənir,
Saz üstündə pöhrələnir.
Çəmənlərə nəğməsini yaza-yaza,
Gəlib çatır
Araz Kürə, Kür Araza.
Hər ikisi dağın qarı,
Dağın barı.
Qovuşanda
Ağ ləpələr rəqs eləyir:
Arazbarı, Arazbarı!
Bu duyğular fışqırtısı,
Təlatümlər, qaynamalar,
Sığışmadı bir yatağa,
Budaqlandı sola, sağa.
Bir fəsildə neçə kərə
Dəyişdirdi öz yönünü,
öz yolunu.
Zaman keçdi,
Bir məcraya sığışdırıb
Tanıtdırdı bu dünyaya
Bizim sənət bahadırı – Fikrət onu...

Çoxdan unudulmuş, yeri qalmış yaradır Şur,
Birdən yada düşmüş bir ötən macəradır Şur.

Bir arifin hikmət dolu söz-söhbəti, eşqi,
Heyrətdən ağıl mülkünə bir pəncərədir Şur.

Fikrin nə qədər yolları, mənzilləri varmış,
Üstündə cığırlar açılan bir dərədir Şur.

Dağlar başı ağ, çölləri al, döşləri əlvan,
Hər pərdəsi bir rəngə çalan mənzərədir Şur.

Qürbətdə Vətən həsrəti, yurdunda bir anlıq,
Yaddaşda yanıb, tez də sönən xatirədir Şur.

Çox qürrələnir Bəxtiyar öz şeirinə hərdən,
Guya deyəcəkmiş bizə şeirilə, nədir Şur?!

## Tellər ağlasın

Şikəstənin Zil guşəsi –
Əsgəranda vıyıldayan güllə səsi.
Qara xəbər el-obanı dolandı:
Əsgəranda Qoç Nəbini vurdular.
Baxışlarda göz yaşları sulandı,
Ağı dedi buz bağlayan lal sular.
Bayatılar qara geydi əyninə.
Gəraylılar qəm götürdü çiyninə.
Qarabağın çöllərini qar aldı.
Şikəstənin zil pərdəsi qaraldı:
“Əsgəranda dağıtdılar araba.
Görüm bu diyarı qalsın xaraba.
Nəbinin meyidi qaldı arada
Yerisin üstünə ellər ağlasın.
Darasın saçını, tellər ağlasın”.

## ÇAHARGAH

Şahə qalxan ağ dalğalar
                    Köpük-köpük...
Uca-uca, böyük-böyük
Qayalara gah çırpılır,
Gah çəkilir axın-axın...
Təlatümlər, həyəcanlar
Bərdaştıdır, ön sözüdür
                    Çahargahın.
Deyir: – Həyat bir döyüşdür,
Bir vuruşdur başdan-başa...
Rahatlığı həyəcanlar qucağında
                       ara, yaşa
En enişə, qalx yoxuşa
Sellər kimi coşa-coşa,
Sular kimi daşa-daşa...
        Yaşa, yaşa.
Mayəsində səslər uçur
        Qanad-qanad,
Nəql olunur ötən gündən
        Bir əhvalat:
...Yad ölkədən elçi gəlib
        Ölkəmizə.
– Gərək təslim olasınız, –
        Deyir bizə, –
Olmasanız...
Təpəriniz varsa əgər,
                    Savaşınız.
Savaşsanız...
Daş üstündə qalmayacaq
        Bir daşınız.
Ağsaqqallar düşündülər:
                    – Nədir çarə?
Dada çatmaz bu məqamda
Nə moizə,
        Nə müəzzin,

Nə minarə.
Qara yellər qabağında
Fikirlər də haçalandı.
Bu onu,
O, bunu dandı.
– Keçmişimiz şanlı idi.
Bəs gələcək?
– Fikirləşək.
Bu bəladan qurtarmağa
Bir ağıllı tədbir görək,
Səbir gərək.
Məqamı var hər istəyin,
Tələsməyin, tələsməyin.
Tarixlərə o, baş vurur
"Vuruş" – deyə
Alovlanan ürəkləri
O tədbirlə ovundurur.
Bəstənigar aman çəkir,
Amanından aman, aman!..
Şikayətdir
Taleyin bu qəzasından.
Düşmən yaman amansızdır,
O qansızdır.
– Neyləməli?
– Dişimizlə daş qırmalı.
– Hanı bizim o gücümüz?..
– Onda ata-babaların şərəfini
Düşmənəmi tapşırmalı?..
Təəssüfmü?
Fikir qalxdı,
Fikir endi.
– Təəssüfün kölgəsində
Hansı dilək çiçəkləndi?
Bəstənigar –
Bəstəboylu nigarların
Dili ilə inlər, inlər.
Ağı deyər qız gəlinlər:

“Don tiksən ağı bizdən,
Belinin bağı bizdən,
Qoymayın yadellini
Almağa bağı bizdən...”
Yığıldılar,
Dağıldılar dönə-dönə.
“Ötən günə gün çatarmı
Calasan da günü-günə”.
Biri qalxdı:
– Günü günə calamağın
              Nə faydası?
Ürəkdə od qalamalı,
Günü oda calamalı.
Min-min fikir
Bircə borcu ödəməmiş.
Qalxan əydi belimizi
Çox qısaltdı dilimizi.
Qalxan altda qaldığımız
          Yetər bizim.
Dərdlərimiz qılınc ilə
          Bitər bizim.
“Dəyirmanın pərindən,
Suyu çıxar dərindən.
Elin sözü bir olsa,
Dağ oynadar yerindən...”
“Çən-duman düzə neylər?
Zülfün tök üzə, neylər?
Ov bizim, ovlaq bizim
Yad ovçu bizə neylər?”
İndi bizə qılınc gərək,
          Nizə gərək.
Od bişirək, dəmir döyək.
İndi bizə sellər kimi daşmaq gərək.
Qəlbimizə kölgə salan
“Qorxu” adlı hasarları
                        Aşmaq gərək.
Çahargahın Hasarında,

Yadellinin qabağına hasar çəkən
Qalalarda
Kürələrdə od qalandı,
Ocaq yandı,
Dəmir bişdi,
Çəkic altda, zindan üstdə
Xəmir kimi kündələndi,
Cilalandı.
Taraq-taraq,
Taq-tararaq,
Əldə yaraq
Vuraq, qıraq,
Cəbhə yaraq.
Dəmir, əri,
Qılınca dön,
Düşmən üstə durma, yeri.
Çəkic altda qığılcıma dönüb axdı
Çahargahın pərdələri...
Müxalifdə,
Hücum, hücum!
Ərənlərin nərəsinə
Yer titrədi, göy gurladı.
Uca dağlar dua verib
Ərənləri uğurladı.
Düşmən qaçır, bizimkilər təqib edir
Mənsuriyyə qələbədir, təntənədir:
"Əzizim sözə qaldı
Bir şirin sözə qaldı.
Yad qovuldu dağlardan,
Yurd yenə bizə qaldı..."

Qəlbi vulkan tək coşan üsyandır, üsyan Çarigah,
Açmış hər zənguləsindən fikrə meydan Çarigah...

Şahə qalxan dalğalardır bir Müxalif guşəsi,
Dəryalar ləngərlədən tufandı, tufan Çarigah.

Guşələr göy gurladır, yer titrədir, sel oynadır,
Göndərir yadelliyə imzalı fərman Çarigah.

Simlərin mizrab ilə toqquşmasından od çıxar,
Yoğrulubdur bəlkə də çaxmaq daşından Çarigah.

Cövhərində bir həzinlik, bir xəfiflik saxlanır,
Ayrılıbdır öylə bir can sirdaşından Çarigah.

Bəxtiyaram, heyranam bərdaştda çılğın səslərə,
İstərəm od alsın əsrin atəşindən Çarigah!

## Qalalar

Abşeironun qalaları
Daşlardakı o oymalar,
Dalğasımı qatardakı
                    Həzin, şirin
                  Pərdələrin?
Bürclərdəki o əzəmət,
                              Təmkin, vüqar,
Bəlkə... Hasar pərdəsidir Çahargahın?
Səs düzümü qaladakı dişlər kimi
                    sıra-sıra, axın-axın.
Yadellinin hücumuna hasar çəkir.
Daşda fikir, səsdə fikir.
Boyaları əvəz edən kölgələr də
                    Fikir, fikir...
Ruhumuzla uyqardadır,
                    O batıqlar,
                  Qabarmalar.
Qabarmalar
          Batıqlara kölgə salar.
Nə doğmadır, nə istidir,
Çıxışların batıqlara
Düşən xəfif kölgələri –

Tağlardakı
Oyma “naxış ləpələri”.
Yadellinin başı üstdə
Yumruq kimi düyünlənən bu qalalar,
Düşmən bizə güc gələndə
El-obaya sığnaq olar.
Bu qalalar azadlığı hələ yanan,
Tüstülənən ocaqlarmış.
Bu qalalar tarix boyu
Neçə-neçə cəbhə yarmış.
Qız qalası! Adına bax,
“Bakirədir, qızdır qalam.
Yaxın gəlmə, mən quzğunam, mən qartalam.
Bu qartallar məskəninə
Qaraquşlar kölgəsini sala bilməz.
Qız qalamın qızlığını ala bilməz...”
“Sən gələrsən, sən görərsən” –
Qalasının adındakı
Mənaya bax, məqsədi gör.
Babaların məramından
İbrət götür.
Düşməninə o deyir ki,
Əgər gəlsən,
Yumruğumun ləzzətini sən görərsən.
Gəldiyinə peşman olub
Dabanına tüpürərsən.
Nələr deyir daşlardakı
O batıqlar, qabarmalar –
Daş üstündə çiçəklənən
O yarmalar?
Kim deyir ki, bu qalalar,
Yalnız elə qallar üçün
Qaldırılan
Bir qaladır?
Xeyr, burda sərtlik ilə
İncəliklər qol-qoladır.
Qorucumuz, keşikçimiz

Qalaların sinəsində
Nələr yatır, nələr, nələr?!
Bu qalalar – Daş nəğmələr.
Daşlardakı çalalara axar, dolar,
Daş üstündə naxış tutan,
O fikirlər, o duyğular,
Guşələrdə qaqqıldaşan
Pərdələrdən aşıb-daşan,
Hiddətlənən səs axını...
Batıqların, çıxıqların
Sinəsində qalxıb enən
Səs axını.

**Hərə bir cürə...**

Mərifət, qanacaq ölçümdür muğam,
Mən onu özümə məhək sanmışam.
O məhək daşında mən insanları
Saf-çürük edərəm, yoxlaram müdam.
Sən də yanırsansa əgər bu oda,
Dostumsan...
Görürəm özümü səndə,
Mən öz həmdəmimi, dostlarımı da
Tanıram muğamın pərdələrində.
Görən, nə danışır, nə deyir bizə
Səslərə bükülmüş bu göz yaşları?
Od saçır,
Dağ basır ürəyimizə
Elə bil köç edir durna qatarı...
O hara tələsir? O niyə gedir?
O bizim çölləri niyə tərk edir?
Tökülür yarpaqlar, susur bulaqlar,
Soyuqdan üşüyür, əsir budaqlar.
Payızın sazağı kəsir otları,
Göydə topalanır qəm buludları...
Dağın dumanımı, sisimi görən,
Dumanlı səslərdə belə hönkürən?

Ağlayır aşikar,
Yanır gizlicə.
Barmağı altında tarzən gör necə,
Düyünlü səsləri qovurur, sıxır.
Səslərdən yaş sızır,
Sudan od çıxır...

Ey tarım, ey nəğməm, ey pirim mənim,
Sənə nəzir düşür... çox yoxsulam mən.
Nəğməm ola bilər nəzirim mənim,
O da ki sönükdür nəğmələrindən...
O məchul dilinlə, sirli səsinlə
Gizli bir aləmdən xəbər verirsən.
Nolar, mənim kimi səsini dinlə,
Görək buna necə tab gətirərsən?
Ey atam hünərli, babam fikirli,
Ey reyhan nəfəsli, yarpız ətirli,
Nağıl nənələrin ey laylay səsi.
Ulu babaların kamal xəznəsi,
Şirin arzularım, xoş xəyallarım,
Ey müqəddəs pirim, ey müdrik tarım,
Danış,
Nəğmə oxu,
                    Sən həzin-həzin
Abırlı, həyalı qızlarımızın
Utancaq, dözümlü sevgilərindən.
Danış,
Söhbətinə müntəzirəm mən.
Danış,
Nədən ötrü ayrı saldılar
Kərəmi Əslidən,
Qeysi Leylidən?
Niyə taleləri daşa çaldılar?
Sinənə çəkilən bu dağlar nədən?
Sənin xəyalların, düşüncələrin
Dəryadan ləngərli, səmadan dərin.
Hər xalın tarixi
          Yüz il, beş yüz il.

Guşələr rəngbərəng:
Yaşıl, al, sarı...
Orda varaqlanır,
Bir qəlbin deyil,
Bir xalqın minillik iztirabları.
Bir xalqın tarixi –
Tarixin yolu.
Enişi, yoxuşu, iztirab dolu.
Səslənir muğamın pərdələrində.
Söhbəti aşkarda,
Sirri dərində.
Zilində elə bil od qalanıbdır,
Yanğına dözməyib havalanıbdır.
Bəmində yanğını keçirmək üçün
Fikirlər, xəyallar yuvalanıbdır.

Biz ki bu yolları bir başa vurduq,
Biz ki bir vahidik bir arzu-kamda.
Elə bununçun da... Tək mənmi?..
Yox, yox.
Hər kəs öz qəlbini tapır muğamda.
Muğam – hər guşəsi sirli, soraqlı
Yola bənzəyir.
Yatağa sığmayan qollu-budaqlı
Selə bənzəyir.
Əvvəlcə yamyaşıl düzü dolaşır,
Birdən dəyişdirir köhnə yerini.
O axır, kükrəyir,
O coşur, daşır
Dağıda-dağıda sahilləririni.

Cilova gəlsəydi belə bir axın,
Nota salardılar onu nəğmə tək.
Şəklini çəkməkçin xırdalıqların
Özgə bir dünyadan boyalar gərək.
Tez-tez dəyişdirir öz məcrasını,
O yola çıxmadan yolunu bilmir.

Səfərə çıxanda macərasının
İlkini bilsə də, sonunu bilmir.
Bu yolu hər yolçu bir cür qət edir,
Bəmi düzənlikdir, zili zirvədir.
Bəli, o, zirvədir.
O zirvəlikdə
Ayağın altından sanki yer qaçır.
O ayaq dəyməyən yaşıl gədikdə
Hər yolçu özünə özü yol açır.

Hər muğam çalanın, muğam deyənin
Keçdiyi, açdığı iz başqa-başqa.
Eyni müğənnini hər dinləyənin
Könlünü yandıran köz başqa-başqa.
Məğrur Qız qalası...
O köhnə Bakı,
Mənsur Zabul üstə inlədir tarı.
O nədir?
Suların qayalardakı
Həzin, asta-asta pıçıltıları.
– Necə dumanlısan,
Görünmür gözə
Pərdədə, örtükdə çırpınan ürək.
Gizli mətləbini görməkçün
Bizə
Dərinə işləyən təxəyyül gərək.
Hərə bu ocaqdan bir od götürər,
Tutar səsindəki dərinliklərə.
Xəyalın gözüylə eşidər, görər
Gizli mətləbini hərə bir cürə.
Bilmirəm, yaşıldır, aldır səslərin.
Səsinə nə sözüm?
Laldır səslərin.
Mətləbi gizlədir, inləyir ancaq.
Danışır,
Bilmirik nə deyir ancaq...
Lal səsin nə böyük qüdrəti varmış.

Səsdə sözdən böyük hikmət olarmış...
Mübhəmdir,
Gizlidir sözü nəğmənin.
Min sözdən güclüdür, bir xalın sənin.
Ey tarım,
            Ey nəğməm,
                        Ey pirim mənim
Sənə nəzir düşür...
                        Çox yoxsulam mən,
Nəğməm ola bilər nəzirim mənim
O da ki sönükdür nəğmələrindən.

Sözümdə olsaydı səsinin gücü,
Onu başım üstə bayraq edərdim,
Səsinlə dünyanı mən tərpədərdim.
Yanıb şırıl-şırıl,
Axıb şır-şır o
Kim deyə bilər ki, nə danışır o?
Onda qucaq-qucaq söz çələngi var.
Hər səsin, hər xalın neçə rəngi var.
Hər kəs, hər guşəni yozur bir yerə,
Gəlin, bir anlığa baxaq göylərə.
Buludlar burulur,
Buludlar dönür,
Hərənin gözünə bir cür görünür.
Yox.
Həmən həməndir,
                        Göy də,
                                    Bulud da.
Hərə öz qəlbini görür buludda.
Yoxsa inanmadın?
                        İnanma, ancaq,
Anbaan dəyişən o buluda bax,
Sən də öz qəlbinin pəncərəsindən
İnan gördüyünə,
                        Elədir, əlbət,
Mənim gördüyümü görməsən də sən,
Mən də həqiqətəm, sən də həqiqət.

## SEGAH

Ey Zabul segahım, Orta segahım,
Mənim öz amanım, mənim öz ahım.
Sən mənə kimsədən pay verilmədin,
Sən özgə çeşmədən gətirilmədin.
Mənim dağlarımdır sənin qaynağın,
Qoşqarın
Kəpəzin,
Ulu Şah dağın
Bağrından sızılıb sən durulmusan,
Məndə yuvalanıb mənim olmusan.
Başqa rəngə salıb bu zaman səni,
Yenidən yaratdı Sadıxcan[1]səni.
Mənim öz dərdimsən, öz məlalımsan.
Anamın südü tək sən halalımsan,
Çoban bayatısı...
Dağlar başından
Qarlara qarışıb qar-qar axıbdı.
Çöllərə boylanan gül baxışından
Keçdiyi yollara iz buraxıbdı...

Həzin bayatılar, çiçəklər kimi
Dağlarda kök atdı, arana çatdı.
Şirin bayatılar diləklər kimi
Bir qəlbdə boy atıb min qəlbə çatdı.

Nənəmin dilində min il dillənən
Segahım, özün al, özün, canımı.
Dilqəmin dilində dil-dil dillənən
Ay telli sazların telli xanımı.
Ey Sarı aşığın sevgi dastanı,
Ey Molla Cumanın "İsmi pünhanı".
Vaqifin könlünü qana döndərən,
Xumar baxışdanmı süzülmüsən sən?
Segah – bir arzunun, bir çırpıntının

---

[1] XIX əsrin musiqişunaslarındandır, tarda böyük yeniliklər etmişdir.

Min ürəkdən gələn hıçqırıqları.
Sonu iniltili,
Əvvəli çılğın –
Sınmış bir ürəyin səs qırıqları...

Qəmdir dolayları o ağlar səsin.
Ağrılar mayası,
Şikayət süsü.
Bir himə bənd olan bir qərib kəsin,
Könül hıçqırtısı, iç hönkürtüsü.
Danışır, başından ötüb keçəni.
Bəzən üsyan edir,
Bəzən inləyir.
Gizli dərdlərinə yandırır səni,
Mətləbi gah açır,
Gah düyünləyir.

Əlilə saldığı kor düyününə
Dililə yalvarır: "Tez açıl" – deyir.
Ötən keçmişini qoyub önünə
Bayatı çağırır, ona dil deyir:
Araz gəldi, yan axdı,
Dibində min can axdı.
Vətən sarı baxanda
Ürəyimdən qan axdı.

Dağların sinəsi nə?
Gün qalxıb sinəsinə.
Aləmə sığmaz başım
Sığıbdır sinəsinə.

Əziziyəm gül oldum,
Yandım, axır, kül oldum.
Bir dilbilməz quş idim,
Oxudum, bülbül oldum...

Segah – naləsinə alışan könül,
Alovu təəssüf, köçü xatirə.

Keçmişi yanğıyla danışan könül,
Qazancı ağrılar, özü xatirə.

O deyir dililə amanın, ahın:
-Tale bir ürəyə gör necə qıymış...
Mənim çəkdiklərim hansı günahın,
Hansı bəd əməlin öz bahasıymış?
Bu dərdə bağladı məni kim? – deyir.
Bəmində, zilində o, “neylim”? – deyir.

Dərdimin yükünə tab gətirmədi
Əyilib qırılan budağa neylim?
Dərələr keçmişəm, dağlar aşmışam,
Könlümdə dikələn bu dağa neylim?

Günahım nə oldu mənim dəmadəm,
Düzəndə kəsdilər, dağda bitmişəm,
İsti nəfəsimlə qar əritmişəm,
Şaxtaya dözmüşəm, sazağa neylim?
Mən danışan zaman bir kimsə dinməz.
Səsim su yandırar, sözüm bilinməz.
Böyük arzulara dünya bir qəfəs,
Dilimə vurulan qadağa neylim?

Mən od hərisiyəm, od mənə həmdəm,
Günah məndə deyil, daşı əritsəm.
Buz tutar, yay günü bulağa getsəm.
Neylim, buza neylim, bulağa neylim?

Danışdı.
Gördü ki, dinləyənlərin
Başından od çıxdı, gözləri doldu.
Dərdilə, qəmilə başqalarına
Əzab verdiyinə peşiman oldu.

Dedi: – Bu da keçər, axı neyləmək?
Həmişə olmaz ki, yer üzü gündüz.
Belə yaranıbdır bu çərxi-fələk,
Bir üzü gecədir, bir üzü gündüz.

Ey mənim ürəyim, sən öz gözünlə
Gecəni gecə gör, gündüzü gündüz.
Öz əllərinlə,
Könüllər şad edən əməllərinlə
Yoluna gül düz.

Nə deyir könlümü oymaqla, oyulmaqla Segah?
Gözə göz yaşları tək bir belə dolmaqla Segah?

Könül hıçqırtısı, qəlb atəşi, can yanğısıdır.
Sən mənim göz yaşım ol, çağla, Segah, çağla, Segah.

Anamın öz südü tək sən halalımsan, halalım,
Nə deyirsən, məni məndən belə almaqla Segah?

Bizi dünyanın o dar çərçivəsindən çıxarır,
Dəli xallardakı hönkürtüyə dalmaqla Segah.

Onun hər pərdəsi ah, hər bəmi qəm, hər zili od,
Qəlbə atəş çiləyir, hökm eləyir ağla Segah.

Bəxtiyarın da könül telləri titrər beləcə,
Deyər ahəstəcə hey: "Ağla, Segah, ağla, Segah".

## RAST

Buxarı başında el ağsaqqalı,
Əyləşib
Qəlbini açır süfrə tək.
Danışır, anbaan dəyişir halı
Zoğal çubuğunu tüstülədərək.
Sözləri bəm simdən zil simə düşmüş,
Danışır bir əsrin öz yarasını.
Danışır aramla,
Tilsimə düşmüş

Bir pəri qızının macərasını.
Dağlarda göynəyən Məcnundur Segah,
Rast – onun atası... Nəsihət eylər.
Məcnun səhralara gətirər pənah,
Ata bu sevdanı məzəmmət eylər.
Rast – müdrik bir ağıl, dərin düşüncə,
Danışır təmkinlə, aramla tək-tək.
Segah – bir istəyin, eşqin dalınca
Mələyə – mələyə qaçan bir ürək.

Rast – çılğın qəlblərə bir ağsaqqalın
Nəsihət nidası, öyüd səsidir.
Bir zaman büdrəyən qəlbin, kamalın
Ayılıb özünü dərk etməsidir.
Segah – nalə çəkən, Rast – tədbirlidir,
Vüqarlı, dözümlü, o səbirlidir.
Yüz ölçür, bir biçir,
            Düşünür dərin,
Mühit dənizi tək o ləngərlidir.
Onun ləngər vuran hər guşəsində
Dərin düşüncələr daldalanıbdır.
Gizli fikirlərin sıx meşəsində
Arzudan, istəkdən od qalanıbdır.

Fikirlər, fikirlər...
            Bir sirdaş olmuş
İnsana...
Dərdinə dolandan bəri,
Rast cavan deyildir,
            O, yaşa dolmuş,
Müdrik bir ürəyin düşüncələri:
Həyat nə?
              Ölüm nə?
                        Ömür nə?
                                    Yol nə?
Qəflət yuxusunu dağıdan nədir?

Qışda yağan qarı, bahar gəlincə
Sellərə döndərib axıdan nədir?
Düzdə ayaq açır dağların qarı,
Hər vaxtın öz quşu, öz budaqları.
Yuxudan qaldırıb ulu dağları,
Bahar havasına oxudan nədir?

Çalır ürəkləri göz baxışıyla,
Boşalır könüllər göz yaşlarıyla.
Yerləri, göyləri öz axışıyla
Haldan-hala salan bu zaman, nədir?

Hökmüylə, qəsdiylə nə deyir zaman?
Uçurur bir yandan, qurur bir yandan.
Günəşin başına dolanır cahan,
Fırlanır, fırlanır, fırladan nədir?
Ay nə, Gün nədir?
İlk nə, son nədir?
Enişi göstərir bizə dağ kimi,
Qaranı göstərir bəzən ağ kimi
Dünyanı oynadır oyuncaq kimi,
Qəsdi bilinməyən bu oyun nədir?
Ay nə, Gün nədir?
İlk nə, son nədir?

Bir aqilin hikmətli nəsihətləridir Rast.
Tarix danışan köhnə rəvayətləridir Rast.

Aqil danışır, canlı misallar çəkir hərdən,
Bir taleyin ibrətli hekayələridir Rast.

Üşşaqda verir sirli suallar bizə rəng-rəng
Eşqin də cavabsız qalan hikmətləridir Rast.

Dilkəşdə pıçıldar bizə dünya kədərindən,
İnsanın ədalətli şikayətləridir Rast.

Öz dərdini qışqırmaz, o, ahəstəcə söylər,
Lakin əzabın son dəmi, sərhədləridir Rast.

Dünyanı gözəl görmək üçün qurbana hazır,
İnsanların ilk arzusu, niyyətləridir Rast.

Ey Bəxtiyar, ah atəşi söz rənginə girməz,
Həm dərdli qürub çağı və həm dan yeridir Rast.

## HÜMAYUN

Milləndi qığılcım kimi zülmətdə Hümayun,
Dağ üstünə dağ basdı müsibətdə Hümayun.
Ülviyyətə, qüdsiyyətə, şeyriyyətə çatmış,
Fəryadda Segah, gizli şikayətdə hümayun.

## ŞÜŞTƏR

Şövkətli, qədim keçmişimin öz dili Şüştər.
Nakam ananın laylası, yüz pərdəli Şüştər.
Felində ağıl nuru saçıb dalğalanırkən
Min ağlı neçin başdan alır bir dəli Şüştər.

## BAYATI-ŞİRAZ

Muğamat qəsrinin gözəl gəlini
Şövkəti-şanıdır Bayatı-Şiraz.
Mizrabda hönkürən sarı simlərin
Çılğın cövlanıdır Bayatı-Şiraz
Sevincdən kədərə, qəmdən nəşəyə
Keçid meydanıdır Bayatı-Şiraz.

## AMAN OVÇU

Maral endi sərçeşməyə,
Sərçeşmədən su içməyə.
Bilmədi ki, pusqudadır
Bərəsində "aman ovçu"
Yaman ovçu,
Zalım ovçu.
Qabırğası qalın ovçu.
Qaçdı, bir az aralandı.
Şaraq-şaraq!
Kürəyindən yaralandı,
Qaçammadı... O dayandı.
Göy çəmənlik qızıl qandan
Oda yandı.
Döndü, baxdı yazıq-yazıq,
Məlul-məlul,
Ovçu, sənin qolun sına.
Necə qıydın bu dağların
Maralına?
Gözlərdəki o çarəsiz yalvarışa
Necə dözdün?
Aman ovçu,
Tüfəngini çiyninə sal,
Bir geri dön,
Bir ora bax.
Bu dəhşətə kol titrədi,
Gül üşüdü.
Baxışdakı o yalvarış
Nəğmə oldu,
Dilə düşdü:
"Aman ovçu, vurma məni,
Mən bu dağın maralıyam.
Yaralıyam, yaralıyam".
Nəğmələrin istisinə
Qızındıqca donuruq biz,
Heykəlləşir heyrətimiz.

## YAĞ, YAĞIŞ

Ağ yel əsir,
Ağ buludlar
Topa-topa,
Tel-tel əsir.
                    Ağ yel əsir.
Pambıqlanan buludları
Kola-kosa
                    asa-asa
Ağ yel, ağ-ağ gül bitirir,
Yağışı da ağ gətirir.
Göydə bulud damar-damar...
Bu ağ yağış
Düz torpağın
                    İliyinə
                    Damar, damar...
Oğul-uşaq gülə-gülə
                    Çıxar çölə.
Üz islanar, göz islanar.
Oğlan qaçar,
                    Qız islanar.
"Yağ, yağışım, yağ yağara.
Daş ağara, dağ ağara.
Ağ buludun toy günüdür,
Gir mağara,
                    Yağ, ey yağış,
                    Vur nağara..."
Yağış yağır,
Ürəyinin yanğısına
                    Dağın, daşın.
Tut ucundan sən göyə çıx,
                    Bu yağışın.
Şırıldayır navalçalar,
Qopub düşür budağından
                    Kal alçalar.
Arxlar daşar, sel oynayar,

Göy əl çalar...
Sellər yıxar bərələri,
Dilləndirər
dibsiz “uzun dərə”ləri...
Uzundərə
Şüştərimdən qopub düşdü,
Sellər, sular çağıldayan
Uzun-uzun dərələrə.
Əlvan-əlvan havalardan aldığımız
Havalar da
Öz sözüdür könlümüzün,
Arzumuzun, dərələrə...

Göy tutular.
Bir tərəfi açıq olar,
Açıq yerdən gün çırtlayar.
Deyərlər ki, indi Günəş
Buludlara oldu günü.
Açıb qızıl saçlarını
Günəş yuyur əl-üzünü...
Bəs bu nədir? Bəs bu nədir?
Bu da özgə bir nəğmədir.
Yağış kəsir...
Qovğası da bitir, demək,
Göyün, yerin.
Göyün təmiz aynasına
Əksi düşür
Çiçəklərin...
Çiçək açır sağdan sola
Göyün tağı.
Göy üzünə çətir çəkir
Göy qurşağı.
“Fatma nənə hana qurur”
Hanadakı rənglərə bax.
Kitab kimi o, oxunur

Varaq-varaq.
O, ürəyin gah qüssəli,
Gah fərəhli hallarımı?
O, muğamın əlvan-əlvan xallarımı?
Hər guşədə neçə-neçə
Rəng çağlayır,
Səslər elə əngindir ki,
Açıb geniş qollarını
Bu dünyanı qucaqlayır.
Əfsanəvi nənəmizin
Ürəyinin tellərindən
Hanasına bənd etdiyi süslərə bax.
Səslərdəki rənglərə bax,
Rənglərdəki səslərə bax.
Gah da olur yağış kəsmir,
Elə yağır, yağır yenə...
Nə əkinə gedən olur, nə biçinə.
Çiyinlərdə həyat yükü dağdan ağır.
Bir yandan da yağış yağır,
Səpələnir sola, sağa,
Aman vermir göz açmağa.
Neyləməli?
– Pas atıbdır oraqlar.
Zəmilərdə diş qıcadır
Alaqlar.
Hər qapıdan pay umub
Qodu gəzir uşaqlar:
"Qodu, Qodu, dursana,
Çömçəni doldursana..."
Əkin-biçin eşqinə,
Ürək yanır, dil yanır.
Bizim mahnılarımız
Bəzən belə yaranır.

## Sayaçılar

Düzdə qızıl bürküyə
Dağda borana düşdük.
Yayda dağa üz tutub,
Qışda arana köçdük.
Qışda dəyə evimiz
Yayda alaçıq oldu.
Qəlbimiztək evimiz
Hamıya açıq oldu.

Düşdük qara, sazağa,
Həm qul olduq, həm ağa.
Qonduq azad quş kimi
Biz budaqdan-budağa.

Sərhəd tanımadıq biz,
Arxalandıq dağlara.
Ləpirimiz yol açdı
Yaxına, uzaqlara...
Qoyun-quzu bəslədim,
Dağ bizə sirdaş oldu.
Yaylaqların çiçəyi
Bizə əyin-baş oldu.

“Nənəm qoyunun ağı
Dolandı, gəldi dağı.
Çobana çarıq bağı,
Qızlara cehiz ağı...

Nənəm, a dəli qoyun,
Dolanıb gəli qoyun.
Gəlinlər güzəmindən
Toxuyar xəli, qoyun.

Nənəm, a nazlı qoyun,
Qırqovul gözlü qoyun.

Pendiri kəsmə-kəsmə,
Qatığı üzlü qoyun...”

Dağlardakı suların
Səsi nəğməmiz oldu.
Dağların sel suyu tək
Qəlbimiz təmiz oldu.

Dağlardan aldığımız
Nəğməni
Qəlbimizin
Fəryadına çevirdik.
Aradan kəsdiyimiz
Qarğı tütəyə verdik.

Biz nəğməylə oyanıb
Nəğməylə də yatardıq.
Biz qoyunu, quzunu
Nəğmələrlə otardıq...

“Nənəm, a narış qoyun,
Yunu bir qarış qoyun.
Çoban səndən küsübdü
Südü ver, barış qoyun”.

Uca dağlar, şiş qayalar boyunca
Zilə çəkər bayatını çobanlar.
Bu səsdəki məlahəti duyunca
Qoyun-quzu ota gələr, dil anlar.
Kiçik-kiçik arxlarım –
Bayatılar, sayaçılar, laylalar
Qayalardan sızılar,
Dərələrə hay salar,
Kürə çatar,
Arazıma can atar,
Bizim muğam dəryamızı yaradar.

Sevinc bizi güldürürsə,
Qəm ağladır.
Sözün özü nə ağlayır,
Nə də gülür,
Amma bizi həm güldürür,
həm ağladır.
Yox, söz deyil, səsdir, axı,
Qəhqəhə də,
Hönkürtü də,
Min cümlədən daha böyük
Mətləb yatır
Bircə qırıq hönkürtüdə.
Könül səsi könül dələr.
Nəğmələrin əvvəlidir
Hönkürtülər, qəhqəhələr.
Bəlkə insan
Sevincini, kədərini
Nəğmələrlə söyləməzdi,
Bizim kimi hönkür-hönkür ağlasaydı,
Qah-qah çəkib gülsəydi söz.
Yox, nəğmələr yaranmazdı,
Qəlbimizdən keçənləri
Tamam deyə bilsəydi söz.
Sözdən əvvəl səs yaranır,
Nəğmələrdir ilk dilimiz.
Nəğmələrdir
Sözümüzün, fikrimizin
ibtidası,
Nəğmələrdir
dilimizin əlifbası.

Daş ürəklərdə yanıb daşları sındırdı muğam.
Haqqa düşmən olanı haqqa tapındırdı muğam.

Nə güman eyləmisən ondakı tilsimləri sən,
"Kürü ahıyla qurutdu", "Salı yandırdı" muğam.

Onun hər guşəsi bir xatirə, bir canlı kitab,
Keçilən yolları hərdən bizə andırdı muğam.

Su çilər kinli ürəklərdə qəzəb tonqalına,
Neçə qəsdin önünü kəsdi, dayandırdı muğam.

O, ürək yanğısı, göz yaşları, bir çəngə bulud,
Oyadıb yaddaşı, vicdanı utandırdı muğam.

Dəfn edin siz məni Zabul segahın mayəsinə,
Deyirəm, bəlkə, məni bir gün oyandırdı muğam.

Çox kitablar oxudum, zənn elədim bəxtiyaram,
Mənə çox mətləbi ahəstəcə qandırdı muğam.

*1975*

# Atılmışlar

*Anamın xatirəsinə*

I Fəsil

**KÖRPƏ**

1

Nə isə düşündü
Duruxdu birdən.
Seçdi bir fikrini min bir fikirdən.
Körpəni aramla bükdü qundağa,
Basdı sinəsinə qalxdı ayağa...

Ümidə yas tutub, ağlayır güman,
Xeyiri şərləyir, şərə "dost" deyir.
Sevilib, sonra da atıldığından
O da balasını atmaq istəyir.

Ancaq... durdu yenə, duruxdu yenə,
Körpəni astaca qoydu yatağa.
Sıxdı döşlərini süd şüşəsinə,
Əmziklə bir yerdə bükdü qundağa.

O, qalxmaq istədi, yenə döyükdü.
O, bir də düşündü son niyyətini.
Bildi ki, şüşəylə birgə o, bükdü
Sonuncu analıq məhəbbətini.
Dizləri titrədi...

– Bu nədir belə?
Bir alov qarsıtdı içindən onu.
Bir neçə damcılıq ana südüylə
Verdi övladına o, son borcunu.

“Analıq, balalıq bumudur məgər?
Çəkdim qayğısını bircə həftə mən.
Yolumun üstündə bala bir çəpər,
O tərəfdə arzum, bu tərəfdə mən.

Şəhərə gəlmişəm uzaq rayondan,
Burda dərs oxuyum, sənət öyrənim.
Məhəbbət dərsindən kəsildim yaman,
Oldu bu körpə də “qiymətim” mənim.

Atamın adına övladım ləkə,
Hər dərdə bənzəməz mənim bu dərdim.
Mən onun başını ucaltmalıykən,
Mən onun adına ləkə gətirdim.

Tapdandı ismətim, bədbəxt yetimlə
Necə keçəcəkdir günüm, ruzgarım?
Neyləyim?
     Atamdan, anamdan özgə
Mən kimə əl açım, kimə yalvarım?

Axsın ürəyimə qoy göz yaşlarım,
Kimsənin önündə əyilməməli.
Nə anam, nə atam, nə qardaşlarım
Bunu bilməməli, yox, bilməməli!..

Basıb sinəsinə o, körpəsini,
Getdi... İki addım atmamış,
                              ona
Qəlbi nəsə dedi...
                    Addım səsini
Bənzətdi o, qapı taqqıltısına...

“Bəlkə o gələcək?
Axı, sevirdi.
O, mənə nə qədər ümidlər verdi.
Bəs sonu?
Bu imiş sevginin sonu?
Dandı sevgisini, dandı borcunu.
Kim qaça bilibdir qədərdən yeyin?
Heç demə, zillətmiş sevgimin adı.
Qadasını alıb sevinc verdiyim.
Özü verən dərdə ortaq olmadı.
Necə də ağırmış, necə də ağır,
Mənim qollarımı qıran bu körpə.
Məgər təkcə mənim öz günahımdır
Yolumun üstündə duran bu körpə?

Özgələr bilməsin dedim, dərdimi,
Özüm öz içimdə yedim dərdimi.
Ağlaram,
Səsim yox,
Hay-harayım yox!
Ahıma səs verən öz ahım oldu.
Bu, mənim dünyaya bala payım yox,
Bu, mənim dünyaca günahım oldu.

İstini yaz bildim,
Yaz açılmadı.
Vaxtsız açan çiçək xar olmalıymış.
Qanunsuz ananın analıq adı
Elə qanunsuz da pozulmalıymış...
Mən baxa bilmirəm bir günah kimi,
Bu təmiz hissimə, məhəbbətimə.
İndi neyləməli?
Xəcalətimi
Girov verməliyəm səadətimə?

Bu sirri gizlətmək mümkünmü?
Mümkün!

Qəlbin dövrəsinə daş hörülməli.
Talesiz balamın yaşamasıyçün
Mənim ana adım öldürülməli!

Mənim ana hissim qəm otağında
Tutsun mənzilini, tapsın yerini.
Tapacaq bəlkə də yad qucağında
Balam öz bəxtini, öz qədərini.
Nə imiş ölçüsü namusun, arın?
O hardan başlanar, o harda bitər?
Dünyada qanunsuz doğulanların
Yaşamaq hüququ yox imiş məgər?

Əgər qaynağından su bulanırsa,
Bulaqlar başına nə kül tökməli?
Atanın, ananın günahı varsa,
Onun cəzasını övlad çəkməli?
Bu nədir?
Bu müdhiş uyğunsuzluğun
Nə ad verməliyik törətdiyinə?
Deyirəm, qanunla qanunsuzluğun
Sərhədi nə imiş, göstərin mənə...”

2

“Şəhərə gəldiyim bir il deyildi,
Sevildim...
            İnandım,
                        sevdim,
                                    atıldım.
Ömrümün düz yolu necə əyildi,
Yanıb kül olmadım, yanıb ayıldım.

Səhvlər...
Düşünür hamı xeyrini,
Mən seçə bilmədim xeyiri şərdən.
Düz düzü gətirir, əyri əyrini,
Qorxuram yenidən səhv eləyim mən?!

Bəzən bircə anın yanıltısından
Bütöv bir ömürü uduzur insan!
Kimdir yıxılmayan? Məgər təkəm mən?
Bu dərdə düşənlər dünyada min-min...”
...Səhvinə haqq verib əzab çəkməyən
Düşür tələsinə ikinci səhvin.
“İndi neyləməli?
                    Ömrüm boyunca
Bir səhvin oduna külmü olum mən?
Bəsdir alışdığım, yandığım bunca,
Başlamaq gərəkdir ömrü təzədən.
Hələ nə görmüşəm? İyirmi bahar,
Bu yaşda özümü kəfənləyim mən?
Yox! Belə yaramaz!
                    Axar sel-sular
Kol-kosa ilişən çör-çöpün üstdən.
Niyə şişirdirəm mən öz dərdimi?
Yaşamaq!”
Yaşamaq bir insan kimi
Kiminə asandır, kiminə çətin.

Dünya süfrəsidir nazi-nemətin.
Orda qəm çəkənə qəm əksik deyil,
Orda dəm çəkənə dəm əksik deyil.

“Elə ömrüm boyu gərək ağlayam?
Mənimçin dünyanın tək qəmi qalmış?
Elə bil naz-nemət qurtarıb tamam,
Dərd çəkib, qəm yemək mənəmi qalmış?

Yox! Daha bəsimdir, bəsimdir!” – deyə
Baxdı,
O həsrətlə baxdı körpəyə.
Bələyin üstünə axırdı dən-dən
Göz yaşı – əzabı, ələmi, dərdi.
Hara getdiyini heç kəsdirmədən
Elə addımlayır, elə gedirdi...

Külək vıyıldayır,
Qar sovururdu.
O, yenə dayandı,
O, yenə durdu.
Bəlkə, yolu azıb?
                    Sonuncu mənzil
Bəllidir...
          Getdiyi bu yolu deyil,
O, ömür yolunu azıb, çaşdırıb.
Başını qundağa yaxınlaşdırıb,
İsidir körpəni od nəfəsilə.
Bəlkə, son borcunu ödəyir belə.
Çatdı bir həyətə...
Döyükdü,
Durdu
O, uçunurdu.
Bir sağa çevrildi, bir sola baxdı,
Boylanıb həyətdən o, yola baxdı.
Girdi bir dəhlizə... Mərmər pillələr
Daş üzə bənzər.
Gözünün ucuyla qundağa sarı
Baxmadan
          astaca qalxdı yuxarı.
Meydança üstündə qoyub körpəni,
Endi pilləni,
Endi!
          Endimi?
Körpə anasından ayrıldığını
                    hiss etmiş kimi
                    çığırdı birdən.
Elə bil püskürüb od çıxdı yerdən,
Bürüdü ananı...
Durdu yerində.
İldırım şaqqıdı bəbəklərində.
      İstədi qayıda...
      Ancaq qaçdı o,
      Bala naləsindən uzaqlaşdı o.

Dondu dodağında bir "can" kəlməsi,
Qaldı qulağında körpənin səsi.
Ayaq tappıltısı...
O, dönmür dala,
Qaçır, xəyalında qovur an anı...
O elə bilir ki, bu qaçışıyla
Açır xoşbəxtliyin qapılarını.
Üz tutub sabaha bu gündən qaçır,
O, bu qaçışıyla özündən qaçır.
O qaçır analıq məhəbbətindən,
O qaçır özünə öz töhmətindən.
Qaçır, könlündəki bərədən aşıb...
Amma yaxşı bilir o, nədən qaçır.
Özgələr gözündə günahsızlaşıb,
Təmiz görünməkçün ləkədən qaçır.

Hələ eşidilmir ürəyin səsi...
İnanır o səsin boğulduğuna.
Özgələr önündə pak görünməsi
O, hələ bilmir ki, ləkədir ona.

Qaçır,
amma bilmir o, nəyə qaçır.
Ləkədən qaçırkən ləkəyə qaçır.
İnsan bir ömürdə ikidir, iki
Atıb körpəsini elə bildi ki,
Adının üstündən ləkəni atdı,
Özünə başqa bir tale yaratdı.
Təmizə çıxartdı o öz adını
Sabaha uzanan qol-qanadını
Körpə bağlamışdı...
Qolunun üstdən
Onu daş pillənin üstünə qoydu.
Qolları boşaldı.
Yolunun üstdən
Körpə götürüldü... Bu nə yoluydu?
Hara aparacaq bəs bu yol onu?

Nə imiş görəsən, bu yolun sonu?
Qollar körpəsizdi...
Ancaq bu gündən
Qollar ağırlaşdı yüngüllüyündən.
Körpənin yerinə indi də vicdan
Asıldı ananın qol-qanadından.

3

Çatdı mənzilinə taqətsiz, bihal,
Qırıq çarpayıya uzandı dərhal.
Yumdu gözlərini...
Gördü yüz yerdən
Gözünü zilləyir ona körpəsi.
Açdı gözlərini...
Pəncərələrdən
Doldu otağına körpənin səsi.
Gördü ki, otaqda hər şey qışqırır.
Açdı pəncərəni, yer-göy qışqırır.
Qışqırır masanın üstə kitablar.
Qışqırır qapı da, pəncərələr də.
Qışqırır çarpayı, qışqırır divar,
Qışqırır görpənin yatdığı yer də.

Tutdu qulağını sıxdıqca sıxdı,
O elə bildi ki, səs çöldən gəlir.
Gördü bu səs deyil, bu qışqırıqdı,
Bildi ki, qəlbindən, könlündən gəlir.
Su içdi, boğazda tıxanıb qalan
Qəhəri ötürə, bir uda, bəlkə.
Açdı radionu,
ona yük olan
Dərdini bir anlıq unuda, bəlkə...
“Cavan analara söhbət, məsləhət”.
Bu da başqa töhmət, başqa məzəmmət!
Radionu susdurdu.
Ayağa durdu...

Söhbət qulağında səsləndi yenə.
Hər şey elə bil ki, durub qəsdinə,
Kəsir yolunu.
Hansı bir qüvvəsə
özü bilmədən
Qəfil itələdi içindən onu.
Görən, birdən-birə ona nə oldu?
Bayaqkı qəsdini, yoxsa danırdı?
Baladan qaçdığı bu yollarla o,
İndi balasıyçün qanadlanırdı.

İndi o yüyürür dala baxmadan,
Bayaq yüyürmürdü, o sürünürdü.
Bayaq analığı tapdayıb danan
İndi ana olub geri dönürdü.

O, boğa bilmədi qəlbin səsini.
O uçur,
O qaçır dar döngələrdə.
Kim bilir, kim bilir, o, körpəsini
Tapa biləcəkmi qoyduğu yerdə?

Bir oxun başına necə dolanır
Niyyətin qarası, arzunun ağı.
Bir insan ürəyi xoşbəxtlik sanır
Bayaq itirməyi, indi tapmağı.

Yüz rəngli, yüz səsli istəyimizlə
Bir saat içində yüz adamıq biz.
İlkini başladın, sonunu gözlə,
İnkarla təsdiqdə bütöv, tamıq biz.

Gecənin yarısı... Küçələr lal-kar.
Yağdıqca sulu qar tərləyir yollar.
Sulu qar əriyir...
Xəcalətindən
Elə bil tər tökür puçur-puçur yol.

O qaçır, yel kimi burulur tindən,
O önə qaçdıqca dala qaçır yol.

O çatdı həyətə... yumdu gözünü,
Mərmər pillələrə atdı özünü.
Körpəni görmədi qoyduğu yerdə,
O, bir daşa döndü daş pillələrdə.
Döşəndi yanına
                körpəyə sarı
Uzanan o titrək, gücsüz qolları.

Bu qollar bezmişdi bu gün körpədən,
Bu qollar körpəyə uzanır indi.
Bu qollar buz kimi soyuqdu nədən?
Bu qollar üstündə can yanır indi...
– İndi mən neyləyim, neyləyim? – dedi.
Bir-bir qapıları döymək istədi.
Dayandı...
    Ahının şölələrində
Elə bil qəfləti bir ulduz doğdu.
Hardasa qəlbinin gizli yerində
Sevindi...
    Bir qədər yüngülləşdi o.
– Mən ki peşman olub döndüm geriyə.
Qədər öz hökmünü belə döndərir.
"Bəlkə xeyirlisi beləymiş" deyə,
İndi öz-özünə təskinlik verir.

Vicdandan asılıb ürəyi dartan
Yükün ağırlığı azaldı bir az.
Özünü aldadıb yaşayır insan,
Bəlkə, bu alversiz yaşamaq olmaz.

Ancaq bu məqamda bir mətləb də var:
Bir dəfə aldanan yüz yol aldanar.
İkinci günaha yol verər insan,
Birinci günaha haqq verən zaman.

4

Keçdi bir neçə gün qaralı, ağlı,
Gah açıqqabaqlı, gah qaşqabaqlı.
O, qəsdən qəşş edib gülürdü bir an,
Qəlbində mələyib onu sarsıdan
Körpənin səsini batırmaq üçün,
Ancaq güclənirdi o səs günbəgün:
Dəniz nəriltisi, su şırıltısı,
Yarpaq pıçıltısı, yel vıyıltısı
Onun qulağında ana axtaran
Körpə balasının hıçqırığıydı...
– Mənim daş ürəyim, yoxdur bir soran
Analıq hissinə bəs necə qıydı?
O, bir yer istəyir, o, bir yer ancaq
Uzaq, uzaq olsun bu səsdən uzaq!
Yox! Qaça bilmədi o bu səslərdən.
Nahar eyləyəndə sızlardı hərdən
Döşünün giləsi, döşünün ucu.
Bu, onun ən böyük günahı, suçu.
Bu nə müsibətdir, gülüşlərində
Hönkürür qəlbinin hayı, harayı.
Özü çörək yeyir...
                Amma döşündə
Sızlayıb ağlayır körpənin payı...

Bu nə müsibətdir, bu nə müsibət,
Buna tablamağa bir ürək hanı?
Bu necə dəhşətdir, bu necə vəhşət,
Necə susdurasan burda vicdanı?

Həyat nə oyundur, nə də oyuncaq,
Dandığın gerçəyi gerçək bil yenə.
İnsan bir əlilə yandırır,
                            ancaq
O biri əlilə vurur dizinə.
O da dizlərinə vurub ağladı,
Oturub ağladı, durub ağladı:

-Qalmadı bir şeyə – dedi – gümanım,
Saçımı dərd yoldu, qəm daraqladı.
O qədər ah çəkdim,
ahım, amanım
Viranə könlümdə tüstü bağladı.
Düşüb qasırğaya borana könlüm,
Azmışam yolumu qəm meşəsində.
Elə dağ-dağ olub viranə könlüm,
Arılar şan bağlar hər guşəsində.

Ümidlə, inamla yaşayır ana,
Günləri, ayları ötüşür belə.
Küçədə, bayırda uşaq gördümü,
Baxır diqqət ilə baxır zənn ilə.

Axtarır özünün cizgilərini
O gah bu uşaqda, gah o uşaqda.
Kimsəyə açmayır ancaq sirrini,
Gözləri axtarıb hey aramaqda.

Belədir əzəldən, belədir qayda:
Tapmaq çətin olur, itirmək asan.
İndi ağlayırsan...
Ancaq nə fayda
Özü yıxılanın ağlamağından!

Bəs körpə?
Nə yazdı bəxtinə ruzgar?
Körpələr evinə verdilər onu.
Atalı, analı yetim balalar,
Yaxşı ki, bilməyir atıldığını.

Bilmədi...
Bəs sonu?
Sonu müsibət!
Bu dərdi söyləmə qəlbidaşlara.
Yaxşı ki, hökumət, yaxşı ki, dövlət
Yenə sahib durur atılmışlara!

II Fəsil

## QOCA

1

Ana tanıyıram iyirmi yaşından
Dul qaldı.
Bəlalar ötdü başından.
Dərdi qabaqladı.
                    Kədəri ötdü.
İki nər cüssəli bala böyütdü.
Biri çatan kimi on yeddisinə.
Səs verdi vətənin çağrış səsinə
Getdi od içinə.
Getdi,
Gəlmədi.
Gənc ömrü yarımçıq bitdi,
                                  gəlmədi.
Ana kiçiyinə ümid bağladı,
Dərdini gizlətdi, gecə ağladı.
O, bircə arzuya, bircə niyyətə
Verdi ürəyini, verdi büsbütün.
Dözdü hər ağrıya, hər əziyyətə,
"Bir övlad böyütdü bir afət üçün".
Ona toy elədi.
                    Ömür yükündən
Sandı ki, azaddır bu gündən bəri.
Ancaq o bilmədi,
                    elə o gündən
Başlanır ən böyük müsibətləri.

Ana öz işini tamam bitirdi.
Bitirdi!
Hər şeyi, demək, itirdi.
Vəzifən bitdimi, borc ödəndimi,
Üz astara dönür, astar üzləşir.

Geyilib atılmış bir paltar kimi
İnsan da bu zaman gərəksizləşir.

Ayıra bilmədi yoxuşdan diki,
O, bunu bilmədi,
Nə biləydi ki,
Hər hökmün bitəcək iş-güc bitəndə,
Hörmətin itəcək hökmün itəndə.

Bir vaxt ayıldı ki, dəyişib yerlər,
Çömçə isti olub indi qazandan.
El ağzı –
fal ağzı
yaxşı deyirlər,
Köynək yaxın imiş ürəyə candan.
Bir vaxt ayıldı ki,
keçib iş işdən,
Baxışlar soyuyub, üz yaman dönüb.
Ana başa düşdü, bu tərpənişdən
Oğul da, deyəsən, anadan dönüb.
Gördü ki, hökmünü
O, bircə-bircə
İtirir...
Hörməti əlindən gedir.
Bir vaxt ayıldı ki, builki sərçə
Bildirki sərçəyə civ-civ öyrədir.

Köhnəlik – qaynana.
Yenilik-gəlin!
Hərə öz fikrində haqlı,
həm doğru!
Gələn yeni ilə gedən köhnənin
Sonu görünməyən döyüşüdür bu.

Ana bu ocağa gəlin gələndən,
Bu qədim yuvada bir qayda vardı:
Gəlinlər oyanıb hamıdan erkən

Ərləri yedirib yola salardı.
Ana bu qaydanı müqəddəs bilir,
Ana bu qaydanı yaman güdürdü.
Ana bu qaydanı indi hər səhər
Təzə gəlinindən tələb edirdi.

Gəlinsə yatırdı doqquza qədər,
Oğul acqarına işə gedirdi.
Bir gün,
     beş gün,
               on gün!
                         Ötdü beləcə.
Ana nə danışdı,
               Ana nə dindi.
Gördü ki, oğul da dinmir...
                         Bir gecə
Dözmədi...
Gəlinə yaman təpindi.
İki əqidənin, iki cəbhənin
Döyüşü başlandı sükutdan sonra.
Ana dözəmmədi...
Bu təzə gəlin
Təzə nırx qoyanda köhnə bazara.

Partladı ürəklər,
Açıldı üzlər.
Yaman qanad açdı latayır sözlər.
Gəlin qaynananı bükdü bucağa:
– Gözünü dünyaya yaxşı aç, – dedi.
İndi mən sahibəm, mən, bu ocağa.
İşə bax!
     Yerliyə yersiz qaç – dedi.

Köməyə çağırdı ana oğlunu.
Oğul danışmadı...
Durdu kirimiş.
Ana bilmədi ki, bu imiş sonu,

Gəlin gələn kimi oğul itirmiş.
Ara verilmədi evdə davaya,
Ürəklər partladı qəzəbdən, kindən.
Oğul barış üçün girdi araya,
Heç biri dönmədi öz cəbhəsindən.
– Bizim zəmanədə belə deyildi.
– Saxla! Çoxdan bitib sənin zamanın.
Ana bilmədi ki,
                Günəş əyildi,
Öz təzə hökmü var təzə dövranın.
Elə ki qocaldın,
Bil öz yerini!
Oynaya bilmirsən, göz yum hər şeyə.
Əlacın odur ki,
                Gördüklərini
Vurasan həmişə görməməzliyə,

Bu da nöqsanıdır Qorqud Dədənin,
Dördcə naxışında yanıldı nəqqaş.
Oğulu anadan ayıran gəlin,
"Gəlin" yox,
     "Ayıran" çağrılaydı kaş!

Oğul arvadına haqq verdi yüz yol,
Ananın könlündə düyünləndi daş.
Bir deyən olmadı, ay dönük oğul,
Axı, üz var idi, saqqal çıxmamış.

Ümidlər, arzular gördü talanmış,
Ayıran dırnağı ətdən ayırdı.
Bir deyən olmadı, a canıyanmış,
Axı, diş yox ikən dodaq ki vardı.

Gördü ki, bu oğul, o oğul deyil,
Gördü ki, umubmuş zərərdən xeyir.
Belin ağrısını, gördü, bel deyil,
Kəmər inildəyib çəkmək istəyir.

Ürək ağrılarla dolub daşanda
İnsan başdan-başa gileyləşərmiş.
Yad qızı ocağa doğmalaşanda,
Doğmalar get-gedə ögeyləşərmiş.

Ana öz işini tamam bitirdi.
Bitirdi...
Hər şeyi, demək, itirdi.
Bu dünya belədir,
                Baxmır fəryada.
Vaxt çatdı.
Köçünü çək yavaş-yavaş.
Vəzifən bitdimi sənin dünyada –
Özünü bitmiş bil, özünü, qardaş!

Bu dünya belədir,
                Götürə bilmir
Saxta bir bəzəyi, saxta bir süsü.
Nəfs artıq tikəni ötürə bilmir
Gərəklik – insanın dəyər ölçüsü!
Gərək bilirlərsə dünyada səni,
Böyründə-başında dost görəcəksən.
Elə ki, itirdin gərəkliyini,
Dünyada hər şeyi itirəcəksən.

Yerləri astaca dəyişir zaman,
Baxmır nə fəryada, nə göz yaşına.
Dünənki məqamı əlindən çıxan
Dünəni bu günün qaxır başına:

– Səni bu dünyaya mən gətirmişəm,
Sənə döşlərimdən mən süd vermişəm.
Gecələr yatmadım yatasan deyə,
Böyüdüb çatdırdım səni ərsəyə.

Mən sənin həm atan, həm anan oldum,
Axırda beləcə aldanan oldum.
Ananı özünə yad tutdun, oğul,
Borcunu nə yaman unutdun, oğul?

– Adicə bir işdir bala yetirmək
Ananın analıq təbiətinə.
Məlum gerçəkləri dilə gətirmək
Yaraşmır, ay ana, ləyaqətinə.

Əmanət kassası deyil uşaqlar,
Xərcindən kəsərək qazanc görəsən.
Artıq gəlirini orda saxlayıb,
Sonra faiziylə ömür sürəsən.

Uşaq tək baxırıq oğula, qıza,
Bilmirik böyüyür ilbəil övlad.
Rahat yaşamaqçün
                sabahımıza
Dünən verdiyimiz borc deyil övlad.

Yanında böyüyür...
                Ancaq yaxşı bil,
Oğul da yar üçün, qız da yar üçün.
Övladlar, övladlar! Bizimçün deyil,
Biz onlar üçünük, biz onlar üçün!

Övlad – sevgimizdən göyərən nübar,
Təzədən yaradır övladlar bizi.
Odur ki borcunu deyil,
                            qoy onlar
Bizə qaytarsınlar öz sevgimizi.

Ay ana, asandır borcu qaytarmaq,
Sevgini qaytarmaq çətindir, çətin!
Övladlıq borcunu ödəmək ancaq,
Əvəzi deyildir hələ sevginin.
Övlada borcunu yada salanda,
Ana sevgisini umur oğuldan.
Məhəbbət!
                Məhəbbət unudulanda,
Borcunu istəyir borcludan insan.

2

Yığılıb məclisə dostlar, tanışlar,
Oğul ad gününü keçirir bu gün.
Sağlıqlar baş alır:
−Bir arzumuz var:
Daim çiçək açsın qoy sənin ömrün.
Qapının dalında dayanıb ana,
Məclisi dinləyir:
– Sənin zəkana,
Sənin hünərinə biz ki məftunuq.
Ana fərəhlənir...
Ancaq neyləsin,
İçəri girməyə ixtiyarı yox.

– Bu gözəl dünyaya səni bəxş edən
Anaya afərin, anaya əhsən!
Necə fərəhlənir, sevinir ana,
Qapının dalından baxır oğluna.
Belə də dərd olar?
Oğul doğasan,
Onun şad gününə gendən baxasan?
Dözmədi...
İstədi keçib içəri,
Qışqıra, deyə ki, bayaqdan bəri
Əhsən dediyiniz ana mənəm, mən,
Mənəm onu doğub özgəyə verən.
Saxladı özünü, azca qımışdı.
Səhərki söhbət
Yadına düşdü,
Gəlin demişdi:
−Cavanlar gələcək, cavanlar ancaq.
Bugünkü məclisin sənə dəxli yox.
−Hə, başa düşürəm.
Nə desin ana,
Anladı, balanın doğum gününün
Bir dəxli yox imiş oğul doğana...

Olmadı, olmadı bir deyən ona:
– Bəs doğum günündə şadlıq etdiyin
Oğulu kim doğub, ay nankor gəlin?
– Bu gözəl ölkəyə səni bəxş edən
Anaya afərin, anaya əhsən!
Dilxor oldusa da sağlıqdan yana,
Gəlin susdu...
Bu yerdə o, dinə bilməz.
Şəninə təriflər söylənən ana
Qapı dalındadır,
                    bilmədi bir kəs.

– Bu sağlıq üstündə indi gərək sən,
“Ana” mahnısını çalasan bizə.
Övladın analıq məhəbbətindən
Qoy atəş çilənsin ürəyimizə.

Oğul bir inamla qalxdı ayağa,
Divardan tarını aldı ürəklə.
Ana ürəyini duya bilməyən
“Ana” mahnısını çaldı ürəklə.

Bəs niyə kövrəldin, gəlin, ay gəlin,
Öz mərhum ananmı durdu gözündə?
Bəs ana qəlbinə niyə dağ çəkdin?
Axı, bir anasan sabah özün də.

Boylusan... Zaman da yaman dövr edir,
Sən nə ilk anasan, nə də son ana.
Bəs ana deyilmi, özün söylə bir,
O qapı dalında qoyduğun ana?

Sən də bir anasan, gəlin, ay gəlin,
İndini sabaha girov vermisən.
Əgər qaynanana elədiklərin
Gəlsə öz başına, götürərmisən?

Nə tez doğmalaşdın sən yad oğluna?
Ana öz oğlunun çiyninə yükmüş.
Sən demə, ananın haqqı yox ona,
Amma yad qızının haqqı böyükmüş,
O da haqq, bu da haqq!
                    Haqsızlığa bax!

Dəyişir yerini necə də haqlar.
Dövran dolandıqca, dünənki qonaq
Bu gün sahib olub, səni ayaqlar.

Balanın ad günü yazıq ananın
Şad günü olmadı, dad günü oldu.
Başında turp əkdi o, qaynananın,
O, gəlin olmadı, o, günü oldu.

Gəlin nə dedisə ər qulaq asdı,
Gəlin qaynananı bucağa basdı.

Göydən ulduz tökdü amansız gəlin,
Zərbini göstərdi,
Qələbə çaldı.
Üççə ay keçməmiş bu qansız gəlin
Evdə hakimliyi əlinə aldı.

Ana danışmadı,
                    kiridi, susdu.
Axı, çoxlarını qınamışdı o.
İndi öz başına gəldi...
                              İşə bax!
Bircə şey düşünür, bircə şey ancaq:
"Hər şeyə dözərəm, təki tək balam,
Qəlbi qırıq balam, o kövrək balam
Fikir eyləməsin, heç darıxmasın.
Bir də... evin sirri çölə çıxmasın..."
Ana başa düşdü: Bu haya, küyə
Dözməz.

Oğluna da o qıya bilməz.
Yox, yox! Bundan sonra dözüb hər şeyə,
Gəlinlə bir evdə yaşaya bilməz!

Atdı anasını ikinci oğul
Anası bir kəlmə dedi: – Çox sağ ol,
Boğdu içindəki üsyan səsini.
Dedi: Neyləməli, beləymiş qədər.
Yığdı boğçasını, düyünçəsini,
Qocalar evinə köçdü bir səhər.

III Fəsil

## Qocalar evi

1

Əyləşir qocalar ikibir, üçbir.
Qocalar evinin dəhlizlərində.
Ömür kitabları sətirbəsətir
Oxunur onların bənizlərində.

Nədənsə danışır solğun baxışlar,
Orda təəssüf də, təəccüb də var.
Hansı əzabların şırımlarıdır
Üzlərdə açılan dərin qırışlar?

Bir ömrün zirvəsi...
Tərəzi,
çəki.
Azmıdır, çoxmudur xeyri şərindən.
Həyatın qayğısı, həyatın yükü
Artıq götürülüb çiyinlərindən.

Yoxdur bu dünyadan qəsdi, qərəzi,
Xoşbəxtmi, bədbəxtmi bu halında o?
Qurulur içində mizan-tərəzi,
Görən, nəyi çəkir xəyalında o?

Tərəzi gözləri... tutuşdu, endi,
O, ürək açmağa sirdaş axtarır.
Verib cəmiyyətə borcunu...
İndi
Haqqını çəkməyə bir daş axtarır.

Borcunu namusla verən kəslərin
Haqqını mümkünmü daş ilə çəkmək?
Yox! O ağırlıqda daş hanı? Yəqin,
O haqqı borcunla çəkəsən gərək.

Gənclik – arzuların uçuş nöqtəsi,
Qocalıq – qonduğun sonuncu məskən.
Sənə pıçıldayır ömrün zirvəsi,
Düşün, nəyi nəyə qurban vermisən?

İndi qazancın nə, uduzduğun nə?
Görürsən axırda hamısı birdir.
İstər ağlayana, istər gülənə
Onsuz da bu dünya həmişə sirdir.

Kim aça bilibdir bu sirri, de, kim?
Çoxu qora ikən mövüc olubdur...
“Dünya mənimkidir” söyləyən hakim
Dünyanın əlində mürmüc olubdur.

Bizə təbiətin verdiklərini
Zaman alır...
Bizə qocalıq qalır.
Hər gələn gedənin tutur yerini,
Zaman təbiətdən intiqam alır.
Sönüb ocaqları, sönüb odları,
Dərin düşüncələr baş alıb gedir.
Həyat yox,
arzu yox,
İndi onları
Düşüncə tərpədir, fikir tərpədir.
Yata da bilmirlər...
Sübhədək oyaq.

Oyulur döşəkcə, oyulur balış.
Adamlar bir yana,
Sən bir işə bax,
Qocadan yuxu da bezar olarmış.

Çiynindən düşdümü həyatın yükü,
Həyatın ləzzəti bitdi büsbütün.
Arzular eşqinə yox, bunu bil ki,
İndi yaşayırsan yaşamaq üçün.
Ölüncə bu yükdən həzər eyləmə!
Gileylənmə, gəl.
Çək onu ürəklə!
Həyat, sən demə,
Həyatın yükünü çəkərkən gözəl!

2

Qocalar evində səliqə, sahman...
Otaqda hər kəsin öz guşəsi var.
Masanın üstündə gözlük, qələmdan,
Qəzetlər, jurnallar, cild-cild kitablar.
Dolabın üstündə kibrit və siqar,
Cürbəcür nüsxəli həblər, dərmanlar.
Balaca otağın baş divarından
Cavanlıq şəklini asıb hər biri.
Güzgüdə özünü gördümü? Bir an,
Şəkilə zillənir tez nəzərləri.

Bu gün, dünən ilə durur yan-yana,
Dayanıb arada uçurum – illər.
Xəyalın xatirə qanadlarına
Sığınıb,
Dünənə uçur könüllər.

Gah ona,
gah buna dönür baxışlar,
Təəssüf bu günə, alqış dünənə!

Güzgüyə baxanda əyilən başlar,
Şəkilə baxanda diklənir yenə.
Bu günü – qocalıq, sabahı – torpaq,
Dünənlə yaşayır, dünənlə ancaq!

Üç oğul atası çilingər əmi
Qocalar evinə yenicə köçmüş.
Dünyanın kədəri, dünyanın qəmi,
Elə bil çiynindən qəlbinə çökmüş.

Qocalar evinin qaydalarına
Nə qədər çalışır uyuşa bilmir.
Yaman ağır gəlir atılmaq ona,
Pəncərə önündən bir an çəkilmir.

O, hər gün gözləyir, “yox, ola bilməz,
Atalar, analar atıla bilməz”.
Çırpınır ürəyi bu dar qəfəsdə,
Gözləri bayırda, qulağı səsdə.

Beləcə günləri o yola saldı,
Kişinin gözləri yollarda qaldı.
“Demək haqq da məndə, günah da məndə...
Onların bir sözü yalan olmadı.
Ya haqlı, ya haqsız, mən inciyəndə,
Bir dəfə könlümü alan olmadı,
Qolunu boynuma salan olmadı.
Təkliyin qəmini tək özüm yedim,
Əhvalım, ovqatım heç sorulmadı.
Neçə yol hirslənib “gedirəm” – dedim,
Bir yol qabağımı kəsən olmadı.

Qalmayıb amanım, qalmayıb heyim,
Könül xanımanım nə tez uçuldu.
Öz isti yuvamdan köçüb gəlməyim,
Sən demə, onların könlündən oldu...”

Bir gün zəng də çaldı evə çilingər,
Nəvəsi götürdü dəstəyi...
– Bəli!
Bilmədi nə desin?
Yaşardı gözlər.
Titrədi dodağı,
Titrədi dili...
Nəvəsi qışqırdı: – Cavab versənə!
Avaranın biri. Susdu o yenə.
Amma tel-tel oldu qəlbi bu səsdən,
Dedi: – O düz deyir, avarayam mən.
Dəstəyi asınca ürəyindəki
Yaralar qövr etdi...
Doğulan təki
Qoca, nəvəsinə adını verdi.
Nəvə babasına çox bənzəyirdi.

Düşündü: "Eybi yox, dolanıb dövran,
Yerbəyer eyləyər tez-gec hamını.
Alar mənim nəvəm öz atasından
Bir gün babasının intiqamını".

Qızıl çərçivədə köhnə bir şəkil:
Rəqs edir ucaboy, gözəl bir oğlan.
– O kimdir?
– Yaxşı bax.
– Gözüm kor deyil.
Tanıya bilmirəm.
Hirsləndi rəqqas:
– Məni tanımırsan?
Gözlüyünü tax,
Bir də yaxşı bax.
– Səni tanıyıram, onu yox ancaq.
– Hə... bunu düz dedin, nə qaldı bizdən?
Çoxdan ayrılmışıq öz-özümüzdən.
Buro-buro deyən günlərim vardı.

Mən idim bəzəyi toy-düyünlərin.
Qızlar da həsrətlə mənə baxardı,
Eh, keçən günlərim, keçən günlərim,
Deyib qoca rəqqas ah çəkdi...
Yenə,
Oğrun baxışlarla baxdı şəklinə.
Qaydadır həsrətlə baxar həmişə
Cavan gələcəyə, qoca keçmişə.

Cavanın sərvəti – hələ öndədir,
Qocanın nəyi var – keçmişindədir.
O: – Keçən günlərə gün çatmaz – deyə
Siqar tüstüsünü çəkdi sinəyə.
– Ə... fikir verirəm bayaqdan sənə,
Çəkirsən dalbadal, çəkirsən yenə.
Tərgidə bilmirsən, azalt bir qədər,
Canına yazığın gəlməyir məgər?
– Nə can? Gün axşamdır, ölümdən danış,
Artıq nə can qalmış, nə ömür qalmış.

– Deyirsən, tirlənib uzanaq indi?
Ömrün qalan payı daha şirindi.
Sən o zəhrimarı bir qədər az çək,
Gör nə günə salıb səni öskürək?
Çöldən tapmamısan, axı, bu canı,
Onun əvəzinə iç o dərmanı.
– Hansını deyirsən? O sarı tozu?
Özünü aldadıb yaşamaq yetər.
Dibindən quruyan ağacıq... Bizi,
Nə gübrə göyərdər, nə su göyərdər.
– Sus, elə danışma, qorxuram.
– Nədən?
– Yox, hələ yaşamaq istəyirəm mən.
– Bəs mən istəmirəm?
– Ömür çox gödək!
– Gec, ya tez, yaranan bir gün gedəcək.
– İnsan iki dəfə yaşayaydı kaş!

Yaman üşüyürəm...
– Mən də a, qardaş!
Neçə dərəcədir istilik görən?
Hava çox güman ki, soyuyub yenə,
Bir o dərəcəyə göz yetirsənə.
Gözlüyü tax.
– Kişi, görür gözümüz.
Gözlüyü gözümə sən dürtmə tez-tez.
O qalxdı,
boylandı termometrə,
Çırpdı dizlərinə o, birdən-birə:
– Sən öl, bir işə bax, iyirmi səkkiz!
– A kişi, bəs niyə üşüyürük biz?
– Hava nə istiymiş, xəbərimiz yox.
– Çölümüz istidir, içimiz soyuq.
İndi sən gördünmü haqlıyam, lələ,
Davadan, dərmandan kar aşmaz bizə.
Boş-boş ümidlərlə, təsəllilərlə
Özünü aldatmaq yaraşmaz bizə.

– Bircə yay gələydi...
– Nəyinə gərək?
Dinmədi, kiridi.
– Susma, de görək.
– Qəlbim nəyi isə gözləyir müdam
Ancaq gözləyəndə yaşayır adam.
– Bizimçin yaz ilə qışın nə fərqi
Yüz ilə, on ilə beşin nə fərqi.
Ölüm kandarında dayanmışıq biz
İndi bu dünyada gözlədiyimiz
Yalnız bircə şey var: Ölüm!
– De, kiri!
Məlum həqiqəti möcüzə kimi
Dürtmə gözümüzə, bilirik bunu,
Bilirik dünyanın puç olduğunu.
-Kişi, indi zaman o zaman deyil
Dünyanın başına havamı gəldi?

Kökündən dəyişib hər şey elə bil
Bizim vaxtımızda belə deyildi.
İndi havanın da dəyişib qəsdi
Əvvəllər hər fəslin öz dəmi vardı.
Nə baş gicəllədən yay elə isti,
Nə də qış bu qədər soyuq olardı...
– Vallah, düz deyirsən, dəyişib hər şey
Nə yer həmən yerdir, nə göy həmən göy.
Görmürsən, uzanıb indi gecələr
Vallah, uzaq düşüb gecədən səhər.

Günəş doğanadək o yan-bu yana
Dönməkdən canım da gəlib cəzana.
Sevinci, ləzzəti bitdi dünyanın
Ən gözəl vaxtları getdi dünyanın.
– Bir sözlə, hər şeyin qalıb tək adı
Dəyişib ləzzəti, dəyişib dadı
Hanı o bulaqlar, hanı o sular?
Mən uşaq olanda qoyun-quzular
Necə mələşərdi... hanı, bəs hanı?
Qoyun da, quzu da indi ağzını
Elə açıb-yumur, mələmir niyə?
...Qulağı da ağır eşidir deyə
Elə zənn edir ki, mələmir daha
Nə qoyun, nə quzu...
– Pənah Allaha.

– Hələ adamlar da dəyişib tamam
Düzü, bu işlərə lap mat qalmışam.
Boylar da kiçilib ürəklər kimi
Əvvəlki o nəhəng adamlar hanı?
Tanıya bilmirəm köhnə dünyanı
Mənim yaşıdlarım bilmirəm nədən
Çox yaşlı görünür məndən... hə... dünən
Məktəb yoldaşımı gördüm bağçada
Yaman vayxırlayıb, qocalıb o da
Tanıdım kişini mən görən təki
O isə o qədər dəyişibdi ki,

Məni tanımadı...
Deyərək qoca
Şirin nağılına güldü doyunca.
Sonra birdən-birə o köks ötürdü
Yoxsa divardakı asma güzgüdə
Özünü gördü...
Baxdı, xeyli baxdı, bir az diksindi
Dedi: – Güzgülər də dəyişib indi.
O qədim, o gözəl güzgülər hanı?
Yoxsa gözəlliyin bitdi zamanı?

3

Bir şəkil çıxartdı cibindən qoca.
Baxdı, xeyli baxdı, baxdı doyunca.
– Bu oğlum, bu qızım...
– Bəs bu balaca?
– Nəvəmdir, bu yeznəm, bu da...
– Hə, kimdir?
O, gəlinimdir.
– A kişi, sənin ki, uşaqların var,
Sən allah, bəs burda nə azarın var?
Dedi: – Özümdədir, vallah, hər günah.
Olmaq istəmədim heç kəsə möhtac.
Biz dünya görmüşük, deyirəm, Allah
Sağ gözü etməsin sol gözə möhtac.

Elə ki, rəhmətlik arvadım öldü,
Mənim bu dünyadan əlim üzüldü.
Yük ola bilmədim cavan gəlinə,
Allah da çox gördü mənə qarımı.
Bura gəlməyimdə, inan, mən yenə
Günahkar bilmirəm uşaqlarımı.

Sındırmır özünü, axı, nə gərək?
Sirrini içində saxlayır qoca.
Elə ki yatağa girir,
sübhədək
Yorğanın altında ağlayır qoca.

Keçirib işığı o qoca rəqqas,
Girir yatağına... yataq buz, o buz.
Dikilir otaqdan çölə baxışı,
Otaq zil qaranlıq, göy ulduz-ulduz.
Dinləyir, döyükür...
Bu nədir belə?
O, inilti səsi eşidir birdən.
Boylanır yatağa o, diqqət ilə:
"Yoxsa, o ağlayır?.. Gör neylədim mən?
Deyəsən, kişinin qəlbinə dəydim..."
Ağlayır… Əvvəllər mən də beləydim…"

Gecənin yarısı... Çilingər oyaq.
Rəqqas asta-asta dillənir: – Deyən,
Sənin ürəyinə toxundum bayaq,
Əgər belədirsə, keç təqsirimdən

Düzünü söylədim mən sənə ancaq
Qardaş, aldatmayaq bir-birimizi,
Düzünü deyək ki, atıblar bizi.
Gerçəyi gizlədib, düzü danmayaq,
Övladlar utansın, biz utanmayaq.

Dövranın gərdişi belədir, belə
Bu dünya əzəldən yaman dünyadı.
Güclünü qaldırar çiyinlərinə,
Gücsüzü çiynindən atan dünyadı.

Kimini qaldırar yerdən göylərə
Kimini endirər göylərdən yerə.
Yaxşını yamana, xeyiri şərə,
Doğrunu əyriyə satan dünyadı.

Tutma bu dünyanı, tutma təkəlli,
Nagahan gülüşü yenə təsəlli.
Nə sevincı bəlli, nə qəmi bəlli,
Zəhəri şəkərə qatan dünyadı.

Bu necə anadır, düz ilqarı yox,
Kiminə sığaldır, kiminə yumruq.
Yeyə bilənlərə bir tikə quyruq,
Yeyə bilməyənə yavan dünyadı.

Uşaqla oynayar, gənclə bəhs edər,
Kim ona ağ olsa ona qəsd edər.
Bizi əldən salar, bizi sinsidər,
Özü haman dünya, haman dünyadı,
Doğrusu, bu dünya yaman dünyadı.

4

– Mənim aman-zaman bir oğlum vardı,
Onu da əlimdən ölüm apardı.
Ömrün bu çağında qaldım köməksiz,
Qocalar evini quran var olsun,
Əlacsız qalmadıq bu məqamda biz.
Sən də mənim kimi övlad sarıdan
Deyəsən, məğmunsan?..
                    Duruxdu bir an,
Ana bilmədi ki, nə desin?..
                                        Birdən
Dönüb dedi: – Mənmi?
– Hə!
-Sonsuzam mən.
"Sonsuzam!" Sözdəki dəhşətə bir bax!
Yəni, məndən sonra heç kim dünyada
Mənim çırağımı yandırmayacaq.
Sonsuzam! Meyvəsiz bir kökəm, soyam,
Əslimin, nəslimin sonuncusuyam.
Ana yalan dedi, qəlbindəkilər
Dilinə gəlmədi.
Yox, gələ bilməz.
Nə özü, nə oğlu, nə də gəlini
Özgələr önündə alçala bilməz.
Susdu...

Boğazında düyüldü qəhər,
Saxladı özünü ana birtəhər.
– Bəs hara gedirsən hərdən axşamlar?
– Körpələr evinə.
– Orda kimin var?
– Ora dayaq yerim, ümid yerimdir.
Ordakı atılmış bütün körpələr
Elə bilirəm ki, nəvələrimdir.

Qoca söz demədi, bir siqar eşdi,
Mətləbi anladı, sözü dəyişdi.
Yenə danışdılar dağdan, arandan,
Hər kəs otağına keçdiyi zaman,
Qoca dedi: – Səndən bir xahişim var
Ora nə vaxt getsən məni də apar.

Küçənin bu tayı – Körpələr evi,
O tayı – qocalar sığınacağı.
İnsan möhtac olur başqalarına
Bir ömrün ilk çağı, bir də son çağı.

Möhtac olan vaxtda möhtacı atmaq?
Bu, hansı kitabda yazılıb, deyin?
Vicdanı unutmaq, insafı satmaq
Bəlkə, ölçüsüdür müasirliyin?
Bəzən babaları bəyənməyirik,
Bəzən biz onlara “cahil” deyirik.
İnsafı danana aman verməmək,
Yediyi çörəyə dal çevirməmək,
Sədaqət, dəyanət, düzlük, ədalət,
Etibar, kişilik, böyüyə hörmət,
Ulu babalardan mirasdır bizə,
Gəlin, bir də baxaq keçmişimizə...

Yaşlılar ölkəsi deyilir nədən
Ana vətənimiz Azərbaycana?
Bəs bunun səbəbi nə imiş, görən?
Həkimlər hərəsi yozdu bir yana.
Min bir təcrübədə, min bir oyunda,

Alimlər məhəyə vurdu bu sirri.
Biri havasında, biri suyunda,
Biri iqlimində gördü bu sirri.

Bir deyən olmadı: – Nə olub sizə?
Nədir bu təcrübə, nədir bu sınaq?
Mən heyrət edirəm heyrətinizə,
İnsanın haqqıdır uzun yaşamaq!

Mənim də sözüm var: – Ey, dayanın siz,
Nədir bu təəccüb, nədir bu heyrət?
Düz deyil, düz deyil yozumlarınız,
İnsanı yaşadar insana hörmət!
Uzun yaşamağın sirri –
yurdumun
Nə torpağındadır,
Nə də suyunda.
Kiçiyə mərhəmət, böyüyə hörmət!
Səbəbi bundadır, səbəbi bunda!
Öz yaşına görə hamıya sayğı:
“Yol böyüyün, amma su kiçiyindi...”
Böyüyə ehtiram, kiçiyə qayğı
Yoxsa, bir cəhalət sayılır indi?
İnsan qocaldımı?
Başqalarından
Dönüb kömək umur dilsiz körpə tək.
Bilmirəm, alətmi, əşyamı insan,
Gərəksiz olanda atılsın gərək?

Atılmaq!
Kimsəyə gərək olmamaq!
Sən heç bilirsənmi bu nə deməkdir?
İnsanlıq adından danışıb, ancaq
İnsanlıq adını ləkələməkdir.

Atalar, analar övladlarına
Ömürdən pay verir, candan pay verir.
Yandırır özünü baladan yana,
Tutub əlimizdən yol da göstərir.

Elə ki qocaldı, əl açır bizə,
Güvənir, sığınır köməyimizə.
Danır insan oğlu ötən illəri
Baxınca bu günün öz zirvəsindən.
Bir vaxt əlimizdən tutan əlləri
Bizə açılanda kəsirik bəzən...
Azdır belələri yaxşı ki, bizdə
Ancaq qorxuludur olsa da tək-tək.
Heç vaxt görünməyib ənənəmizdə
Böyüyün, kiçiyin haqqını kəsmək!
Həmişə öyrədib, öyrədir zaman:
Kökdən gəlməyəni yox etmək asan.

IV Fəsil

## KÖRPƏLƏR EVİ

1

Atdı anasını ikinci oğul,
Anası bir kəlmə dedi: "Çox sağ ol!"
Nə desin taleyin sərəncamına.
Qocalar evinə sığındı ana.

O gedir bazara hər bazar günü,
Gah gül-çiçək alır, gah da oyuncaq.
Körpələr evinə atır özünü,
Gözləyir yolunu orda bir uşaq.

Körpələr evində hamı bir yana,
Çilli bir uşağa meylini salmış.
Onu görən kimi basmış bağrına,
Demiş: – Sən atılmış, mən də atılmış.
O gündən bəri,
Bazar günləri,
Körpələr evində bir canlanma var,
Nənəni gözləyir bütün uşaqlar.

O çilli körpə,
Ürəyi sevgidən nisgilli körpə
O gündən bəri,
Gözləyir nənəni bazar günləri.

Körpələr evində bir toy-büsat var,
Uşaqlar sevinir, əylənir yenə.
Ürəyi nisgilli körpə balalar
Toplaşıb ananın yan-yörəsinə.

Dünyaya gələli onlar dünyadan
Yamanlıq görüblər, bəli, yamanlıq.
Yetimlər hər kəsdən yalnız hər zaman
Bir xoş baxış umar, bir mehribanlıq.
Hamıdan çəkinər, hamıdan hürkər,
Sınıq ürəkləri şuşədən kövrək.
Nə dəcəllik bilər, nə şıltaq bilər,
Onların baxışı inamsız, ürkək.
Onlar nə xoş sifət,
nə sığal görər.
Baxımsız bağlardan,
de, bağ olarmı?

Körpə şıltaq edər, ana götürər,
Anasız körpələr şıltaq olarmı?
Onlar dayələrdən məhəbbət umar,
Buna nə hövsələ, nə də macal var.
Atanın, ananın xətrinə ancaq
Tanış da, biliş də körpəni oxşar.

Onun etdiyini yad edə bilməz,
Dayənin xoş sözü, nəvazişi də
Körpə ürəkləri isidə bilməz.
Ana sevgisinə varmı bir əvəz?
Ana sevgisinə körpə həsrəti
Kim deyir ən böyük bir həsrət deyil!
Dayənin sığalı, adi hörməti
Vəzifə borcudur, məhəbbət deyil.

Uşaq ürəyini aldatmaq olmaz.
Yanılır o qəlbə qıyıb hökm edən.
Seçir,
          körpə qəlbi həssasdır, həssas,
Əsl məhəbbəti saxta sevgidən.
Uşaq böyüdükcə
                    dərdi-səri də
Böyüyür özüylə birgə ilbəil.
Dayənin uşaqdan tələbləri də
Ancaq tərbiyədir, məhəbbət deyil.

Dəcəl körpələrin nazı, şıltağı
Dayənin gözündə qüsurdur, əlbət.
Ana məzəmməti, ata danlağı
Ancaq məhəbbətdir, ancaq məhəbbət!

Yaman kövrək olur, yamanca həssas
Yetim ürəklərin eşqi, fitrəti.
Bir ana qucağı, bir isti nəfəs
Onların ən böyük könül həsrəti!

Ürəyi həsrətlə şişib dolsa da,
Nə cürəti olar, nə cəsarəti.
Belədir...
          Adları uşaq olsa da,
Uşaqlıq onların deyil qisməti.

Durarlar uzaqda, baxarlar gendən,
Gözlər intizarlı, baxışlar dərin.
Onların üzünə qəm kölgəsindən
Basılıb möhürü kimsəsizliyin.
Uşaq ürəyini aldatmaq olmaz,
Yanılır o, qəlbə qıyıb hökm edən.
Seçir,
          uşaq qəlbi o qədər həssas,
Əsl məhəbbəti saxta sevgidən.

Məhəbbət! Həmişə möhtacıq ona,
Onsuz nə dərk edər, nə duyar insan.
Məhəbbət bəslərmi başqalarına
Məhəbbət görməyən başqalarından?

Əgər qəlbimizdə məhəbbət yoxsa,
Onu balalardan almaq çox çətin!
Onlardan məhəbbət umacağıqsa,
Amandır, onlara məhəbbət verin!

Körpələr evinə gəlir arabir
Uşaq götürməyə sonsuz qadınlar.
Elə ki körpələr bunu hiss edir,
Gəl, gör, otaqlarda nə çaxnaşma var.

Çiçi paltarını geyinir o gün,
Hələ güzgüyə də baxır uşaqlar.
        Bəzənir, düzənir...
                        Bəyənilməkçün
Görün nə oyundan çıxır uşaqlar.

Yanaşır qadına...
Baxır üzünə.
Baxışda yalvarış, baxışda üsyan.
Baxır matdım-matdım,
                                O, dönə-dönə,
Baxışlar qışqırır: "Mən sənin balan!"

Ağır... Bu mənzərə nə qədər ağır!
Ürəklər çırpınır...
Gözlər intizar.
Burda özlərinə ana axtarır
Ana qucağına həsrət balalar.

Qırılır ümidi, tutulur yenə,
Bir küncə qısılır bəyənilməyən.
Baş vur o ürəyin dərinliyinə,
İtərsən, batarsan o ürəkdə sən.

## 2

Körpələr evində bir toy-büsat var,
Uşaqlar sevinir, əylənir yenə.
Ürəyi nisgilli körpə balalar
Toplaşıb qarının yan-yörəsinə,
Uşaqlar oynayır, atılıb-düşür,
Qarının qəlbində güllər öpüşür.
O, çilli körpəni basır bağrına,
"Cırtdan" nağılını danışır ona:
– Kim yatıb, kim oyaq?
Dillənir uşaq:
– Hamı çoxdan yatıb, tək Cırtdan oyaq.
Cırtdanın anası yoxmu, ay nənə?
Onun da anası...
– Nə deyim sənə?
Bilirsən, ay bala, Cırtdan...
– Hə, Cırtdan...
– İgiddir yaman.
O divi...
– Öldürər... Qorxmur heç nədən.
Böyüyüb Cırtdanla dost olacam mən.
– Yaxşı, mənim balam...
                                        Keçdi bir qədər
Onlar çox danışıb, çox gülüşdülər.
Əvvəlki mətləbə qayıtdı yenə:
– Hə, bəs... sənin anan, yoxmu, ay nənə?
– Mən özüm anayam.
                O, döndü birdən
Bələkli kuklanı götürdü yerdən.
Qışqırdı: – Bunun da anası mənəm.
Heç kəsə, heç kəsə bunu vermərəm!
– Di, yaxşı, qoy olsun o, sənin balan.
Axı, kimdir onu əlindən alan?
– Bəs sənin evin var?
                           Nə desin ana?
– Var!
– Məni evinə sən aparsana.

Niyə aparmırsan?..
Hə, dillənsənə.
Ana danışmadı. Susdu.
– Ay nənə.
Yaşardıq bir yerdə biz nənə-bala.
Anaya oxşayan gözəl bir xala
Apardı özüylə dünən Adili.
Titrədi ananın dodağı, dili.
– Adil anasını tapdı... ay nənə...
Bəs mənim...
Ardını demədi.
Yenə
Susdular...
Baxışlar danışdı lal-kar,
Onlar birdən-birə qucaqlaşdılar.
Söhbətə bu yerdə xitam vuruldu.
Artıq nə danışım, artıq nə deyim,
Gizli duyğularla boşaldı, doldu
Anadan yetimlə, baladan yetim.
Ana heç bilmir ki, nə duyğudur bu?
Niyə bu duyğunun əsiri oldu?
Yenə də qəlbində sonsuz diləklər,
Niyə bu duyğuya o səcdə qılmış?
Tapar bir-birini sınıq ürəklər,
Tapar bir-birini iki atılmış.
Atılmış!
Atılmış, həqiqətdi bu –
Birinin əvvəli, birinin sonu.
Adını təmizə çıxarmaq üçün
Körpəsini atan o bədbəxt gəlin,
İçində göynəyib daim hönkürən
Analıq hissini axır kiritdi...
Keçdi bir qədər,
Gözəl bir insana o ərə getdi...
Sandı ki, körpədə itirdiyini
Ərində tapacaq...
Olmadı ancaq!..
Olmadı... Asıldı öz diləyindən.

İkinci körpəni gözlədi müdam...
Demə, öz ilkini atdığı gündən
Onun analığı olubmuş tamam.
Davalar, dərmanlar kara gəlmədi,
Analıq istədi, ala bilmədi.

Küçədə, bayırda o, neçə-neçə
Qucağı körpəli ana görüncə
Qısqandı... Həsrətlə süzdü qadını
Tək özü dinlədi öz fəryadını...
İtkin körpəsinin doğum günündə
O, qara geyindi, o yas saxladı.
Amma bir gümana ümid bağladı.
Atdığı körpəni o, tapmaq üçün
Uşaq evlərinə baş vurdu hər gün
– Bəlkə, o burdadır... xəbərsizəm mən...
Əgər burdadırsa, hansıdır görən?
Bəlkə, bu?.. Oxşamır... Amma, bax, bunun
Yamanca oxşayır mənə göz-qaşı...
Yox, bu, balacadır... Onunsa bu gün
Axı, tamam olur düz yeddi yaşı...
Baxır o, sağına, soluna baxır,
Doğma balasını tanımır ancaq.
O, hardan biləydi öz övladıdır,
Böyründə dayanmış bu çil-çil uşaq.

## SON SÖZ

Məhkəmə qurulsun!
Atılmışların
Uzaq, gözdənuzaq sığınacağında.
Vicdanlar əyləşsin o gün hakimin
Biri sol yanında, biri sağında.

Məhkəmə qurulsun, hökm verilsin,
Hər kəs haqqını yox, borcunu bilsin!
Balasını atan analar ilə
Anasını atan balalar gəlsin.

Atsın gülləsini öz cəbhəsindən
Özünü haqq bilən dillər birbəbir.
Amma bu atəşin qorxma səsindən,
Hədəfi yenə də öz cəbhəsidir.

Həyat sınağından çıxan "zirəklər"
Haqqını istəsin, borcunu dansın.
Balaya, anaya qıyan ürəklər,
Məhkəmə önündə niyə utansın?

Xəcalət! Utanmaq! Namusun, arın
İlkin meyvəsidir...
Umma sən ondan!
Vicdan hakimini aldadanların
Qorxusu olarmı haqq divanından?

Məcəllə hökmüylə xatırlanan borc
Yaxşıdır min dəfə ödənilməsə.
Verilən cəzanın kimə nə xeyri,
Günahkar özündə günah bilməsə?

Zorla borc ödətmək?
De, kimə gərək?
Deyirəm hökm də həzin nəğmə tək
Könüldən-könülə axsın, duyulsun!
Məhkumun üzünə oxunan hökmün
Məqsədi – qanmazı qandırmaq olsun!

Qanmaqda cəza da, ədalət də var.
Qansın!
Borcundan da bir boy ucalsın!
Sevgiyə, qayğıya möhtac olanlar
Ancaq sevgiylə də haqqını alsın!

*1976-1978*

# Atılmışlar

*Mərhum bəstəkarımız Qəmbər Hüseynlinin xatirəsinə*

Mənim dostum idi, mahnılarından
Torpaq ətri gələn bəstəkar Qəmbər.
Dillərdə gəzərdi bizim bir zaman
Qoşa yazdığımız şirin nəğmələr.

Xoşuna gələndə yazdığım şeir,
Sözün alovuna bürünərdi o.
Bir anın içində tamam dəyişər,
Başqa bir sifətdə görünərdi o.

Şeiri dönə-dönə o, oxuyardı,
Sözün nəğməsinə dalar, uyardı.
Sonra dindirərdi astadan tarı,
Muğam naxışları, muğam xalları
Süzülüb axardı barmaqlarından;
Külçə götürərdi söz dağlarından.
Alardı ilhamı sözdən, şeirdən,
Sənət meydanında çapan bəstəkar;
Muğamdan nəğməyə keçərdi birdən
Şeirin nəğməsini tapan bəstəkar.
Amma həmişə
Ala gözlərində bir kədər vardı.
Bilirdim, zamanla gəlmiş döş-döşə,
Odur ki, hər yerdə az danışardı.
Özü deməmişdi, bilirdim,
onu,
Neçə il qabaq
Həbs eyləmişlər.

Günahı nə imiş, bilmirdim, ancaq
Nə mən soruşardım,
Nə o deyərdi.
Söhbət bu mətləbə yaxınlaşanda
Sözü dəyişdirib təzələyərdi.

Açıqca görürdüm, gizli dərdi var,
Adamlar içində çox zaman susar,
Xatalı söhbətdən yan keçərdi o,
Yüz ölçüb, min ölçüb,
Bir biçərdi o.
Neçə il zindanda əzab çəkəli
Dolandı həmişə o, səksəkəli.
Məgər yalnız omu?
Xeyr, hamımız.
Qaldı gözümüzdə bütün kamımız.

Qorxu qayda oldu, adicə qayda,
Qorxudan don biçdi əyninə illər.
Bu məmləkət boyda həbsxanada
Dustaq olmadıqmı hamımız məgər?

Gülmədi bir dəfə üzünə illər,
Kiçik bir daxmada yaşadı Qəmbər.
İçində dəfn etdi dərdi-sərini,
O bildi, yox imiş yazıya pozu.
Tar üstə yaratdı nəğmələrini,
Nə royalı vardı, nə pianosu.
Əlçatmaz zirvəyə daim can atdı,
Ucalıq eşqinə yazdı, yaratdı.
Amma neyləyəsən, bəyənmədilər,
"Qəmbər tar üstündə yazır" – dedilər.
Guya saz avazı, guya tar səsi,
Ulu dədələrin ulu nəğməsi
Uyuşmur zamanın öz ahənginə,
Əsrimiz sığışmaz saz ahənginə.
Ruhumuz qovuldu musiqimizdən,
Uyduq uzun illər caz ahənginə.

Bir soran olmadı, ay qardaş, nədən
Axı, baş yerinə ayaq tərpədən,
Bizi səmalardan yerə endirən,
Özgə qapısında veyilləndirən
Dayaz rok-en-rollar göyə ucalsın,
Üzeyir məktəbi yetimmi qalsın?
Hara çəkirsiniz musiqimizi,
Nadanmı sandınız bu qədər bizi?
Amma o satqınlar çatdı şərəfə.
Qəmbər bir dəfə
Mənə gileyləndi güzaranından,
Ürəyim sıxıldı...
Soruşdum ondan:
– Bəs səni nə üstə həbs etmişdilər?
Birdən barıt kimi açıldı Qəmbər:
– Bilmirsən? Dünyanı lənətləmişdim.
"Ellər atasına" düşmən demişdim*.

Bu boyda ölkəni saldı nə günə.
O qəddar, o zalim, müdhiş zülmünə.
Bir dəfə demədi, həvəsdi, bəsdi,
Düşünən kəslərin başını kəsdi.

O, nəsə andı,
Birdən dayandı...
Anladım onu, –
Mən başa düşdüm
Niyə birdən-birə tutulduğunu.
O dözə bilmədi, birdən danışdı,
Sonra dediyinə peşmanlamışdı.

O susub dinməmiş, susarkən hələ
Onun əsiriydi qəlbinin sözü.
Dözmədi, partladı,
öz əsirinə

*O zaman Stalinə "ellər atası" deyərdilər.

Dönüb əsir oldu indi o, özü.
Qorxuya düşmüşdü dediklərindən,
O, birdən dayandı, o birdən susdu.
Yəqin ki, çəkindi, o qorxdu məndən,
Düşündü: "Bu şair bəlkə casusdu".

Sənə tanış deyil bu hal, ey cavan,
Qorxardıq doğmaca qardaşımızdan.
Dədəsini satan az olmamışdı
Yalnız yaşlılara bu hal tanışdı.
Rütbə sata-sata, yer sata-sata,
Çoxları hörmət də qazandı bol-bol.
O vaxt şübhəliydi oğuldan ata,
Gəlindən qaynana, atadan oğul.
O vaxt susardılar xeyirdə, şərdə,
İdrakı, vicdanı əzərdi şübhə.
O zaman evlərdə, idarələrdə
Qara kabus kimi gəzərdi şübhə.
Yaman yeyin idi şübhənin atı,
Hamımız qul idik, o, bəydi ancaq.
Birinin birinə münasibəti
Şübhəydi,
          şübhəydi,
                    şübhəydi ancaq!
Odur ki, qorxardıq bir-birimizdən,
Qorxu saçılardı gözlərimizdən.

Düzlüyü, mərdliyi döşlədi qorxu,
Bir əsər qalmadı vüqarımızdan.
Elə canımıza işlədi qorxu,
Axdı qan yerinə damarımızdan.

Səhrada göyərən bir qanqal təki
Bizim içimizdə kök atdı qorxu.
Yalanla həqiqət arasındakı
Halal sərhədləri dağıtdı qorxu.
Boğub həqiqəti yalan öyündü,

Əsl mənasını itirdi söz də.
Yalan üzümüzdə gülüşə döndü,
Həqiqət ağladı ürəyimizdə.

Yalanın hökmünə düz əyilincə
Əyri pərvazlandı, əyri dağ aşdı.
Həqiqət ürəkdən dilə gəlincə
Yolda yetmiş dəfə mayallaq aşdı.

Yəqin ki, düşündün bu dəm, ey cavan,
Bəs qanun, bəs qayda yoxmuş o zaman?
Cəllad nə istəsə edə bilərmiş,
Ona hansı qanun, bu hökmü vermiş?

Necə cavab verim sənə mən indi?
İnsan hər zülmə, vallah, dözəndi.
Qanundan qorxmazdıq o illərdə biz,
Adamdan qorxardıq, adamdan, yalnız.

Mütləq hakim idi o vaxt bircə baş,
Onun iradəsi hər şeydi, ancaq.
Adamlar qanuna deyil, a qardaş,
Qanun bir adama tabeydi ancaq.

– Bağışla, qızışdım, – söylədi
birdən, –
Özümü, sözümü bilmirəm hərdən.
Bir yazıqlıq duydum onun səsində,
Qəmbər də haqlıydı öz şübhəsində.

Onun şübhəsini dağıdım – deyə
Dediyi sözləri dəstəklədim mən:
– O qənim kəsilib, – dedim, – ölkəyə,
Cavidlər sürülüb öz Vətənindən.

---

*Hüseyn Cavid nəzərdə tutulur. 1937-ci ildə onu və onun kimi çoxlarını Sibirə sürgün etmişdilər.

Daha danışmadı, dinmədi Qəmbər.
Anladım, dediyi o doğru sözlər,
Daş kimi asılıb çiyinlərindən,
O yazıq qorxurdu, qorxurdu məndən.

II

Qəmbərgildən dönüncə, fikir məni
apardı,
Qorxu, təlaş içimdə bir fırtına
qopardı.
Yada düşdü o söhbət –
O giley, o şikayət
Birdən-birə tutuldum,
Elə bil iflic oldum.
İttihamçı gözüylə mənə baxan
divarlar
Gördüm, gəlir üstümə,
Durub mənim qəsdimə
Əli qanlı o cəllad.
Söydüm özüm-özümü,
Dedim, ay evi bərbad,
Niyə dəsmal bağladın
ağrımayan başına?
Niyə soyuq su qatdın sən isticə aşına?
Axı, o nə söz idi çıxdı sənin dilindən?
Cəlladın ünvanına Qəmbərin o sözləri
Qəsdən demədiyini nə bilirsən, axı, sən?
Min-min günahsızları dünən suçlu gördülər.
Neçə min günahsızı Vətənindən sürdülər.
Ölkənin başçısını düşmən adlandıranı
Azad edərlərmi heç?
Bəs, burda məntiq hanı?
İnanmıram mən buna –
Onun lənətlərinin səmimi olduğuna.
Güzərandan, zamandan qəsdən söhbət salırmış,
O, məndən söz alırmış.

Mən maymaq da söylədim, ürəyimdən keçəni.
Qıvrıldım yatağımda, yatmadım o gecəni.
Yumşaq yorğan-döşəkdən min-min tikan
batırdı
Bədənimə elə bil.
Bu, adi tikan deyil,
Qorxu tikanlarıdır bədənimi dağlayan.
Mənim gələcəyimdir ürəyimdə bu gecə
Matəm qurub ağlayan.
Dedim, hardan bilirəm,
Bəlkə elə bu gecə tutacaqlar məni də?
Üç ay əvvəl gecəykən məgər tutmadılarmı
İsmixanı, Azəri, bizim Gülhüseyni də?*
Mən onlardan artığam? Yox, mən də onlar kimi
Saxlamadım dilimi.
Dağ başında süzürdüm, birdən çamura düşdüm.
Dilimdən tora düşdüm.
Yox-yox! Bu ola bilməz.
Qəmbər məni alçaldıb özü ucala bilməz.
O, özünü bu qədər yerə endirərmi heç?
Sənətkar sənətkarı güdaza verərmi heç?
Tfu! Bu nə söz idi mən danışdım?
Dünyadan
xəbərsiz, naşı kimi?
Məgər, otuz yeddidə güdaza vermədimi
Qələm yoldaşlarını
öz qələm yoldaşları?
Hələ lənət oxları,
hələ tənə daşları
Atılmayıb onlara –
Özgəsinin yerinə
Sənət zirvələrinə
qalxıb ucalanlara?
İndi də bax, bu Qəmbər...
O, məgər

---

1947-ci ildə həbs edilən universitet tələbələri.

Qələm yoldaşlarını gələcək şöhrətinə
Qurban verib ucalan,
Satqınlıqdan öc alan
kəslərdən artıqdımı?
Namərdlərlə döyüşən
Yoxsa, qalib çıxdımı?
İnsan çiy süd əmibdir,
Xeyri də var, şəri də;
Mən ki, bundan halıyam;
Bu ikili insana niyə inanmalıyam?

* * *

Mən bu düşüncələrdə beləcə qovrularkən –
Boşalırkən, dolurkən
Qapımızın önündə bir maşın durdu, Allah,
Kimsə düşüb maşından ünvanı sordu, Allah.
Ev başıma dolandı,
Dünya bir an içində
Kameraya çevrilib, necə balacalandı.
Soyuq tər basdı məni.
Dedim, dar ağacından öz dilim asdı məni.

Motor səsi eşitdim,
Maşının qapıları örtüldü taraq-taraq.
Maşın guruldayaraq
Getdi...
şükür Allaha!
Bu xatadan sovuşsam, çarmıxa çəksələr də
Ağzımı kilidlərəm, danışmaram bir daha.

III

Keçdi ürəyimdən bu dəm ah, nələr:
...Məni aparmağa nə vaxt gəlsələr,
Yəqin arxivimə baş vuracaqlar,
Yazımı, pozumu axtaracaqlar.
Düşündüm, nəyim var, qaradan, ağdan!

Baxdım öz içimə bir an yad kimi –
Gecənin yarısı qalxıb yataqdan,
Tökdüm qabağıma şeirlərimi.
Gördüm ki, ilahi, çapa getməyən
Nə qədər şeirim var, yazı-pozum var.
Başqa bir göz ilə oxuyanda mən
Gördüm, hər sətirdə neçə sözüm var.

Düşündüm bunları yazırkən, görən,
Hansı duyğularla yaşamışam mən?
Ürək sıxılarkən, göydə və yerdə
Necə qanadlanıb xəyalım mənim!
Aşıb hüdudları bu şeirlərdə
Həqiqət axtaran amalım mənim.

Axı, kim yaratdı bu sərhədləri?
Kim saldı qəlibə fkri, xəyalı?
İdrak cığırına düşəndən bəri
Çərçivə tanımır insan kamalı.

Yazmaya bilməzdim yəqin bunları,
Könlümü sarsıdan burulğanları
Yazıya köçürüb dincəlmişəm mən.
Neyləyim, bu gəlib mənim əlimdən.

Çapa vermədiyim şeirlərimə
Müfəttiş gözüylə baxıb titrədim.
– Bunlar ələ keçsə, mənim dərimə
Vallah, saman təpər o cəllad, – dedim.
Alışıb yandığım illərdən bəri
Duyub düşündüyüm bu şeirləri
İndi öz əlimlə yandırımmı mən?
Onda dönmərəmmi həqiqətimdən?

Söylə, həqiqətin nə imiş sənin?
Kimdir həqiqətə baxan, ay yazıq?
Sən indi çalış ki, o qaniçənin
Əlinə keçməsin yaxan, ay yazıq.

– Onda yandırımmı? – Əlacım nədir,
Axı, həyatına kim biganədir?
Kim istər dünyada bir gün görməmiş
Arzular naminə ömür sürməmiş
Zindanlar küncündə yanıb – qovrula,
Uzaq sürgünlərdə ömrü qəhr ola?

Verdim qərarımı!
                    Aman, əlaman!
Dünyadan həqiqət, ədalət uman
Şeirlərimdən
Tonqal çatmalıyam, tonqal çatmalı!
Fikrimi, hissimi, duyğularımı
Ömrümə, günümə müftə satmalı!
...Yanır haqsızlığa qarşı yüksələn,
Əqidəm, məsləkim, xeyirim-şərim;
Yanır rəzalətlə döş-döşə gələn
Qorxmaz sətirlərim, kişi sözlərim.

Yanır gileylərim, şikayətlərim,
Yanır, zəmanəyə üsyanım yanır.
Yanır arzularım, xoş niyyətlərim,
Düşüncəm, xəyalım, vicdanım yanır.

Yanır bu dünyada ayaq izlərim,
Yanır arzuların qışqırıqları.
Yanır o həqiqi, doğru sözlərim,
Yanır ürəyimin hıçqırıqları.
Yanır hədəfini düzgün bəlləyən
Açıq məhəbbətim, açıq nifrətim.
Yanır oxucuya həqiqət deyən
Riyasız, boyasız sözüm, söhbətim.
Dünyadan dünyaya gileyim yanır,
Yanan şeirlərə ürəyim yanır.

Yanır, yanğısıyla məni yandırır,
Qəlbimdən süzülüb axan hər şeirim.
Bir anlıq zülməti işıqlandırır
Yanan duyğularım, düşüncələrim.

Gördüm öz-özümü bu işıqda mən,
Gördüm ayrılmışam öz fitrətimdən.
Gördüm, sığınmışam dözümə, yarəb,
Qənim kəsilmişəm özümə, yarəb.

Qorxmadım, yandırdım bir qatil kimi
Mən öz gerçəyimi, həqiqətimi.
Çünki əmindim,
Həqiqət yansa da məhv ola bilməz,
Sap kimi uzanar, qırıla bilməz.
İnanıram mən,
Həmin o həqiqət vaxt gələcəkdir,
Başqa birisinin dililə hökmən
Deyiləcəkdir.
Yanan şeirlərin od-alovundan
Bədənim üşüdü, ürəyim əsdi.
Bir neçə şeirimə qıymadım, ancaq
Dedim, kifayətdi,
Dedim, ta... bəsdi.

Bir neçə şeirimə qıymadım o gün,
Saralmış vərəqlər durur bu gün də.
Həmin şeirləri gələcək üçün
Gizlətdim anamın protezində*.
Ağır qəm yüküdür bunlar bir ömrün,
Açılsın, tökülsün deyirəm bu gün
Duyan ürəklərin gizli sirləri.
Ey cavan oxucum,
                        bu şeirləri
Gizlədib mən bu gün çatdırdım sənə.
İstərəm biləsən, ürəklərimiz
Susmadı...
Kölgədə yatan olmadıq.
O vaxtlar qəhrəman olmasaq da biz,
Hay-küyə aldanan nadan olmadıq!

*Anamın bir ayağı protez idi.

## DAMCI – DAMCI

Bulaq oldum, çağladım,
Susuz qalan çöllərin.
Halına qan ağladım.

Çəmənlərə çiləndim,
Axdıqca nəğmələndim.
Tez yolumu kəsdilər,
Ağzıma daş basdılar.
Elə güman etdilər,
Gah mıxa, gah da nala
Döyən amalsızmışam.
Amma əsli budur ki,
Gur axa bilməsəm də,
Damcı-damcı sızmışam.

Dəniz deyil, göl oldum,
Axıb çuxura doldum.
Öz dərdimlə doluydum,
Dibimi oydum, oydum,
Yer altında daşları,
Qayaları döşlədim,
Eninə bacarmadım,
Dərininə işlədim.

Dalğa pıçıltısında
Dibə yatan daşların,
Mətləbinə varan yox.
En görünür hər gözə,
Dərinliyi görən yox.
Dedilər dayazmışam.
Bir çuxurdan baş alıb,
Öz yolumu azmışam.

Mən yolumu azmadım,
Mənə "Az!" deyənlərin
Fikrini azdırmışam.

Onun öz məramını
Qəsdinə yozdurmuşam.
Qanım Qorqud qanıdır,
Mən əvvəlki damaram.
Damcı-damcı damaram,
Damcını saxlamaram.
Damcı damar, göl olar,
Cığır dönüb yol olar.
Bir yanıqlı sazam mən,
Hələ çağlamazam mən.
Asta-asta dinmişəm,
Arzuma köklənmişəm.
Səsləri bu kök üstdə
Səslədən avazmışam.

Dərd qaynaqlı ələməm,
Kağız üstə qələməm,
Nifrətimi deməyə
İmkanım olmayanda
Mən sevgimi yazmışam.

## SOĞAN

Soğan qabığına baxdı, düşündü.
Başını buladı,
O, mənə döndü.
Dedi: – Sərt olacaq qış, bu il yaman
Dedim: – Nədən bildin?
Dedi: – Qabıqdan.
Qalındır,
Deməli,
Sərt keçəcək qış.
Təbiət əzəldən müdrik yaranmış.
O ki nəğməsidir qaydanın, yönün,
Dağı yaratmamış ona yol seçir.
Soğanı soyuqdan qorumaq üçün

Onun paltarını o, qalın biçir.
Əhsən bu paltara, dona, təbiət,
Sən bu səxavətdə nəsən, nəsənmiş!
Ey ana təbiət,
ana təbiət,
Bilmirdim,
necə də rəhimlisənmiş!
Acı soğan kimi, bəs, axı, mən də
Övladınam sənin,
Balanam sənin.
Mən də üşüyürəm, mənə gələndə
Rəhmin harda qaldı, ay anam, sənin?
Ələm çovğununda, qəm tufanında
Soyuqdan əsirəm, axı, mən yetim.
Soğana qıymadın, sənin yanında
Bir soğan qədər də yoxmuş qiymətim?
Nədir bu fikirlər, bu üzüntülər?
Ürəyi bir verdin, əzabı min-min.
Nolardı, mənə də dözümüm qədər
İztirab verəydin, əzab verəydin.

## YOX

Ömrüm başdan-başa ahu-nalədir,
Çox da ki, dilimin ahu-zarı yox.
Hər il bahar gəlir çölə, çəmənə
Nə olsun, könlümün öz baharı yox.

Düşündüm dünyanı, düşündüm dərin,
Önündə acizəm mən bu sirlərin.
Könlümdə bəslənən cəvahirlərin
Kolxoz bazarında xiridarı yox.

Dar gəlir könlümə hər şey büsbütün,
Dünya da kiçilir, yoxsa, günbəgün?
Yaralı könlümün, yazıq könlümün

Nə göydə, nə yerdə bir qərarı yox.
Alçaldım yerə də, qalxdım göyə də,
Başımın üstündə gördüm min hədə.
Dinməyə qoymurlar,
                düşünməyə də
Axı, mən yazığın ixtiyarı yox.

## IV

Sən vaxtın, zamanın hökmünə bir bax,
Zamandır hər fikrə yön verən, ancaq.
İnsan zaman ilə gəlir döş-döşə,
İnsanı yetirən vaxtdır həmişə.
Zaman var, xəyalı çəkir zirvəyə,
Zaman var, məhv edir eşqi, niyyəti.
Zaman var, insanı qaldırır göyə,
Zaman var, öldürür insaniyyəti.

Zaman var, köksünə gül taxır yerin,
Zaman var, düşünən, duyan kəslərin
Ağzına daş basır, qəlbi susdurur;
Zaman var, uçurur, zaman var, qurur.
Zaman var, yalana həqiqət deyir,
Zaman var, Tanrı tək haqqa baş əyir.

Bir də görürsən ki, dünənki dağlar
Təpəyə əl açıb dilənir bu gün.
Yalanlar, gerçəklər, haqlar, nahaqlar
Vaxtın ələyində ələnir bu gün.

Dünən düzlüyündən üzə çıxmayan,
Özünü zamanda günahkar sayan
Mənim üzüqara bu şeirlərim,
Bu gün üzağlığım, haqq sözüm oldu,
Üzə çıxmağı da bir lüzum oldu.

V

Bütün dövrlərdə müstəbid, qəddar
Ağıldan, kamaldan, fikirdən qorxar.
Çünki o bilir ki, fikir, düşüncə
Nə hüdud tanıyar, nə sərhəd bilər.
Odur ki, müstəbid hər şeydən öncə
Fikrə, düşüncəyə qənim kəsilər.

Fikir adamları onun qənimi!
O yaxşı bilir ki, fikir gün kimi
Yanıb qaranlığa birdən nur çilər,
Boyalı sözlərlə üstü örtülən,
Ağlarkən gülən,
Həqiqətləri
Görməyən gözə də göstərə bilər.

Müstəbid bilir ki, kamalın, fikrin,
Gözə görünməyən qanadları var.
İdrakın yolunu kəsmək çox çətin,
İqlimdən-iqlimə o uçar, uçar.
Fikir sığa bilməz hüduda, həddə,
O, zora baş əyməz, gücə əyilməz.
Fikir azad olan bir məmləkətdə
Zülm öz atını səyirdə bilməz.

Sönmədi qəlbinin qəzəbi, odu,
Müstəbid qılıncı qoymadı qına.
Azadlıq adına meydan oxudu,
Fikrin, düşüncənin azadlığına.
Susduq... bəxtimizə asi deyildik,
Bəli, dərd budur ki, biz elə bildik
Belədir qayda.
Bizdən bəxtəvəri yoxdur dünyada.

Mahnı da oxuduq: "Bəxtəvərik biz,
Gül kimi açılıb diləklərimiz".
"El azaddır,

Tel azaddır.
Azad vətəndə
Dil azaddır”.
Hansı dərdimizi demişdik ki, biz,
Üstəlik azaddır – dedik dilimiz?
Qaldı kitablarda gerçəyin adı,
Nə özü göründü, nə ayaq izi.
Yalan danışmaqdan üz qızarmadı,
Alqışdan qızartdıq əllərimizi.

Bədbəxtlik gölündə biz üzə-üzə,
İnandıq bəxtəvər olduğumuza.
O qansız cəllada bunlar gərəkdi,
Onun yalanları axdı hər yerə.
Yalnız sərhədləri deyil, o çəkdi
Dəmir pərdələri düşüncələrə.
Pərdədən o yanı görə bilmədik,
Dondu düşüncəmiz, dondu fikrimiz.
Dəmir pərdələri yara bilmədik,
Çevrildik fikirsiz müqəvvaya biz.
Cəlladın əlində alətə döndük,
O necə düşündü, elə düşündük.

Müstəbid zülmünü doğrultmaq üçün,
Ehkamlar yaratdı, bütlər yaratdı.
“Ellərin atası” olub o, bir gün
Özünü millətə çox baha satdı.

Apardı dalınca şüarlar bizi,
Kütləşdi beynimiz, hissimiz tamam.
Aldı əlimizdən düşüncəmizi
Zülmün, istibdadın maskası – ehkam!
Müstəbid dəyişdi tariximizi,
Biz gah midiyalı, gah filan olduq.
Silindi tarixdən gerçəyin izi,
Bilmədik biz hansı atadan olduq.

Yadlar sahib çıxdı sərvətimizə,
Sahib çıxmadılar bizə bəs nədən?
Yetim evi oldu bu dünya bizə,
Ata axtarırıq indi özgədən.

De, hara sığışar, hara, ey zaman,
Bu boyda təhqirə xalqın dözməsi –
Dədə Qorqud kimi dədəsi olan
Millətin özünə dədə gəzməsi.

Gör nə günə saldı müstəbid bizi,
Ay anam, hardasan, ağla bu dərdə.
Elə dolaşdırıb tariximizi,
Başını itirib tarixçilər də.

Başımız üstündə həmişə yumruq,
Halal adımızı deməyə qorxduq.
Damğa da vuruldu hələ bu ada,
Dandıq qorxumuzdan öz babamızı.
Kifayət deyilmiş bu da cəllada,
Dəyişdi minillik əlifbamızı.
Yenə soyumadı cəlladın kini,
O elə düşündü, elə bildi ki,
Latına keçməklə biz yeniləşdik.
O, buna dözmədi... on il keçməmiş
Cəlladın əmrilə Kirilə Kiril – rus əlifbası.
keçdik.
Beləcə, qaraldı mənliyin şamı,
Bulandı dilimin büllur çeşməsi.
Bir deyən olmadı, əlifbadamı
Qocaman millətin yeniləşməsi?!
Əgər belədirsə, ədalət hanı?
Niyə dəyişmədin öz əlifbanı?

Sənin sadiq qulun, – mənim soydaşım,
O, yerli rəhbərim, cahil kütbaşım,
Susdu, danışmadı, yumdu ağzını.

Çünki o görmədi, görə bilməzdi
Sənin məqsədinin əsl məğzini.

Sən qanıb, düşünüb keçdin bu qəsdə,
O gün dünənimdən intiqam aldın.
Mənim min-minillik tarixim üstdə
“Şalako”oynadın, məndən kam aldın*.

Bir qənim kəsildin mənə o ki var,
Minillik ruhumun tutdun yasını.
On ildə neçə yol dəyişmək olar,
Bir xalqın minillik əlifbasını?

Etiraf olmadı?
Oldu: Bir nəfər;
Ona hər tərəfdən göz bərəltdilər.
– Rəhbər deyən sözə nə müzakirə?
Ona canımızı qurban verərik.
Əlifba nədir ki, lazım gələrsə,
Ana dilimizi dəyişdirərik.

Niyə dəyişməsin, axı, bu satqın –
Ata dili varkən, ana dilini!
Beləsi turp əkdi başında xalqın,
Satdı Vətənini, satdı elini.
Bunu deyən oğul, həmin o anda
Rəhbər atasından rütbə diləndi;
Bir həftə keçməmiş, o rütbələndi.
Bəs etiraz edən? Onun taleyi?
Atdı hər şeyi.
Bir müddət Bakıdan köçünü çəkdi,
Yoxsa, Cavid kimi sürüləcəkdi.
Əlifba dəyişdi,
Buna öyündük.
Bilmədik, rişəsiz budağa döndük.
Qabağı görmədik öz yaşımızdan,
Nəsillər arası qırıldı bağlar;

---

*Şalako – gürcü oyun havası; Stalinin bizə elədiyi zülmə işarədir.

Qovulub silindi yaddaşımızdan
Qurulan çadırlar, yanan ocaqlar.
Vətəndən qovuldu ana dilimiz,
“Ana dili” – dedik gəlmə, yad dilə.
Ərəbcə danışdıq ölülərlə biz,
Rusca qırıldatdıq dirilər ilə.
Öz ana dilimiz “lallığımızdan”,
Ölüyə küfr oldu, diriyə nöqsan.
Hanı Bunu Çiçək? Hanı Qazan xan?
Biz ki ruhu əsil, qanı əsildik.
Qorqud qanı axdı damarımızdan,
Özümüz Qorquda düşmən kəsildik.
Doğudan Batıya, at çapan babam,
Mənim oğuz babam, mənim xan babam
Təzə kitablarda mənə yad oldu,
Soy soya qarışdı, kök unuduldu.
Ələnə bilmədik, qaldıq ələkdə
Gör, necə kökündən laxladı millət.
Yapıx daxmalarda, kənddə-kəsəkdə,
Yenə də milləti saxladı millət.

VI

Varaq-varaq çevirdim düşüncəmi, fikrimi:
“Səhər açılan kimi
Gedəcəyəm yanına.
And verib vicdanına
Deyəcəyəm, amandır,
Dünən dediklərimiz başdan-başa yalandır.
Bir diş bilsin, bir dodaq.
Səni dəstəkləməkçün elə dedim mən ancaq.
Əslində, çox sevirəm mən o dahi rəhbəri,
Odur bizə bəxş edən bu bəxtəvər günləri.
O bizim bu dünyada tək güman yerimizdir,
Düşünən beynimizdir, görən gözlərimizdir”.
“Mən qələt elədim” – deyə səhərə kimi
Öz-özümə deyindim,
Səhər açılan kimi qalxıb dərhal geyindim.

Birdən qapı döyüldü...
Bizə kim gələ bilər səhərin bu çağında?
Aynanın qabağında
Gördüm, əsir bədənim.
Qapını açmağa da heç taqətim yox mənim.
“Yəqin, o satmış məni,
elə dünən gecədən.
Aparmağa gəlirlər hara qaçım indi mən?”
Qapı bir də döyüldü.
Bir də, bir də döyüldü.
Gələn kimsə, görünür, məqsədinə çatmamış
Burdan gedən deyildi...
– Kimsən?
– Mənəm, a qardaş.
Bu Qəmbərin səsiydi.
Bu da mənə bəs idi.
Yəqin şahidtək gəlib üzümə durmaq üçün.
Məni susdurmaq üçün.
Əsə-əsə əllərim, mən qapını açınca
O, üstümə atıldı boynumu qucaqladı,
Hönkür-hönkür ağladı.
Boylandı məlul-məlul
O bir sola, bir sağa.
Dünənki söhbətini başladı tez-tələsik
Ayrı səmtə yozmağa:
-Zarafatla demişdim dünən mən o sözləri;
Əslində, çox sevirəm, mən o dahi rəhbəri.
O, bizim bu dünyada tək güman yerimizdir,
Düşünən beynimizdir, görən gözlərimizdir.
Başa düşdüm mən onu.
Susdum... Bu yozumların ağ yalan olduğunu
Anlayırkən, qanırkən.
Bir gün sonra o və mən sözümüzü danırkən
Riyakara döndərdi vaxt həm onu, həm məni, –
O da yata bilməyib, demə, bütün gecəni.

*Avqust, 1988*




## PROLOQ

Şəhidlər bu torpağa, xalqa səcdə qıldılar,
Haqsızlığın üstündən haqqa körpü saldılar.
Vətəni sevmək üstdə günahkar sayıldılar,
Vətəni sevmək niyə günah olmuş, ay Allah?

Özüm qaldım çıraqsız, min çırağa yağ ikən,
Təpələrə əl açdım, özüm uca dağ ikən.
Əlacım öz-özümdən köməyi ummaq ikən,
Neçin bizə özgəsi "pənah" olmuş, ay Allah?

Ona ümid, mənə zor, amma demir kimə haqq?
Əl-ayaq zəncirdədir, baş qapazlı, sinə dağ.
Yüz yetmiş il bu saziş, bu birlik, bu ittifaq
Bir tərəfli, talaqsız nikah olmuş, ay Allah.

Çəliyə möhtac ikən, mən özgəyə çəliyəm,
Min gülləyə tuş olan bir ceyranam, əliyəm.
Özgə nə əmr eyləsə mən boyun əyməliyəm,
Neçin mənə özgəsi "allah" olmuş, ay Allah?

Bu gün qula dönmüşəm, dünən mən bir şah ikən,
Yoxmuş məni bir doğan, yoxmuş məni bir əkən.
Bu torpağa düşmüşəm haradansa mən dünən,
Min-minillik tarixim unudulmuş, ay Allah!

Özgənin əlindədir xeyirimiz, şərimiz,
Sərvətimiz daşındı, hey soyuldu dərimiz.
Gözümüz üfüqdədir, açılmır səhərimiz,
Bizə düşən səmada gün tutulmuş, ay Allah!

İllərlə məhkumluğun keşiyində dayandıq,
Özümüzə biz bunu, yoxsa, şərəfmi sandıq?
Xoşbəxt olduğumuza inandıq, çox inandıq,
Düz yalana, haqq zora, demə, qulmuş, ay Allah!

Gözümüzdə qalsa da muradımız, kamımız,
Görünənə deyil, yox, bir nəfər tək hamımız
Deyilənə inandıq... Bizim bu inamımız,
Demə, qul olmamıza kəsə yolmuş, ay Allah!

Bir qırıq işıq görüb zülməti yamanladıq,
Sübhün açıldığını zənn edib gümanladıq.
Biz də dönüb Sabirə bircə ağız banladıq,
Bizim banlamağımız günah olmuş, ay Allah!
Neçin mənə özgəsi "allah" olmuş, ay Allah?

## NƏ İSTƏYİR BU MİLLƏT?

İstəkləri gözündə, tələbləri dilində,
Millət dənizə döndü dənizin sahilində.
Dalğalandı bu millət
Alışıb öz oduna, yandı, yandı bu millət.
Dilsiz, sağır göylərə dirək oldu haqq səsi,
Başlandı bu ölkənin meydan mübarizəsi.
Nə istəyir camaat? Bəlkə bezib canından?
Şikayətə çıxıbdır bəlkə güzəranından?
Bəlkə boş dükanları dolu görmək istəyir?
Bəlkə qazandığından çox götürmək istəyir?
Bəlkə maaş davası?
Bəlkə mənzil davası?
Nədir bu xalq davası, nədir bu el davası –
Bir soruşan oldumu?
                    Amma yeri istilər
Bu xalq burulğanının qabağını kəsdilər.
Ekranlara çıxdılar.

“Ekstremist” – deyə ona qara yaxdılar.
Xalqa öyüd verdilər.
Yenə də məhkumluğu
Yeganə bir yol kimi bu xalqa göstərdilər.
Bir soruşan olmadı nədir sənin bu davan?
Bəlkə çatışmır suyun, bəlkə çatışmır havan?
Yaşasa da bu millət lap dilənçi kökündə,
Yoxsul güzəranından danışmadı bu gün də.
Daxmalarda yaşadı, özünü sındırmadı,
Meydanda “mənzil” – deyə bir dəfə qışqırmadı.
Qara qızıl çıxartdı yerin yeddi qatından.
“Nədir bunun qiyməti?” sormadılar heç ondan.
Onun qızıl neftini qızıla da satdılar,
Qızılın sahibini söz ilə aldatdılar.
Bu millətin sərvəti özünə düşmən oldu,
Becərdiyi pambığı əyninə kəfən oldu.
O, yenə də dinmədi,
Dözdü, heç deyinmədi.
Nə istəyir bəs bu xalq?
O istəyir sərvəti manat olub özgənin
Xəznəsinə dolsa da,
Dərisi soyulsa da
Onun ləyaqətinə,
Namus və qeyrətinə
Bir daha qıymasınlar,
Minillik torpağını hərraca qoymasınlar.
Qəzet sütünlarından millətə öyüd verən,
Söz ilə yol göstərən,
İndi özün de görək,
Qəbahətmi bu istək?

* * *

O zaman ki özümüz olduq öz dustağımız,
Qəlbimizə sığındı üç rəngli bayrağımız.
O vaxt ki, azadlığın işartısı göründü,
Qəlbimizi bir anda dəlib keçdi o bayraq,

Qəlbimizdən boylanıb ələ keçdi o bayraq.
Bir məqsədə calandı,
Əllərdə dalğalandı.
Qatil bunu görüncə pozdu cəlalımızı,
Qanımıza boyadı bizim hilalımızı.

## TƏZADLAR İÇİNDƏ

Yalana, riyaya nə qədər uyduq,
Biz Qızıl Orduya abidə qoyduq,
Ona ad da verdik: "Xilaskar ordu".
Adını "doğrultdu": El "xilas oldu"
Yenicə tapdığı azadlığından,
"Ölüyə azadlıq, diriyə zindan".

Yaxşı tanıyırıq çoxdan biz onu
Adı bir olsa da, min bir üzü var.
Kasıb gizlətməkçün yoxsulluğunu,
İtinin adını "Gümüş" çağırar.

Həmin abidənin həndəvərində,
Həmin Qızıl Ordu günün birində
Bizim qanımızı tökdü...
ya xuda!
Ölənlər kim idi?
həmin orduda
Dünən əsgər olan bizim cavanlar.
Ağıl dərk etməyən bu bədxahlığın,
Əsl mənasını xalq indi anlar...

Yetmiş il "irəli!" – deyib yüyürdük,
Hamıdan geridə qalan bizmişik.
Döydük döşümüzə...
ayılıb gördük
Dünya aslan imiş, amma biz pişik!
Xalqa neçə dəfə tələ qurdular

Başımız tilova keçəndən bəri.
Qəsdən, bilə-bilə adlandırdılar
Xalqın dostlarını, “xalq düşmənləri”.
“Bizdədir dünyanın dövləti, varı”, –
Dedik...
    Səs-küyümüz göyə dirəndi.
“Dünyanın ən xoşbəxt, şən adamları”,
Talonla qaxsımış ət alır indi.

Qəribə təzadlar içindəyik biz,
İndi anlamışıq; kimik, nəyik biz.
Bəlkə kor taleyin hökmüdür bu da?
...Dünən bizimkilər həmən orduda
Ruslara bir arxa, bir qardaş kimi,
Onun düşməniylə döyüşmədimi?
Aradan nə keçdi?
Nə oldu ona?
Dünənki yaxşılıq unuduldumu?
Dünən arxasında dağ olduğuna,
Bu gün birdən-birə düşmən oldumu?

Gerçəyin önünə keçdi o dəmdə,
Yalanlar, böhtanlar...
nə deyək buna?
Qatil bizimlə bir o gecə həm də,
Haqqı, həqiqəti tutdu qurşuna.

Hansı göstərişlə gəlibmiş, görən,
Silahsız kütləni bu qıran ordu?
Vallah, bu vəhşəti törədə bilməz
Ən qəddar, qudurğan, çıldıran ordu.
Bəs hanı savaşın qədimdən bəri,
Hər kəsin bildiyi mərdlik şərtləri?

Şər üçün nə qayda,
                    nə şərt, nə qanun?
Bu imiş “haqq işi” Qızıl Ordunun...

Kimdi bəs ölənlər?
İnanmaq çətin!
Dünən Rusiya üçün can verənlərin,
Şəhid düşənlərin şəhid övladı!
Əfsus! Eyni olur şəhidin adı!
O, şəhid, bu, şəhid!
Sən bir işə bax!
O, nəyin uğrunda, bu, nəyin, ancaq!
O şənbə gecəsi, o məlun gecə
Birdən üzə çıxdı bu fərq gör necə?!
Bir soldat bağırdı: – Belədir qayda
Əvəz ödəməkdə ər oğlu ərəm.
Atan şəhid oldu mənim yolumda,
Mən sənin özünü şəhid eylərəm!

Ədalət də, gerçək də,
Vallah, yoxdu o gecə.
Zülm, zalim əlilə
Haqqı boğdu o gecə.
Tunc zirehli ilanlar,
Haqqımızı nə anlar!
Həqiqəti yalanlar
Küncə sıxdı o gecə!

Kimə deyim dərdimi?
Qəsbkar namərdəmi?
Yetmiş ilin dərd-qəmi
Gözdən axdı o gecə.

Analar amanından
Sinələr oldu şan-şan.
Şəhidlərin qanından,
Şimşək çaxdı o gecə.
Qara geydi bu Vətən,
Yox hayına bir yetən.
Həyata hamiləykən,
Ölüm doğdu o gecə.

Nə deyək bu vəhşətə,
Bu zülmə, bu dəhşətə.
Allah bu müsibətə
Necə baxdı o gecə?

Ertəsi... Bakının küçələrindən
Yudular millətin qızıl qanını.
Yuya biləcəkmi o cəllad, görən,
Qanla ləkələnmiş öz vicdanını?

Gecənin yarısı... hər yan qan-qada,
Qırmızı güllələr uçur havada.
Özünü itirmir adamlar yenə,
Yetirir özünü haya-haraya.
Maşınlar bir yana,
                    çiyinlərdə də
Yaralı daşınır xəstəxanaya.

Güllə vıyıltısı... Bu acı səsdən
Titrəyir,
        lərzəyə gəlir bina da.
Amansız soldatlar keçirir qəsdən,
Bütün çıraqları xəstəxanada.

Gör necə böyükmüş bizə qəzəb, kin,
Burda da göründü, qalmadı qında.
Çarəsiz həkimlər indi neyləsin? –
Əməliyyat gedir şam işığında.
Səhər açılınca adamlar bir-bir
Yığılıb gəlir.
Qan vermək istəyir yaralılara.
Amma insaf hara, qantökən hara?

Soldatlar töküldü hey axın-axın,
Döyükə-döyükə baxdı dörd yana.
Tutuldu bir anda xəstəxananın
Həyəti, bağçası gülləbarana.

Heç kəs bu sifətdə görməyib şəri,
Hələ bəs deyilmiş tökülən qanlar?
Xəstəyə qan vermək istəyənləri
Bir anın içində dağıtdı onlar.

Yazovun əmriymiş... Qızğın başlara,
Zalimlik adicə bir adət imiş.
Bizim bu günahsız yaralılara,
Heç demə, yardım da cinayət imiş.
Ertəsi... Bakının küçələrindən,
Yudular millətin qızıl qanını.
Yuya biləcəkmi o cəllad, görən
Qanla ləkələnmiş öz vicdanını?

* * *

Üzümü tuturam sizə mən bu gün,
Əsilli, nəsilli rus ziyalısı,
Ulu Tolstoyun, böyük Puşkinin,
Fikir davamçısı, məslək varisi.
Onların irsini yaşatmaq bu gün,
Hünərdir, şərəfdir yeni nəsilçün.

Bu gün ulularin o haqq səsini,
Təkrar edirsiniz qəzetdə, sözdə.
Onların eşqini, əqidəsini,
Amma heç görmürük əməlinizdə.
Yüksək kürsülərdə qol-qanad açmış,
Sizin dilinizdə "həqiqət" sözü.
Deyin, qəlbinizdən bəs hara qaçmış
Ədalət, fəzilət, həqiqət özü?

Təpədən-dırnağa silahlı ordu
Sizdən haqq istəyən bir xalqı qırdı.
Bunu görmədiniz?
Yaxşı gördünüz!
Amma həqiqətə siz tüpürdünüz.

Bir xalqın bağrına çəkilən bu dağ,
Ləkə gətirmədi şərəfinizə?
Dünyanın önündə bunu ağartmaq,
Sərfəli deyildi, deyəsən, sizə.

Zorun qarşısında susdunuz... Deyin,
Varislik borcunuz unuduldumu?
Ulu Tolstoyun, böyük Puşkinin
Sizə irs qoyduğu həqiqət bumu?
Nədir bizə qarşı bu qəzəb, bu kin?
...Qəlbim həqiqəti gör kimdən umdu?
Dağ-daşın dərdinə qalan Rasputin
Bir xalqın dərdinə niyə göz yumdu?

Heç zaman ziyalı sayıla bilməz
Özgənin dərdini yaşamayan kəs.
Sizdən soruşuram: bu rəzalətə
Siz necə baxdınız bir insan kimi?
Tolstoy bu zülmə, bu müsibətə
Etiraz səsini yüksəltməzdimi?

## EŞQ OLSUN SİZƏ

Bəzən öz-özümə düşünürəm mən:
Nahaq şəhid oldu bizim cavanlar.
Ömrü ucuz verdi...
bir iş görmədən
Boş yerə ölməyin nə mənası var?!

Ağıla söykənsin dedim qüvvəmiz,
Anlayan olmadı bu sözdən məni.
Ağıla güvənək bu məqamda biz,
Qüvvə daşı əzər, ağıl qüvvəni.
Sonra düşünürəm: Onlar qorxmadan,
Cumdular ölümün üstünə belə.
Bir iş görmədilər yaşayan zaman,
Qəhrəman oldular ölümləriylə.

Bizim əlimizdən çoxdan alınmış
Haqqı bu dünyaya bildirdi onlar.
Millətin qəlbinə qəsdən salınmış
Qorxu iblisini öldürdü onlar.

O gecə dağlardan enən sel təki,
Qəzəbdən köpürüb daşdı millətim.
O şənbə gecəsi ürəyindəki
Qorxu hasarını aşdı millətim.

Bizim qazancımız bu oldu ancaq,
Qorxu xəndəyindən biz körpü atdıq.
Bu da bir imtahan, bu da bir sınaq,
Şübhədən qurtarıb, imana çatdıq.

Bu ölüm, bu qırğın dərs olsun bizə,
Deməyək boş yerə candan keçdilər.
Onlar şəhid olub millətimizə,
Cəsarət dərsini təlim keçdilər.

Gəlin, ölçə bilək xeyri, ziyanı,
Bəzən əvəzidir on qış, bir yazın.
Bizim şəhidlərin müqəddəs qanı,
Bəlkə də behidir sabahımızın.

Yaman dözümlüdür, oda kül atır,
Hər zülmə, cəfaya dayanır millət.
Soyula-soyula o susur, yatır,
Qurban verə-verə oyanır millət.
Xəyal bir çiçək də bitirə bilməz,
Bu gündən sabaha körpü salmasa.
Azadlıq ağacı bar verə bilməz,
Şəhidlər qanıyla suvarılmasa.

Onlar sübut etdi hər qara zülmün
Əli uzunsa da, ömrü gödəkdir.
Xalqın azadlığı sabah, birigün,
Şəhid yarasından göyərəcəkdir.

Şənbə gecəsində gecikdi səhər,
Zaman itirmişdi o gün sağ-solu.
Ömürdən keçərək, keçdi şəhidlər
Bir qanlı gecədə minillik yolu.

Şan-şərəf tac oldu, başlara qondu,
O qətl gecəsi xalqın minillik
Şücaət tarixi təkrar olundu:
...İki əsrə yaxın Babək, Cavad xan,
Hərdən təəssüflə qalxdı məzardan.
Bəsirət gözüylə seyr etdi bizi,
Tanıya bilmədi millətimizi.
Gördülər dağ düzə, göy yerə enmiş,
Onlardan kölələr, qullar törənmiş.
Onlar inanmadı, biz də bir ərik,
O qoç igidlərdən törənənlərik.
“ – Bizim zəmanədə xan idi millət,
Niyə qula dönüb, – dedilər – indi?
Nədir bu itaət, nədir bu zillət?” –
Deyə qəzəb ilə onlar deyindi.

O şənbə gecəsi yel qalxdı birdən,
Közün üstündəki külü üfürdü.
Babək fərəh ilə qalxdı qəbirdən,
Hər igid gözündə özünü gördü.

O şənbə gecəsi bir şimşək təki,
Gözlər parıldadı...
                    sinələrdəki
Gözlə görünməyən dağlar göründü.
Hünər məqamında bir qoça döndü
Ələ öyrədilən hər körpə quzu.
Babəkin varisi olduğumuzu
Göstərdi dünyaya...
                    Eşq olsun sizə!
Siz layiq oldunuz öz irsinizə.

Gəldi ürəkdəki arzular dilə,
Silahı məhəbbət, son sözü Vətən.
Şəhidlər göstərdi ölümləriylə
Ölüm aşağıdır Vətən eşqindən.

Dünya o dünyadır, bir həqiqəti
Çarmıxa çəksə də min böhtan, riya!
O gecə basanda zülm ədaləti,
Haqqın naləsindən diksindi dünya.

Adımız dolaşdı bütün dünyanı,
Çox da ki, ağımız qara yozuldu.
Bizim şəhidlərin tökülən qanı,
Haqqın kitabında imzamız oldu.

Baxıb sinələrdən axan al qana,
Buludlar kişnədi, göy qan ağladı.
O şənbə gecəsi Vətən başına
Elə Vətən boyda qara bağladı.
Dözdü böhtana da, dözdü şərə də,
Yedi şəkər kimi hər dərdi xalqım.
Azadlıq yolunda ölümlərə də,
Hazır olduğunu göstərdi xalqım.

Azadlıq verilmir, alınır,
dayan!
Onun elçisidir, ölüm, qan-qada.
Ölümə, cəfaya hazır olmayan,
Millət hazır deyil azadlığa da.

Yalın əllər ilə tanklar üstünə,
Atılan cavanlar, eşq olsun sizə!
Siz təsdiq etdiniz azadlığın da
Halal olduğunu millətimizə!

Şəhid rütbəsinə qalxan cavanlar,
Sinəsi hər zülmə qalxan cavanlar,

Böyük Nəsiminin, ulu Babəkin,
Xeyir-duasını aldı o gecə.
Zamandan irəli sıçrayıb yəqin,
Tarixdə tarix tək qaldı o gecə.

* * *

Qəlbimi boşaltmır çəkdiyim ah da,
Nəğmədə hər xalın kökü var yəqin.
Şəhid fəryadından ulu segahda
Təzə bir guşə də açılar yəqin.

Həmin o güşədə ana naləsi,
Analar hönkürər, gəlinlər ağlar.
Həmin o güşədə qəm şəlaləsi,
Axıb qəlbimizdən haqqı soraqlar.

Həmin o güşədə güllə səsləri,
Tarın pərdəsində qəm nəfəsləri,
Həmin o guşədə zülmün tüğyanı,
Haqqın, həqiqətin zülmə üsyanı.

Ramiz, bas bağrına sən qoca tarı,
Bu təzə guşədə çal, sənə qurban.
Şəhidlər qanına boyanan səsi,
Zabul segahına sal, sənə qurban!

Pərdələr qoy təzə güllər bitirsin,
Şəhid anasına təsəlli versin.
Haqqın fəryadını dilə gətirsin,
Təzə yaratdığın xal, sənə qurban!

Xəzər pəncələşdi öz sahiliylə,
Danış dərdimizi səsin ziliylə.
O təzə guşənin atəş diliylə,
Zülümdən qisası al, sənə qurban!

Təzə guşədəki ah-amanların,
Qorxuram, hər xalı yoğrula qandan.
Qorxuram çanağı partlaya tarın,
Bu təzə guşənin hay-harayından.

Asta çal, qardaşım, asta çal tarı,
Pərdələr bu aha, amana dözməz.
Təzə guşədəki səs burumları,
Günahsız tökülən bu qana dözməz.
Həm də uydurulan böhtana dözməz,
Partladar tarı!

## MATƏM MƏRASİMİ

Qəzəb şimşəyindən hər baxış nida!
Hər üzdə, hər gözdə bir sual ağlar.
İnsan dənizinin dalğalarında,
Üzür asta-asta tabut-qayıqlar.

Xalq dözə bilsə də zülmün şərinə,
Yanır gözlərində kini, nifrəti.
Alıb tabutları çiyinlərinə,
Allaha göstərir bu cinayəti.

Deyir, nələr gördük, ey adil Allah,
Budurmu göylərin haqq-ədaləti?
Deyir, biz götürdük, ey adil Allah,
Sən necə götürdün bu xəyanəti?
Millətin ahıdır ərşə dayanan,
Dilsiz baxışlarda üsyandır – yanan!

Gəmilər fit verir... qara buluddan
Göylər bu matəmə bayraq endirir.
Bu səs qəlbimizdə alışan oddan,
Qəzəb vulkanını ləpələndirir.

Fit səsi... bu fəryad külə bükülmüş
İçin-için yanan köz səsidirmi?
Bu fəryad, bu nalə balası ölmüş,
Yetim anaların naləsidirmi?
Fit səsi... həyəcan, təlaş nəğməsi,
Bilirik, nə deyir bu gizli üsyan.

Anlaya bilmirəm, bu möcüz səsi,
Necə yoğurdular göz yaşlarından?
Gəmilər fit verir... bu sirli səsdən
Küçələr, binalar zür-zükə gəlir.

Qərib iniltidən elə bil, qəsdən
Təhlükə dalınca təhlükə gəlir.

Qarşıda şeyximiz, arxada millət,
Axır insan seli başlar aşağı.
Bərqərər olsa da sabah ədalət,
Getməz qəlbimizdən bu şəhid dağı.

Axır yanaqlara göz yaşı dən-dən,
Bəs necə? Millətin bağrı sökülmüş.
Bu el matəmindən, el kədərindən,
Cavan şeyximizin beli bükülmüş.

Yaşaya bilmədik bir insan təki,
Qarışdı haqqımız, borcumuz bizim.
Bu gün tabut deyil, çiyinlərdəki
Dərd adlı yüküdür millətimizin.

Boğaq içimizdə kədərimizi,
Amandır, əyməsin qoy bu yük bizi.

Yeriyir izdiham hey ağır-ağır,
Yeriyir meydandan Dağüstü parka.
Qəlbimiz sabaha indidən baxır,
Enişdən yoxuşa biz qalxa-qalxa.

Bura park idimi bir zaman? Xeyr!
İndi də yaşayır xatirələrdə;
On səkkizinci il!
Şəhid düşənlər
Haqqa tapşırıldı bir vaxt bu yerdə.
O zaman qonşular bizdən kam alıb,
Bizi arxamızdan yaman vurdular.
Erməni əliylə burda park salıb,
Bizə şəhidləri unutdurdular.

Qızıl qərənfillər əllərdə min-min,
Şəhidlər önündə bir an dondular.
Fədakar oğullar Rəsulzadənin,
Bayrağı altında dəfn olundular.

Durun, ağlamayın! Vallah, qəm-kədər,
Heç vaxt sığışmamış qeyrətimizə.
Bu bayraq altında yaşamaq qədər,
Torpağa getmək də şərəfdir bizə.

Daldı bir anlığa sükuta göy, yer,
Millət ürəyini sükutdan asdı.
On səkkizdə ölən köhnə şəhidlər,
Təzə şəhidləri bağrına basdı.

Şəhər aşağıda... Bir baxın, onlar,
Bizdən yuxarıda dəfn olundular.

## AXI, BİZ NEYLƏMİŞDİK?

Şəhidlər Xiyabanı...
Dilə gəlir məzarlar:
                    – Axı, biz neyləmişdik?
Dilə gəlir
Məzarları seyr edən solğun üzlər, nəzərlər:
                    – Axı, biz neyləmişdik?

Bu ittiham, bu sual
Şəhidlərin birləşən hər yasında səslənir.
Fərizənin, İlhamın
Çırağı söndürülmüş komasında səslənir:
– Axı, biz neyləmişdik?
Ağsaqqal babaların, ağbirçək nənələrin
Duasında səslənir:
– Axı, biz neyləmişdik?
Bu ittiham, bu sual
Məktəbli Larisanın qara lentə tutulmuş
Partasında səslənir:
– Axı, biz neyləmişdik?
Günahsız qurbanların başdaşında səslənir.
Onların yetim qalan körpə balalarının
Dünyadan haqq istəyən göz yaşında səslənir:
– Axı, biz neyləmişdik?
Bu ittiham, bu sual
Bağrına dağ çəkilən qocaman bir millətin
Dodağında səslənir.
Sərvəti talan olmuş,
Düz sözü yalan olmuş
Böyük bir məmləkətin Göygölündə səslənir,
Şahdağında səslənir:
– Axı, biz neyləmişdik?
Bu ittiham, bu sual gəzdi bütün dünyanı,
Qəzetlərə yazdılar,
Min bir yerə yozdular.
Qaynaqdan bulandıran elə bulandırdı ki,
Suyumuz durulmadı.
Cavab verən olmadı:
– Axı, biz neyləmişdik?
Bu ittiham, bu sual
"Qırın!" əmri verənin qulağında dinmədi.
Bizə "vaxtı bildirən" o qocaman Kremlin
Zəngində səslənmədi.
Boğdular bir millətin "Axı, biz neyləmişdik?" –

Deyən o haqq səsini.
Şəhidlərin qanyıla yazdılar bir qatilə
Marşal vəsiqəsini.

Biri əmr elədi, o biri qırdı,
Qansızlar bu nahaq qanı batırdı.
Silahsız adamlar günahsız yerə
Yerdə ulduz kimi yanıb-söndülər.
Cəza istəyirdik biz qatillərə,
Amma ikisi də rütbələndilər.

Batdı, həqiqətin batdı haqq səsi,
Haqqı tapılmadı onlardan soran.
Qırana verdilər marşal rütbəsi,
Prezident taxtına çıxdı qırdıran.

## MƏNİM GÜNAHLARIM

– Mən sənə həmişə "Buyur" – demişdim,
Mən səndən haqqımı istəməmişdim.
Bir işıq görüncə üfüqdə birdən,
Səndən iynə gözü haqq istədim mən.
Sən dedin: – De görək haqq nə deməkdir?
Mənə bol pambığın, neftin gərəkdir.

Dedin: – Tələbinlə buz kimi donmuş
Köhnə yaraları gizildədirsən.
"Gülüstan" paktında məhkum olunmuş
Haqqını sən indi tələb edirsən?
Sormuşam, qanını çəkmişəm sənin,
Minnətdar olmusan sorulduğuna.
İndi də qanını tökmüşəm sənin,
Haray qoparırsan de neçin buna?

Dedim: – Günahımı başa sal mənə,
Dedin: – Anlamadın məni sən yenə.
Bilmədin, günahın bir deyil, mindir,
Amma ən böyüyü gözəlliyindir.

İstədin daşınan bol sərvətindən,
Bir ovuc, bir qırıq sənə pay düşə.
Sən bezib, usanıb əsarətindən,
İstədin bu dünya bir az dəyişə.
Budur günahın!
Məndən icazəsiz, axı, çox şeyi,
Sən qanmaq istədin, duymaq istədin.
Sən öz ayağını mənim çəkdiyim
Cızıqdan kənara qoymaq istədin.
                                Budur günahın!
Sən öz torpağında qul olduğunu,
Bağırmaq istədin, budur günahın.
Zülm girdabında boğulduğunu,
Çığırmaq istədin, budur günahın.

O, torpaq istədi səndən bir qarış.
Niyə tələbkarın xətrinə dəydin?
Onun istəyilə dedim, sən barış,
Sənsə tərəzinin gözünü əydin.
                                Budur günahın!

Bu qanlı çəkişmə düşəndən bəri,
Bir dəm ayağını qoymadın geri.
Erməni qıranda sizinkiləri
Sən də neçəsinin qanını tökdün.
                                Budur günahın!
Mən sənin qanını tökdüyüm zaman,
Baxdın nifrət ilə... Budur günahın!
Sən mənim tankıma çırtma vurmusan,
Hansı cürət ilə? – Budur günahın!

...Belə tale düşüb qismətimizə,
İlahi, sən yenə dözüm ver bizə.
Haqqın dərgahında unudulmuşuq,
Biz necə götürək bu töhmətləri?
Min dəfə haqlıykən haqsız olmuşuq,
Biz bu müsibətə düşəndən bəri.

Qulaqlar batırır böhtan harayı,
Buğdadan qiymətli olub darı da.
Necə bulandırıb keçi bu çayı?
Keçi aşağıda, qurd yuxarıda!
Mərkəz dəyişdirir gündə rəngini,
Mərkəz məni görür, heç onu görmür.
Bizdən yığışdırıb quş tüfəngini,
Amma erməninin topunu görmür.

Dilimizdə olub düşündüyümüz,
Əməldən öndədir bizim küyümüz.
Qəlbimiz o qədər təmiz olub ki,
Göz görə düşməni dost sanmışıq biz.
Gözümüz o qədər qorxudulub ki,
"Hələ çay gəlməmiş çırmanmışıq biz"
Biz nə hiylə bildik, nə qərəz, nə kin,
Quyuya düşənin əlindən tutduq.
Bizə tələ quran, kələk gələnin,
Dünənki qəsdini bu gün unutduq.

Özgə torpağından qovulanlara,
Biz torpaq da verdik torpağımızdan.
Bunun əvəzində indi onlara,
Borclu da çıxmışıq öz bağımızdan.

Qonaq dünənini salmayıb yada,
Yerliyə "qaç" – dedi, şər yolu tutdu.
Dünən dədəsinin mənim qapımda,
Boyun bükdüyünü bu gün unutdu.

Evimdə başımı kəsir erməni,
Qışqırıram...
            Mərkəz danlayır məni.
Deyir: – Nə çabala, nə danış, nə din,
Qoy sənin başını rahatca kəssin,
Kişinin gül kimi işinə qəsdən
Niyə pəl qatırsan?
            İnciyərəm mən!

Demək, o haqlıdır məni qıranda,
Haqsızam, dözməyib, mən qışqıranda.
Məəttəl qalmayım necə mən buna –
Yenidənqurmanın haqq olduğuna?

Mərkəz dəyişdirir gündə rəngini,
Mərkəz məni görür, heç onu görmür.
Bizdən yığışdırıb quş tüfəngini,
Amma erməninin topunu görmür.

Anladıq xalqların bərabərliyi,
Kağız üzərində bir quru sözmüş.
Bu qətldən sonra bildik çox şeyi,
Bizim günahımız türklüyümüzmüş!

Millətlər dostluğu! Astar üz imiş,
Bunun nəyi varmış sözündən özgə?[1]
Atatürk düz demiş, vallah, düz demiş:
"Yoxdur türkün dostu özündən özgə".

Türkdilli xalqların doğma yerindən
Didərgin düşməsi kimə gərəkmiş?
İyirminci yüzilin əvvəllərindən,
"Türkəm" – deyənlərin başı nə çəkmiş?!

Türk öz mənliyini biləndən bəri,
İblis də gələcək qəsdini bildi.
Qaraçay, Axalsiq, Krım türkləri,
Malkarlar, mesxetlər sürgün edildi.

İki yanağı var, amma bir üzü,
Türk öz anasından belə doğulmuş.
Anlaya bilmirəm, niyə "türk" sözü
Kiminsə başına düşən daş olmuş.

---

[1]1941-45-ci illərdə türkdilli Şimali Qafqaz xalqlarının Sibirə sürgün olunmasına işarədir.

Türkəsaya olduq... hər şey apaydın,
İçimiz göründü gözlərimizdən.
Qərəzkar oxudu axşamımızın
Uzaq məqsədini dan yerimizdən.

Belədir... biz hələ addım atmamış,
Bildilər düşəcək mənzilimizi.
Hələ bir məqsədə gedib çatmamış,
Yolun əvvəlində tutdular bizi.

* * *

Çadırlar quruldu kənddə, şəhərdə,
Bəlkə məlhəm idi matəm, bu dərdə?
Döndü yas evinə bütün məmləkət,
Kasıb ocaqda da qazan asıldı.
Yası, matəmilə çarəsiz millət
Elə bil qatildən intiqam aldı.

Gücsüzün aldığı intiqama bax!
Zorun qarşısında susduq hamımız.
Qırx gün yas saxlamaq, işə çıxmamaq,
Oldu üsyanımız, intiqamımız!

Bizim ən fərəhli, şad günümüzdə –
Hər bir toyumuzda, düyünümüzdə
Qərənfil əllərdə çıraq olardı,
Sevincə, şadlığa ortaq olardı.
Biz hardan biləydik doxsanıncı il,
Şadlıq yaraşığı qızıl qərənfil,
Şəhidlər qəbrini qucaqlayacaq,
Bizim dərdimizə yas saxlayacaq.
Canlı da, cansız da ağlayır bu gün,
Matəm içindədir ölkə büsbütün.
Qızıl qərənfillə qara bayraqlar
Xalqın kədərinə birgə qan ağlar.

* * *

Qorxar ilan vuran ala çatıdan,
Bizim gözümüzü püləyib fələk.
Qorxuruq...
Qorxudub bizi bu dövran.
Stalin ölməyib, yaşayır, demək!
Bizdən üz döndərib sanki fələk də,
Yalan çövlan edir, bəs hanı gerçək?
Susuruq...
Sözümüz qalır ürəkdə,
Stalin ölməyib, yaşayır, demək.

Xeyrimiz, şərimiz bilmirik nədir?
Onları kimdənsə soruşmaq gərək.
Hələ də haqqımız yad əllərdədir,
Stalin ölməyib, yaşayır, demək.

Bizə qürbət olub öz diyarımız,
Bu boyda dünyada tək qalmışıq, tək!
Zindana salındı Etibarımız,1
Stalin ölməyib, yaşayır, demək.

Diləyimiz harda, özümüz harda?
Doğranıb töküldük biz çilik-çilik.
Stalin ölsə də,
          yuxarılarda
Hələ də yaşayır stalinçilik.

İndi də zindanda yaradır Xəlil,2
Sözünü deməkdən usanan deyil.
"Moabit dəftəri" yaranır belə
Faşizm ölməyib, yaşayır hələ.

---

[1]Etibar Məmmədov

[2]Xəlil Rza

## XƏCALƏT

Şəhidlərin məzarı islandı göz yaşından,
Qurudu leysan tökən qərənfil yağışından.
Yaman nalə təpərdik gülçülərin əlindən,
Deyərdik, bu gülçülər bazarlarda pul qırır,
“Qərənfil gözəlindən”.
Rusiya bazarında,
Yaman rusvay edirlər, – deyərdik onlar bizi.
“Alverçi” damğasıyla, vallah, ləkələyirlər
Bizim şərəfimizi.
Həmin o alverçilər, bu gün isə əvəzsiz,
Təmənnasız qərəzsiz
Şəhid məzarlarını gül topuna tutdular,
Uzaq bazarlardakı qazancı unutdular.
Güllə yaralarını gül ilə soyutdular.
Vətənsevər kim imiş bu məqamda de görək?
Mənim tək, ya sənin tək
Bol qonorar eşqinə
Xalqa dərs vermək üçün ekranlara cumanlar,
Yoxsa, şəhid eşqinə xeyrinə göz yumanlar?

Şəhidlərin hamısı bənzəyir bir-birinə.
Bir bax, qəbirlərinə!
Hamısı qıpqırmızı qərənfilə bələnmiş,
Hamısı bir biçimdə, bir boyda cərgələnmiş.
Səbəb birdir, əməl bir,
hədəf birdir,
hədə bir,
Onları bu dünyadan aparan güllə də bir.
Tüstüsü təpəsindən çıxa-çıxa hönkürən,
Bu məhzun qəbirlərə baxa-baxa hönkürən
Adamlar da bir olmuş...
Ağlar budaqlarından qara bayraq sallanan
Göy şamlar da bir olmuş.
Hamınındır bu matəm,
Millətindir bu dərd, qəm.

Hamı qoyub özünü o birinin yerinə,
Hamı birinə deyil, hamı biri-birinə
"Başın sağ olsun" – deyir,
"Bulanıq axan sular bir gün durulsun" deyir.
Bir amala bağladı bu gün dərdi milləti,
Dərdin, qəmin birliyi birləşdirdi milləti.

Bu el faciəsinə dözmək çətin, çox çətin!
Beli yaman büküldü qocaman bir millətin.
Fitrətindən, soyundan ər doğulan bu xalqı
Tarix boyu mərd olan, məğrur olan bu xalqı
Necə təhqir etdilər, gör necə alçaltdılar.
Mənliyini, əzmini bir "sağ ol" a satdılar.
Sənin adın haqq ikən
Ey Allahım, niyə sən
Bizə qıydın bu dərdi?
Onsuz da bu millətə min-min dərdi yetərdi.

Bu təhqirə, bu qəsdə dözmək çətin, çox çətin!
Ürəyinə dərd hopub balası ölənlərin.
İçdikləri zəhərdir, yedikləri dərd, aman!
Bütün millət keyləşib dərdin ağırlığından.
Hamı ayaq üstündə yuxuludur elə bil.
Bu dərd dərdli dünyada çəkiləsi dərd deyil!

Ömründə qonşusunun damına daş atmayan,
Kimsənin bostanına əlini uzatmayan,
Qərəzinin, kininin dalınca sürünməyən,
Dünən verdiyi sözdən bu gün geri dönməyən,
Heç vaxt döyüb döşünə "mənəm-mənəm" –
deməyən.
Heç kəsin bəd gününü, şərini istəməyən,
Mənim ali millətim, haqlıykən birdən-birə,
Layiqmiydi, ey Allah, bu qəsdə, bu təhqirə?
Hansı günahımızın əvəziydi bu təhqir?
Haqsız oldu günahsız, haqlı oldu müqəssir!
Bu dərd bütün millətin ürəyində göyərdi,

Heç kəs bilmir nə təhər, necə udsun bu dərdi.
Bu gün xəcalət çəkir, hamı gücsüzlüyündən,
Heç kəs boylana bilmir gələcəyə bu gündən.
Çəkilməzdir, çəkilməz bu ağrının siqləti –
Əlacsız gücsüzlüyün töhmətsiz xəcaləti!
Həm dünən, həm bu gün də
Biz günahkar olmuşuq günahkarın önündə.
Hanı o qüdrətimiz –
Günahsız qurbanların töhmətinə dözək biz?
Qahmarımız olmadı nə arxada, nə öndə,
Hamı xəcalət çəkir
Qanları batırılmış şəhidlərin önündə.
Ah, necə də ağırdır
Zaman axa su kimi, amma qabın dolmaya,
Günahkarın, qatilin cəzasını verməyə,
Sənin gücün olmaya...
Çünki bu məhkəmədə biz haqlı olsaq belə,
Qısaldılıb dilimiz
Çünki hakimimizlə eynidir qatilimiz!

## İLHAM – FƏRİZƏ

Dözməyib qatilin kəshakəsinə,
İlham çölə çıxdı güllə səsinə.
Gördü qırhaqırdı, gördü vurhavur,
Tanklar adamların üstünə cumur.
Bağırdı: – Soldatlar, neyləyirsiniz,
Axı, bunlar ilə siz də birsiniz.
Axı, bu adamlar silahsızdılar.
Soldatlar daha da coşub qızdılar.
... Bu sözlər İlhamın son sözü oldu,
Ona da bir güllə... o da vuruldu.
O gecə yatmadı bir an Fərizə,
İlhamı gözlədi,
İlham gəlmədi.

Dönük taleyilə durdu üz-üzə.
Qalıb küçə ilə ev arasında,
Gecəni sübhədək o dincəlmədi...
Ertəsi... qapqara xəbəri gəldi,
Ölümün həyata zəfəri gəldi.

Çatmadı əvvəlcə bu xəbər ona,
İnana bilmədi qulaqlarına.
Elə ki, inandı... o, lal kəsildi.
Heykələ döndü.
Anladı, bildi:
Qapısı bağlandı, ocağı söndü.

## İKİ GÜN SONRA...

Qalınca evində dərdlə təkbətək,
Özünə qəsd etdi bu təzə gəlin.
Hansı tərəzilə, daş ilə ölçək
Eşqini, qəsdini biz bu gözəlin?
Nə deyim, Fərizə, nə deyim sənə,
Axı, nə ad verim bu faciənə?

Hələ səadətdən soraq gəlməmiş,
Yoxsul komanı da sevdin, bəyəndin.
Gəlinlik paltarın heç köhnəlməmiş,
Sən nə tez əyninə kəfən geyindin?

Sənin ləyaqətin lal etmiş bizi,
Zaman aşağıdır dəyanətindən.
Ey vəfa timsalı, sədaqət rəmzi,
Sənin bu qəsdinə nə ad verim mən?
Səsin ərimədi əsrin səsində,
Nəcabət kökündə həmişə varsan!
Türk qızı, xəyanət zəmanəsində
Bu eşqi, vəfanı sən bacararsan.

Belə yaşamışdır dünən və bu gün
Bizim keçmişimiz – oğuzlar, hunlar.
Ərin namusunu qorumaq üçün
Keçər balasından Burla xatunlar.

Belə ömür sürmüş nənələr, belə
Sən də bu çeşmədən su içdin, qızım,
Ərinin yolunda
sədaqət ilə
Cavanca canından sən keçdin, qızım.

Qurban getdi o, Vətənə, sən ona,
Bu necə görüşdü, necə yarışdı?
Anlaya bilmirəm, bu dar komana,
O boyda ürəyin necə sığışdı?

Sizin evinizin həndəvərində,
Bir "Leyla" ünvanlı mağar quruldu.
Həmən "Leyla" adlı Şadlıq evində,
Birinci toy – sizin toyunuz oldu.

"Leyla"da Leylinin qəm macərası,
Sən onu öncədən duymadın yəqin.
Sən hardan biləydin, Leyli vəfası,
Ünvanın olacaq bir zaman sənin.

Sevgi kitabında iri bir nida
Sənin məhəbbətin, sənin qiymətin!
Məcnunun Leylisi haqq dünyasında,
Sənin pişvazına çıxacaq yəqin!

Nə tez qışa döndü sənin baharın,
Bakı bu matəmə qara bağlamış.
Sənin damarında nənən Nigarın,
Həcərin, Leylinin qanı çağlamış.

* * *

Od tutub alışdı sözlər dilimdə
Bu qəsd, nə qəsd idi, ey məğrur qadın?
Sən təkcə özünə qıymadın, həm də
Bətnində göyərən körpənə qıydın.

O anda sarmaşıb məhəbbətinlə
Allahdan sən nəyi dilədin, qızım?
Sən, axı, ərinə sədaqətinlə
Körpənə xəyanət elədin, qızım.

Sınayar bəndəni Allah, çətində
Batdın bir günahda iki günaha.
Xəyanət işlədin sədaqətində
Körpəyə qıymaqla qıydın sabaha.
Bəlkə... açılmamış solan o gözlər
Ulu zirvələrə yol açacaqdı.
Bəlkə o gözlərdən doğacaq səhər,
Zülmət dünyamıza yol açacaqdı.

Ey mənim yurdumun vəfadar qızı,
Vəfan cəfa oldu... gör sən neylədin?
Sən öz bətnindəki o günahsızı
Hələ doğulmamış şəhid eylədin.
Oğul istəyirəm bu dərdə dözə.
Təzə şəhidliklə zaman üz-üzə
Əridə bilmədi bu faciəni...
Həm də çox çətindir danlamaq səni.
Sən həm fədakarsan, həm də günahkar
Bu cür şəhidliyin başqa rəngi var.
Zaman hər hökmündə "hakiməm" – deyib
Belə şəhidliyi amma görməyib.

Bilmirəm, nə deyək bunun adına?
Bütün hüdudları aşan şəhidlik
İkiqat, ya üçqat?
                Ərdən qadına,
Anadan balaya düşən şəhidlik.

## LARİSA

On üç yaşlı körpə bala
Yazıq anan necə dözsün
Bu kədərə, bu məlala?
Məzarının baş ucunda kukla da var.
Bu gün layla çalmalıykən sən kuklana
Kuklan sənə layla çalar.
Sən özün də kukla idin.
Bu dünyanın əvvəlini, axırını
Heç bilmədin.
Kim kuklaya güllə atar?
Atan oldu.
İnsanlığı, mərhəməti,
Ədaləti, həqiqəti
Bir qərəzə satan oldu.

Anan asmış dərs çantanı,
Məzarının başdaşına.
Axı, niyə hay vermirsən,
Səni dərsə haraylayan yoldaşına?
Sənin adın dostlarının dil əzbəri.
Qızım, axı, səni gözlər çoxdan bəri
Açmadığın kitabların dəftərlərin,
Səni gözlər partadakı o boş yerin.

Nə bərk oldu yuxun sənin?
Ataların ah-naləsi,
Anaların şivən səsi
Sığmır göyə, sığmır yerə.
Söylə, niyə oyanmadın
Bu haraya, bu həşirə?
Övladıydın iki xalqın,
Bu dostluğa mən də uydum, sən də uydun.
Sən dostluğun simvoluydun.
Bunudamı bu gün bizə çox gördülər?
Elə bil ki, səninlə bir
Bu dostluğu öldürdülər.

## SÜRƏYYA LƏTİF QIZI

Tanklar keçir küçədən, tanklar, zirehli tanklar.
Tankların üstündəki soldatların gözündə
Bizə nifrət odu var.
Onlar vicdanı atıb, insafı da danıblar.
Təkcə silahla deyil, onlar bizə qəzəblə,
Kinlə silahlanıblar.
Bu şəhərdə hər şeyə onlar sahibdir bu gün
İstədiyi eyvana, pəncərəyə, qapıya
atır, ölən qoy ölsün!
Mətbəxdə çay süzürdü, Təranənin nənəsi,
Birdən bir güllə səsi!
Yetmiş yeddi yaşında Sürəyya nənəmizi
Pəncərədən atdılar.
Bir günahsız qarını
Qanına boyatdılar.

## BABA MÜƏLLİM

Pəncərənin önündə kimsə inildəyirdi,
– Kömək edin, ölürəm, kömək edin, – deyirdi.
Açdı Baba müəllim pəncərəni bir anda,
Gördü biri yıxılıb qapının kandarında.
Dərhal atdı özünü telefonun üstünə,
O, təcili yardıma zəng çalıb
dönə-dönə
Ünvanı başa saldı,
Evdən sarıq götürdü.
Yaralının yanına yetişincə nə gördü?
Qan aparıb yazığı... yara dərin yaradı,
O, yaranı sarıdı.
Gördü ki, qonşular da yığılıb ətrafına.
O, gah ona, gah buna,
Baxıb dedi: – Neyləyək?
Axı, bu əldən gedir,

Biz təcili yardımı yenədəmi gözləyək?
Tez yığışdı cavanlar... köməkləşib birtəhər,
Yaxın xəstəxanaya xəstəni yetirdilər.

Dönür Baba müəllim yorğun-arğın evinə,
Şütüsə də güllələr onun dörd dövrəsindən.
Fikir vermir o, yenə.
Diksinmir taraq-taraq güllələrin səsindən.
Birdən ona nə oldu evin həndəvərində?
O, dayandı, döyükdü,
Səndələdi yerində.
Yıxıldı... döşündə qan.
Elə bu vaxt, bu zaman
Bir aypara maşını tin başında göründü.
Maşının işığında ətraf nura büründü.
Bu təcili yardımın axtardığı kim idi?
Bu maşın, ah bu maşın,
Bayaq onun özünün zəng vurub çağırdığı
Təcili yardım idi.
Başqasına çağırdı, qismət oldu özünə,
Belə bir təsadüfün qərəzi nə, özü nə?
Təcili yardım üçün zəng çalanda o bayaq,
Nə biləydi,
ay Allah,
Bu təcili yardıma özü qismət olacaq!
Həkimlərin yardımı amma faydasız oldu.
Səhər yası tutuldu.

## ALEKSANDR MARXEVKA

Yaralılar bələnib üzü üstə torpağa,
Necə dözsün analar bu sitəmə, bu dağa?
Leş-leş üstə qalanıb,
Təkərlərin altında gör necə xırpalanıb.
Həkim Aleksandrın gendən səsi yüksəlir:

-Yol verin, hey yol verin,
təcili yardım gəlir.
Soldat bunu görüncə avtomatı tuşladı
Ayparalı maşına.
O, istəmir, istəmir
Can verən yaralılar xilas üçün daşına.
Həkim öz işindədir.
Yaralının nəbzini yoxlayırkən...
döşündən
Həkimi də vurdular.
Yardıma gəldiyini ona unutdurdular.
Allah, sən bizi saxla Əhrimənin şərindən.
Allah, dünya çıxıbdır bəlkə öz məhvərindən?
Ay Allah, insan oğlu iblisəmi qul oldu?
Yoxsa, insan binədən elə iblis doğuldu?
Adamlar niyə satdı namusunu, arını?
Allah, hansı ölkədə güllələbaran ediblər
Yardım maşınlarını?
Axı, vuruşların da,
Qanlı savaşların da
Müqəddəs qanunu var:
Düşmənsə də, dostsa da, yaralıya hər zaman,
şəfqət əli uzanar.
Ey insan haqlarını kürsüdən alqışlayan,
Başqa məmləkətləri ədalət yoxluğundan
Gecə-gündüz daşlayan,
Budurmu haqq dediyin?
Bəs verdiyin vəd hanı?
Vallah, ələ salmısan sən bu boyda dünyanı.
"Təcili yardım"ların üstünə dörd tərəfdən
Od ələmək haqmıdır?
Yara sarıyanları güllələmək haqmıdır?

## HİDAYƏT

Gücsüzlükdən özünü hamı günahkar bilir,
Bu təhqirə dözməyi xalq özünə ar bilir:
Uzaq Qardabanidə
Bakı müsibətini eşidincə Hidayət,
Hönkür-hönkür ağladı.
Eşikdəki ağaca qara bayraq bağladı.
Gürcüstanda yaşayan bizim ellər, obalar,
Neçə gün yas saxladı.
"Yardım" – deyə dalbadal uzaq, yaxın kəndlərə
Zəng elədi Hidayət.
Qardabani, Borçalı
Bütün eli, mahalı
                silkələdi Hidayət.
O, özünü yetirdi şəhidlərin qırxına.
Xiyabanda əl açıb "lənət" – dedi min kərə
Kor fələyin çarxına.
Şəhidlərin adını o, oxudu birbəbir.
Elə bildi hər qəbir,
Onu ittiham edir:
"Həramilər Bakıya bulud kimi dolanda,
Biz köməksiz qalanda
Sən hardaydın, de harda, ey Vətənin övladı?
Öz doğma göyümüzdə qanad açan quşuyduq,
Ovçu bizi ovladı"
Ürəyindən ucalan,
Öz-özündən öc alan
Töhmət dolu bu səsdən o diksindi,
                başına
                                elə bil od ələndi,
                                                içindən pörşələndi.
Şəkillərdən düz onun gözlərinə zillənən,
Ürəyində millənən
Baxışlara dözmədi,
"Onlar haqlıdır" – dedi.
Əgər mən də bu yurdun, bu xalqın oğluyamsa,

Onlar kimi əhdimə, andıma doğruyamsa,
Mən niyə əvvəlcədən
Xəbər tuta bilmədim o dəhşətli gecədən?
Ağac olub, o anda onların cərgəsində
Niyə göyərmədim mən?
O qızıl güllələrə köksümü gərmədim mən?
Xəcaləti alışdı ürəyinin səsində.
Gücsüzlük əzabının boğuldu pəncəsində.

Qulağında ittiham, qəlbində danlaq səsi,
Birbaş Qardabaniyə o, qayıtdı ertəsi.
Hidayətin önünə çıxdı oğlu – Vüqarı,
Amma Vüqar bilmədi,
Bilmədi, atasının sındırılıb vüqarı.
Vüqarın fərəhiylə Hidayətin kədəri
Durdu qarşı-qarşıya...
Oğul gəldi qabağa, ata çəkildi geri,
Ata baxa bilmədi övladının üzünə.
O utandı, bilmədi anlaşılmaz bu halın
Məramı nə, sözü nə?
O yenə də eşitdi qəlbinin fəryadını:
"Kişi bilib özümü mən də Vüqar qoymuşam
Övladımın adını".
Hanı bizdə kişilik, hanı bizdə o vüqar,
Bizim mənliyimizi gör necə tapdadılar.
Tapdandı qeyrətimiz,
Milli heysiyyətimiz.
Ah! Bu boyda təhqirə indi necə dözək biz?
Yatammadı Hidayət sübhə qədər gecəni,
Ağlı qoydu çəkiyə zamanın hökmü ilə
ürəyindən keçəni.
Zaman ilə ürəyi heç uzlaşa bilmədi.
Tərəzinin gözləri tarazlaşa bilmədi.
Zaman ilə diləyin,
Ağıl ilə ürəyin
Qədim ədavətinə ürək tab gətirmədi.
Ona aman vermədi

Seyr edə dan yerini.
Hələ sübh açılmamış bu nankor dünyamıza
Qapadı gözlərini.
Qoymadı Hidayəti
Yaşamağa qeyrəti.
Onu şəhid eylədi
Millətinin önündə gücsüzlük xəcaləti.
Ölümlərin içində
Ən şərəfli, ən uca mərtəbədir şəhidlik.
Başqa-başqa şəkildə davam edir şəhidlik.

## AĞABƏY

*Bağışlayın, əzizlərim, Azərbaycanın azadlığı uğrunda mübarizə aparmağa gücüm və iradəm çatmadı. Yaşasın azad Azərbaycan!*

Ağabəy

Şənbə gecəsinin qətliamına,
Ağabəy dözmədi, hey qan ağladı.
Şəhid cavanların batan qanına,
Qəlbində yas tutub matəm saxladı.

O yandı, göstərmək istədi hər gün,
Yaralı Vətənə sədaqətini.
Amma bacarmadı,
gücsüzlüyünün
Çəkdi ağrısını, xəcalətini.

Düşündü, sonu var, axı, şərin də
Boğdu ürəyinin üsyan səsini.
O, beş ay gözlədi
zülm üzərində
Haqqın, ədalətin qələbəsini.

Onun gözlədiyi o gün gəlmədi,
Qəlbini çarmıxa çəkdi xəcalət.
Bircə an usanıb o, dincəlmədi,
Özünə qəsd etdi bir gün, nəhayət.

Çatdı onun gücü ancaq özünə,
O bildi dərdinə son əlac bunu.
Verdi ölümüylə sanki Vətənə,
Vətən qarşısında o, öz borcunu.
Ağabəy bu yurda bir qurban kimi,
Qəlbində neçə yol "mücahid" oldu.
Nəhayət, bu qətlə bir üsyan kimi,
Şəhidlər naminə o, şəhid oldu.

Görünür, şəhidlik bitməyib hələ,
Gözümüz önündə o, davam edir.
Ağabəy beləcə öz ölümüylə
Ölü diriləri ittiham edir.

...Dözməyib Vətənin ağır gününə,
Sən Vətən naminə özünə qıydın.
Oğul, arxaya yox, sən baxıb önə
Elə Vətən üçün yaşamalıydın!

Vətən qeyrətini sənin tək çəkən,
Oğullar gərəkdir indi Vətənə.
Sənsə həyatına qəsd edib nədən,
Ömrü müftə verdin!..
Nə deyim sənə?

Çoxları gözünü zülmə yumurkən,
Sənin ürəyində dindi qeyrətin.
Xalqın qatilinə cəza umurkən,
Sənin qatilinə döndü qeyrətin.
Bu fitrət, bu tiynət, de, sənə hardan?
Qəlbində qaynayan hansı diləkdir?

Xəcil yaşamağa səni qoymayan,
Qeyrətin önündə səcdə gərəkdir!
Sənin qeyrətinin bircə zərrəsi,
Min bir qeyrətsizə bəs eləyərdi.
Sənin ürəyinin bir üsyan səsi,
Ərzi təməlindən silkələyərdi.
Qeyrətin əlilə bu Vətən üçün
Özünü qurbanmı kəsdin sən özün?
Ay oğul, budurmu dərdin əlacı?
Hər dərdin başqa cür min əlacı var.
Vətənin qurbana nə ehtiyacı?
Vətənin əsgərə ehtiyacı var.
...Görünür, şəhidlik bitməyib hələ,
Gözümüz önündə o, davam edir.
Ağabəy, beləcə, öz ölümüylə,
Ölü diriləri ittiham edir.

## GEORGİ RANTİKOVİÇ1[1]

...Erməni Georgi – "Həqiqət" – dedi.
Ayırdı həmişə yaxşıdan pisi.
Zorun tüğyanına dözə bilmədi,
O gerçək carçısı, haqq fədaisi!

– Həqiqət önündə təslimən, – dedi.
Qoydu öz yerinə xeyiri, şəri.
Xalqının xətrinə haqdan keçmədi,
Aşdı, vurub keçdi milli hədləri.

Araya ədavət düşdüyü gündən
Güldü Yerevanın boş niyyətinə.
Sıyrılıb öz milli təəssübündən
Ucaldı insanlıq səltənətinə...

[1]Təqaüddə olan köhnə təyarrəçi, milliyyətcə erməni… O, erməni millətçilərinin haqsız tələblərinə dözməyib özünü öldürmüşdür.

O, solun haqqını vermədi sağa,
Düzlüyə çağırdı bütün dünyanı.
Georgi dözmədi bu haqsızlığa,
Özünə qəsd oldu onun üsyanı.

Bir yerdə otlayar quzu qurd ilə
İnsan həqiqəti haqq bilən zaman –
Ən böyük məqsədlər, istəklər belə
Ədalət önündə əyilən zaman.

Sıyrılıb nifrətdən, qərəzdən, kindən
Alqış həqiqəti haqq bilənlərə –
Ədalət naminə milliliyindən
İnsanlıq qatına yüksələnlərə!

* * *

Yenə sayımmı Yox-yox!
                    Çəkmək olmaz bu dərdi?
Bunların faciəsi bir-birindən betərdi.
Bu saydığım kəslərin nə günahı var idi?
Bunlar şəhidlər deyil,
Günahını bilməyən bədbəxt qurbanlar idi.
Bəs şəhidlər kim idi?
Silahlıyla silahsız! Kim kimə təslim idi?
Bu silahsız bəndələr bircə güllə atdımı
Bir günaha batdımı?
Qırıb tökdü kim kimi?
Silahlıyla silahsız döyüşə bilərdimi?
Tankların qabağına onlar belə çıxdılar.
Polad sinələrini lülələrin ağzına,
Sərhəd kimi sıxdılar.
Onlar güman etmədi zalim belə çıldıra,
Silahsızın üstünə silahlı əl qaldıra.
Bizim bu şəhidlərin sadəlövh gümanlığı
Oldu qəhrəmanlığı!

* * *

Qantökən öz tökdüyü qana cavab vermədi,
Cavab vermək bir yana, "Yox, mən haqlıyam", – dedi.
Adamların başına od ələmək haqq imiş?
Səksən yaşlı qarını, on üç yaşlı uşağı
güllələmək haqq imiş?
Olmayan bir günahı qan ilə yumaq üçün,
Bizim hüququmuzu bizdən qorumaq üçün
Qanımızın günahsız tökülməsi haqq imiş?
Zorlunun əllərilə haqlının qollarının
Bükülməsi haqq imiş?
Məntiqə bax, ay Allah!
Qanımızı tökənə bundan sonra yenə də
Biz inanaq, ay Allah?
Budurmu yaratdığı təzə hüquqi dövlət?
Budurmu vəd etdiyi müstəqillik, səadət?
Bəs bu qanunsuzluğun harası qanun oldu?
Qatıq dönüb süd oldu, əvvəl dönüb son oldu?
Bu, hüquqi dövlətin bizə bəxş elədiyi,
hüququymuş, bilmədik.
Hüquqi dövlətdəki hüquq buymuş, bilmədik.
Əcnəbi ölkələrdə birini öldürürlər,
ya ölkədən sürürlər –
küy-kələk qaldırırsan.
Öz ölkəndə sən özün günahsız insanları
məhkəməsiz qırırsan.
Hamısına bir adla "ekstremist" – deyə,
hələ damğa vurursan.
Bu boyda məmləkətdə
Bütün xalqlar, heç demə, "ekstremist" imiş.
Hamı xoşbəxtliyindən, nəşəsindən məst imiş.

## Şəhidlər

Qatil gülləsinə qurban gedirkən,
Gözünü sabaha dikdi şəhidlər.
Üçrəngli bayrağı öz qanlarıyla
Vətən torpağına çəkdi şəhidlər.

Zalim öyünməsin zülümləriylə,
Min bir böhtanıyla, min bir şəriylə.
Həqiqət uğrunda ölümləriylə
Ölümü kamına çəkdi şəhidlər.

O şənbə gecəsi, o qətl günü, –
Mümkünə döndərdik çox namümkünü.
Xalqın qəlbindəki qorxu mülkünü,
O gecə dağıdıb sökdü şəhidlər.

Tarixi yaşadıb diləyimizdə,
Bir yumruğa döndük o gecə biz də.
Yıxıb köləliyi ürəyimizdə
Cəsarət mülkünü tikdi şəhidlər.

Onlar susdurulan haqqı dindirər,
Qaraca torpağı qiymətləndirər.
Donan vicdanları qeyrətləndirər,
Axı, el qeyrəti çəkdi şəhidlər.

Dözdü hər zillətə, dözdü hər şeyə,
"Dünyada mənim də haqqım var", – deyə.
Kütləni xalq edən müqaviləyə
Qanıyla qolunu çəkdi şəhidlər.
İnsan insan olur öz hünəriylə,
Millət millət olur xeyri, şəriylə.
Torpağın bağrına cəsədləriylə,
Azadlıq tumunu əkdi şəhidlər.

## S O N

İyirmi yanvarda doğum evləri
Ölümdən, qırğından xəbərsiz idi.
O gün Bakımızda gecədən bəri,
Ölüm ilə həyat üzbəüz idi.

Güllə səslərini çağa səsləri,
Batırdı o gecə, şükür allaha!
Doldu şəhidlərin boşalan yeri,
Naşükür olmayaq, vallah, bir daha!

Gedən oğulların, axan qanların,
Əvəzi su səpdi yanan qəlbimə.
O şənbə gecəsi doğulanların,
Onundan doqquzu oğlanmış, demə.
Zalimin zəfəri başdan qələtdir,
Zamanın səsini biz də dinlərik.
Dünya gücümüzə yaxşı bələddir,
Biçilə-biçilə əkilənlərik!

*Mart, iyun 1990, Bakı-Şəki*

## MÜNDƏRİCAT

